# AZƏRBAYCAN MƏKTƏBİ

Elmi-nəzəri, pedaqoji jurnal
1924-cü ildən nəşr olunur.

Azərbaycan Respublikası
Təhsil Nazirliyinin
5 may 1996-cı il tarixli
Nizamnaməsi ilə təsdiq edilmiş,
Ədliyyə Nazirliyində dövlət
qeydiyyatına alınmışdır.
Qeydiyyat № 11/3165


«Azərbaycan məktəbi» Azərbaycan Respublikası Təhsil Nazirliyinin təsis etdiyi akademik jurnaldır. Jurnal aşağıdakı tədqiqat sahələri üzrə orijinal məqalələr dərc edir: təhsil idarəçiliyi; təhsil fəlsəfəsi və təhsil nəzəriyyəsi; təhsil siyasəti; kurikulum; təhsil texnologiyaları; pedaqogika; təhsilin sosiologiyası; təhsil tarixi; xüsusi təhsil; müəllim hazırlığı; qiymətləndirmə və s. Jurnalda, həmçinin təhsillə bağlı yerli və xarici nəşriyyatlarda çap olunan kitablar haqqında icmallara yer verilir.
«Azərbaycan məktəbi» ildə dörd dəfə (rüblük) nəşr olunur.
Jurnal Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının tövsiyə etdiyi dövri elmi nəşrlər sırasındadır.


Redaksiyanın ünvanı: Bakı şəhəri, Afiyəddin Cəlilov küçəsi, 86
Azərbaycan Respublikasının Təhsil İnstitutunun binası.
Tel.: + 994 12 490 4056; 490 4057; 490 4058



ISSN 0134-3289 (Print)
ISSN 2617-8060 (Online)



http://www.as-journal.edu.az
E-mail: editor@as-journal.edu.az



# Azerbaijan Journal of Educational Studies

Established in 1924,
is an academic journal
published quarterly by the
Ministry of Education of
Azerbaijan Republic.


Azerbaijan Journal of Educational Studies is an academic journal founded by the Ministry of Education of the Republic of Azerbaijan. The journal publishes original articles in the following areas of research: education management; educational philosophy and educational theory; education policy; curriculum; educational technologies; pedagogy; sociology of education; history of education; special education; teacher training; assessment, etc. The journal also includes reviews of books on education published in local and foreign publications.
Azerbaijan Journal of Educational Studies is published four times per year. The journal is among the publications recommended by the Supreme Attestation Commission under the President of the Republic of Azerbaijan.


Contacts: 86 Afiyaddin Jalilov st., Baku, Azerbaijan
Tel: + 994 12 490 4056; 490 4057; 490 4058

# İÇİNDƏKİLƏR

11—18 **Əddin Muştaqov**
Rəqabətli insan kapitalı indeksində keyfiyyət təminatı amili

19—31 **Mətanət Qurbanova**
Ali təhsil müəssisələrinin beynəlxalq rəqabət qabiliyyəti: reytinq metodologiyası

32—42 **Afaq Kərimli**
Azərbaycanda təhsilin keyfiyyətinin idarə olunması problemləri və onların həlli istiqamətləri

43—50 **Aydın Əliyev, Dünya Əhmədova, Nəzrin Babayeva**
Covid-19 pandemiyası dövründə Azərbaycanın təhsil müəssisələrində qarışıq öyrənmə üsulunun tətbiqi

51—58 **Aytac Yusifova**
Onlayn təhsildə keyfiyyətin təmin edilməsi

59—65 **Günel Qasımova**
Formativ qiymətləndirmədə düzgün əks-əlaqə və şagird nailiyyətlərinin qiymətləndirilməsində onun rolu

66—72 **Xədicə Əliyeva, Zabul Əhmədov**
İnformasiya-kommunikasiya texnologiyalarından istifadə vasitəsilə təlim prosesinin idarə olunması

73—80 **Sərcan Sadiqova**
Təhsildə əsas keyfiyyət faktorları

81—88 **Natəvan Babayeva**
Xarici dil təlimi zamanı tələbələrin şifahi nitq bacarıqlarını kulturoloji aspektdə formalaşdıran amillər

89-95 **Əkbər N.Nəcəf**
XVI-XIX əsrlərdə Qarabağın ənənəvi təhsil ocaqları

96—101 **Teyyub Quliyev**
Nizami Gəncəvi və Azərbaycan dili

102—108 **Akif Xalıqov**
Nizami Gəncəvi irsindən tədris prosesində istifadə imkanları

109—113 **Vidadi Başirov**
Şəxsiyyətyönlülük ideyalarının tarixi əhəmiyyəti və gənc nəslə aşılanması yolları

114—120 **Gülnarə Əlixanova**
Bədən tərbiyəsi və idmanın tədrisində hərəki adət və vərdişlərin rolu

121—126 **Bahar Bəylərova-Ələkbərova**
Təhsil və tərbiyədə musiqi amili

# CONTENTS

11—18 **Addin Mushtagov**
Quality assurance factor in competitive human capital index

19—31 **Matanat Gurbanova**
International competitiveness of higher education institutions: rating methodology

32—42 **Afag Karimli**
Education quality management in Azerbaijan: problems and their solutions

43—50 **Aydin Aliyev, Dunya Ahmadova, Nazrin Babayeva**
Implementation of Blended Learning as a Recovery Method in Educational Centers in Azerbaijan during the COVID-19 Outbreak

51—58 **Aytaj Yusifova**
Quality assurance in online education

59—65 **Gunel Gasimova**
Correct feedback in formative assessment and its role in evoluation of students achievement

66—72 **Khadija Aliyeva, Zabul Ahmadov**
Training management process through the use of information and communication technologies

73—80 **Sarjan Sadigova**
The quality factors in education

81—88 **Natavan Babayeva**
Factors forming students' oral speech skills in the cultural aspect during foreign language teaching

89-95 **Akbar N. Najaf**
Traditional educational institutions of Garabagh in the XVI-XIX centuries

96—101 **Teyyub Guliyev**
Nizami Ganjavi and the Azerbaijani language

102—108 **Akif Khaligov**
Possibilities of using the heritage of Nizami Ganjavi in the educational process

109—113 **Vidadi Bashirov**
Historical significance of the ideas of personality-orientation and ways of inculcating them in the younger generation

114—120 **Gulnara Alikhanova**
The role of motor habits in the teaching of physical education and sports

121—126 **Bahar Baylarova-Alakbarova**
Music factor in education and upbringing




## BAŞ REDAKTORDAN

*Əziz oxucu!*

*"Azərbaycan məktəbi" jurnalının 2021-ci il üçün ikinci sayı ilə qarşınızdayıq. Jurnalı çap versiyasından da, internet səhifəmizdən də oxuya bilərsiniz. Bunu mümkün edən elmin nailiyyətləridir. Elmin də təbiətin sirlərini öyrənməyi dayandırmamasını mümkün edən təhsilin fasiləsiz olaraq davam etməsidir.*

*Təhsilin fasiləsiz davam etməsini mümkün edən isə yenə də elmin əldə etdiyi uğurlardır. Yəni təhsil və elm bir-birini inkişaf etdirən, bəsləyən iki sonsuz mənbədir. Pandemiyanın gətirdiyi sərhədləri də elmin töhfələrindən, informasiya-kommunikasiya texnologiyalarından, distant öyrənmə metodlarından istifadə vasitəsilə aşıb təhsili davam etdirə bilirik. Davam etdiririk ki, heç zaman çətinliklərin qarşısında çarəsiz qalmayaq.*

*Biz də həmin nailiyyətləri sizə çatdırmağa davam edirik. Onların faydalı olacağına, yeni üfüqlərə yol açacağına inamımız böyükdür.*

*"Azərbaycan məktəbi" ilə təhsili davam etdirənlərdən olun!*

# RƏQABƏTLİ İNSAN KAPİTALI İNDEKSİNDƏ KEYFİYYƏT TƏMİNATI AMİLİ

**ƏDDİN MUŞTAQOV**
Azərbaycan Dövlət İqtisad Universiteti – UNEC, Tələbə İşləri Mərkəzi, "Bir pəncərə" şöbəsinin baş mütəxəssisi, doktorant.
e-mail: addin.mushtagov@unec.edu.az
https://orcid.org/0000-0003-0317-4957

**Məqaləyə istinad:**
Muştaqov Ə. (2021). Rəqabətli insan kapitalı indeksində keyfiyyət təminatı amili. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 11–18

**Məqalə tarixçəsi**
Göndərilib: 05.05.2021
Qəbul edilib: 01.06.2021

## ANNOTASİYA

Məqalədə rəqabət qabiliyyətli, dayanıqlı insan kapitalının inkişafı istiqamətində ali təhsil müəssisələrində keyfiyyət təminatı sisteminin mənimsənilməsinin, insan kapitalının əmək bazarında özünü reallaşdırmasında mövcud problemlərin aradan qaldırılmasının vacibliyi vurğulanır. Qeyd olunur ki, insan kapitalının inkişafı dayanıqlı iqtisadi artımın əsas şərtlərindəndir. Ona görə də XXI əsrin tələblərinə uyğun rəqabət qabiliyyətli insan kapitalı üçün keyfiyyət təminatı sistemi qurulmalı və ali məktəblərin ixtisaslar üzrə təhsil proqramları əmək bazarının tələblərinə uyğunlaşdırılmalıdır. Keyfiyyət təminatı sisteminin qurulması ali təhsil müəssisələrinin beynəlxalq imicinin formalaşmasında və rəqabət avantajı əldə etməsində əhəmiyyətli rol oynayır. Bu istiqamətdə keyfiyyət təminatı agentlikləri təhsil müəssisələrinin fəaliyyətinin və təhsil proqramlarının icrasının hər təhsil pilləsi üzrə dövlət təhsil standartlarının tələblərinə uyğunluğunu qiymətləndirir. Məqalədə təhsil müəssisələri ilə məzunlar arasında əks-əlaqə, rəqabət qabiliyyətli insan kapitalının formalaşdırılması, XXI əsrin tələblərinə uyğun mütəxəssislərin yetişdirilməsində keyfiyyət təminatı sisteminin qurulması və ixtisaslar üzrə təhsil proqramlarının təkmilləşdirilməsi ilə bağlı təkliflər də verilir.

**Açar sözlər:** Ali təhsil müəssisəsi, insan kapitalı, təhsildə keyfiyyət təminatı sistemi, beynəlxalq qiymətləndirmə, əmək bazarı.

# QUALITY ASSURANCE FACTOR IN COMPETITIVE HUMAN CAPITAL INDEX

**ADDIN MUSHTAGOV**
Azerbaijan State University of Economics – UNEC, Centre of Student Affairs, Chief Specialist of "Single Window" Department, PhD Student.
e-mail: addin.mushtagov@unec.edu.az
https://orcid.org/0000-0003-0317-4957

**To cite this article:**
Mushtagov A. (2021). Quality assurance factor in competitive human capital index. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 11–18

**ABSTRACT**

The article emphasizes the importance of mastering the quality assurance system in higher education institutions in the direction of developing competitive, sustainable human capital, eliminating the existing problems in the realization of human capital in the labor market. It is noted that the development of human capital is one of the basic conditions for sustainable economic growth. Therefore, a quality assurance system for competitive human capital must be established in conformity with the requirements of the XXI century, and educational programs in higher education must be adapted to the requirements of the labor market. The establishment of a quality assurance system plays an important role in shaping the international image of higher education institutions and gaining competitive advantage. In this context, quality assurance agencies evaluate the compliance of the activities of educational institutions and the implementation of educational programs with the requirements of state educational standards for each level of education. The article also offers suggestions on feedback between educational institutions and graduates, the formation of competitive human capital, the establishment of a quality assurance system in the training of specialists in accordance with the requirements of the XXI century, and the improvement of educational programs in specialties.

**Keywords:** Higher education institution, human capital, quality assurance system in education, international assessment, labor market.

**Article history**
Received: 05.05.2021
Accepted: 01.06.2021

## GİRİŞ

İqtisadi və sosial inkişafın təmin edilməsi üçün tələb olunan ixtisaslı işçi qüvvəsinin hazırlanmasında təhsil mühüm rol oynayır. Əmək bazarındakı texnoloji dəyişikliklər səbəbindən ali təhsil müəssisələri ilə əmək bazarının tələblərinin uyğunlaşdırılması və təhsildə keyfiyyət təminatı amilinin əhəmiyyəti artmışdır. Həm inkişaf etmiş, həm də inkişaf etməkdə olan ölkələrdə əmək bazarının ən ciddi problemlərindən biri tələbat olan ixtisaslarla təhsil müəssisələri tərəfindən təklif olunan kadrların peşəkarlıq keyfiyyəti arasındakı uyğunsuzluqdur. Tələb və təklif arasında tənasübün bu cür pozulması ali təhsilli kadrların işsiz qalmasına səbəb olur. Problemin həll olunması üçün ali təhsildə düzgün siyasət həyata keçirilməli, təlim prosesinin qarşısında duran məqsədlərdən ən mühümü olan təhsildə keyfiyyətə nail olunmalıdır. Bu isə beynəlxalq təcrübənin nəticələrinin öyrənilməsi, təhsilin qarşısında duran sosial sifarişin, habelə müəllimlərlə təhsilalanların imkan və tələbatlarının nəzərə alınması ilə mümkündür.

Ali təhsil müəssisələri bu gün dünyada qlobal rəqabətin iştirakçılarıdır. Bu rəqabət mühitində universitetlər davamlı olaraq özlərini inkişaf etdirməyə, keyfiyyətli fəaliyyət göstərməyə və rəqabətqabiliyyətli insan yetişdirməyə çalışır. İstər milli, istərsə də beynəlxalq səviyyədə özünü təsdiqləmək istəyən ali təhsil müəssisələri buna nail olmaq üçün müvafiq keyfiyyət standartlarına uyğun fəaliyyət göstərməlidir.

XXI əsrin tələblərinə uyğun insan kapitalının inkişafı üçün ümumi təhsilin də gücləndirilməsi, modernləşdirilməsi və keyfiyyətinin yüksəldilməsi vacibdir. Buna görə də dövrün tələbinə uyğun insan kapitalının yetişdirilməsi istiqamətində PISA (Beynəlxalq Tələbə Qiymətləndirmə Proqramı) proqramına qoşulmaq, habelə yeni texnologiyaların həyatımızda rolunun artmasını nəzərə alaraq, informasiya-kommunikasiya texnologiyalarının (İKT) dayanıqlı insan kapitalının formalaşdırılması prosesinə cəlb edilməsi (təhsilverən və təhsilalanların ICILS ilə (Beynəlxalq Kompüter və İnformasiya Savadlılığı) dəyərləndirilməsi) çox vacib hesab edilir. Bu istiqamətdə Azərbaycan Respublikası Prezidentinin sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər"də də ölkənin beynəlxalq qiymətləndirmələrdə (PISA, ICILS və s.) mövqeyinin əhəmiyyətli dərəcədə yaxşılaşmasına nail olmağın vacibliyi qeyd olunmuşdur (Azərbaycan Respublikası Prezidentinin Sərəncamı, 2021).

## 1. Rəqabət qabiliyyətli insan kapitalının formalaşmasında beynəlxalq qiymətləndirmələr: PISA və ICILS

### 1.1. PISA

PISA (Programme for International Student Assessment) – İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı (OECD) tərəfindən 15 yaşlı şagirdlərin əldə etdikləri bilik və bacarıqları qiymətləndirmək üçün üç ildən bir keçirilən təhsil araşdırmasıdır. Bu tədqiqat OECD Təhsil Müdirliyinə hesabat verən PISA İdarəetmə heyəti tərəfindən aparılır. OECD-in rəsmi saytına əsasən tədqiqatda istifadə olunan test və sorğuların inkişafı, təhlillərin aparılması və beynəlxalq hesabatın hazırlanması kimi proseslər PISA İdarəetmə heyətinin nəzarəti altında müəyyən edilmiş bir konsorsium tərəfindən, milli səviyyədə isə tədqiqatda iştirak edən ölkələrin özündə müəyyən olunmuş milli mərkəzlər tərəfindən həyata keçirilir.[1]

OECD Şəxsi Məlumat Generasiya Qaydalarına əsasən iştirakçılar fərdi məlumatlara daxil olmaq, onları düzəltmək, həmçinin onun işlənməsinə etiraz etmək, silməyi tələb etmək və müəyyən hallarda məlumatların daşınmasını əldə etmək hüquqlarına paralel olaraq aşağıdakılara da malikdirlər:

- PISA-da iştirakın könüllüdür;
- şagird və ya valideyn qiymətləndirmə zamanı istənilən vaxt sorğudan imtina edə bilərlər;

[1] https://www.oecd.org/pisa/

- şagird və ya valideyn təqdim etdikləri hər hansı bir məlumatın silinməsini və ya dəyişdirilməsini tələb edə və milli nəzarət orqanlarına şikayət edə bilər.

PISA-da icbari təhsilin sonunda formal təhsilə davam edən 15 yaş qrupundakı şagirdlərin riyazi, elmi savadlılıq və oxu vərdişlərindən başqa, onların motivasiyası, öyrənmə tərzi, məktəb mühiti, özləri və ailələri haqqında məlumatlar da toplanılır. Bu tədqiqatda istifadə edilən "savadlılıq" anlayışı, şagirdin bilik və potensialını inkişaf etdirərək cəmiyyət həyatına daha səmərəli şəkildə qoşulmağa və töhfə verməyə imkan yaratmaq üçün yazılı mənbələri tapmaq, istifadə etmək, qəbul etmək və qiymətləndirmək kimi müəyyən edilir.

PISA-nın əsas məqsədi şagirdlərin məktəbdə öyrəndikləri bilik və bacarıqlardan gündəlik həyatda istifadə etmə qabiliyyətlərini ölçmək, həm də gənclərimizi daha yaxından tanımaq, onların öyrənmək istəyini, dərslərdəki müvəffəqiyyət göstəricilərini və öyrənmə mühiti ilə bağlı seçimlərini müəyyənləşdirməkdir.

### 1.2. ICILS

Son bir neçə onillikdə informasiya və kompüter texnologiyaları gündəlik həyatımıza böyük təsir göstərmişdir. Kompüter və İnformasiya Savadlılığı (CIL) fərdin evdə, məktəbdə və iş yerində kompüterdən istifadə bacarıqlarının təzahürüdür. Beynəlxalq Kompüter və İnformasiya Texnologiyaları Savadlılığı Tədqiqatı (ICILS) isə həmin bacarıqlara istinad edərək şagirdlərin kompüter və informasiya savadlılığındakı beynəlxalq fərqləri ölçür. ICILS-də gənclərin rəqəmsal dövrdəki qabiliyyətini dəstəkləyən kompüter və məlumat savadlılığı bacarıqlarının inkişaf etdirilməsi hədəflənir.

ICILS təhsil sistemini CIL ilə əlaqəli təlim proqramlarının nəticələri barədə əhəmiyyətli məlumat resursları ilə təmin edir. Beynəlxalq Kompüter və İnformasiya Texnologiyaları Savadlılığı Tədqiqatının maraq dairəsi dinamik bilik mühitində təhsilalanların müvəffəqiyyət qazanmaları üçün tələb olunan əsas bilik və bacarıqdır. ICILS-ə qoşulmaqla ölkələr gənclərin XXI əsrin tələblərinə uyğun CIL bacarıqlarını necə inkişaf etdirə biləcəyi barədə etibarlı və müqayisəli məlumatlar əldə edir. Ümumtəhsil müəssisələrinin əksəriyyətində səkkizinci sinifdə oxuyanların orta yaş həddi 13,5 və ya daha yüksək olduğu təqdirdə, ICILS-in hədəf kütləsi həmin sinif şagirdləri olur. VIII sinifdə orta yaş həddi 13,5-dən aşağı olan təhsil sistemlərində isə ICILS-in hədəf populyasiyası kimi IX sinif müəyyən edilir.

Təhsilin Nailiyyətinin Qiymətləndirilməsi Beynəlxalq Birliyinin (IEA) rəsmi saytında qeyd olunduğu kimi, ICILS-in 2018-ci il dövrü üçün aşağıdakı nəticələrə gəlinmişdir:[2]

- Gənclərin rəqəmsal cihazlardan istifadəsinin artması onların çox istiqamətli rəqəmsal bacarıqlarını inkişaf etdirmir;
- Şagird və ya müəllimləri təkcə İKT avadanlığı ilə təmin etmək onların rəqəmsal bacarıqlarını artırmaq üçün kifayət deyil;
- Şagirdlərin sosial-iqtisadi vəziyyəti ilə əlaqədar rəqəmsal fikir ayrılığı mövcuddur;
- Ölkələr daxilində şagirdlərin CIL ballarındakı fərqlər ölkələr arasındakı fərqlərdən daha böyükdür.

Avropa Şurası, Təhsil və Təlim – 2020 strateji çərçivəsindəki təlim hədəflərini yenidən nəzərdən keçirərək "Avropa təhsil məkanı və ondan kənarda təhsil və təlimdə Avropa əməkdaşlığı üçün strateji çərçivə" (2021-2030) haqqında qərar qəbul etmişdir. Həmin qərarda beş strateji prioritet vurğulanmışdır:[3]

1. Təhsil və təlimdə hamı üçün keyfiyyət, bərabərlik, əhatəlilik və müvəffəqiyyətin artırılması;
2. Ömür boyu təhsil və mobilliyi hamı üçün reallığa çevirmək;
3. Təhsildə kompetensiyaların və motivasiyanın artırılması;
4. Avropa ali təhsilinin gücləndirilməsi;
5. Təhsil və təlim yolu ilə yaşıl və rəqəmsal keçidlərin dəstəklənməsi.

[2] https://www.iea.nl/studies/iea/icils/2018

[3] https://www.consilium.europa.eu/media/48584/st06289-re01-en21.pdf

**Şəkil 1** BMT-nin Davamlı İnkişaf Məqsədləri (*Mənbə:* https://azerbaijan.un.org/az/sdgs)




Yuxarıda qeyd olunanlardan məlum olduğu kimi, ICILS ölkələrin öz şagirdlərinin rəqəmsal səriştələri ilə əlaqədar milli hədəflərini izləmələrinə kömək edir, eyni zamanda BMT-nin Davamlı İnkişaf Məqsədlərinə doğru tərəqqini təmin etmək üçün baza rolunu oynayır.

### 1.3. Davamlı İnkişaf Məqsədi 4 – Keyfiyyətli təhsil

Davamlı inkişaf məqsədləri və hədəfləri həm müxtəlif milli reallıqlar, həm də prioritetlər nəzərə alınmaqla qlobal xarakter daşıyır və hər kəs üçün tətbiq olunur. Hər dövlət məqsədləri özünün milli hədəflərini rəhbər tutaraq müəyyən edir. Dövlətlər qlobal hədəflərin milli planlaşdırma prosesinə və strategiyasına necə daxil edilməsinə özləri qərar verir. BMT-nin Davamlı İnkişaf Məqsədləri şəkil 1-də göstərildiyi kimidir.

Birləşmiş Millətlər Təşkilatının qəbul etdiyi "Dünyamızın transformasiyası: 2030-cu ilədək dayanıqlı inkişaf sahəsində Gündəlik"də hamı üçün hərtərəfli və bərabər keyfiyyətli təhsilin təmin olunması və ömür boyu təhsil imkanlarının təşviq edilməsi məqsədilə 2030-cu ilədək aşağıdakı hədəflər müəyyən edilmişdir (United Nations General Assembly, 2015):

- bütün qız və oğlanların effektiv öyrənməsi ilə nəticələnən pulsuz, bərabər, keyfiyyətli ibtidai, ümumi orta və tam orta təhsilin təmin edilməsi;
- bütün qadın və kişilər üçün əlverişli, keyfiyyətli təhsilə bərabərhüquqlu girişin təmin olunması;
- məşğulluq, ləyaqətli iş və sahibkarlıq üçün texniki və peşə bacarıqları da daxil olmaqla müvafiq səriştələrə sahib olan gənclərin sayının əhəmiyyətli dərəcədə artırılması;
- təhsildə gender bərabərsizliyinin aradan qaldırılması və əlillər, həssas insanlar, yerli əhali üçün təhsilin bütün səviyyələrinə bərabər çıxışın təmin edilməsi;
- bütün şagirdlərin davamlı inkişafı və sağlam həyat tərzi, insan hüquqları, zorakılıq olmayan bir mədəniyyətin təbliği, multikulturalizmin davamlı inkişafa verdiyi töhfənin təşviqi üçün lazımi bilik və bacarıqlara yiyələnmənin təmin edilməsi.

BMT-nin İqtisadi və Sosial Şurasının təşkilatçılığı ilə keçirilən davamlı inkişafa dair yüksək səviyyəli siyasi forumda Baş katib "Davamlı İnkişaf Məqsədlərinə doğru irəliləmə"

barədə hesabatında keyfiyyətli təhsillə bağlı aşağıdakıları qeyd etmişdir (U.N. Economic and Social Council, 2020):

- 2019-cu ilin sonunda milyonlarla uşaq və gənc məktəbdən kənarda qalmışdı. COVID-19-un yayılmasını ləngitmək üçün məktəblərin bağlanması tədrisin nəticələrinə, uşaq və gənclərin sosial inkişafına mənfi təsir göstərir. Bu, dünyadakı tələbə kütləsinin 90%-dən çoxuna və 1,5 milyard uşaq və gəncə təsir etmişdir;
- İbtidai sinfi bitirmə nisbəti 2000-ci ildə 70%-ə, 2018-ci ildə isə 84%-ə çatmışdır. Mövcud tendensiyalara görə, 2030-cu ilədək qlobal miqyasda bu nisbətin 89%-ə çatması gözlənilir.

Bildiyimiz kimi, rəqabətqabiliyyətli insan kapitalının inkişafında təhsilin rolu əvəzedilməzdir. Yuxarıda bu prosesin təməli olan ümumtəhsil müəssisələrinin inkişafı və keyfiyyətli fəaliyyət göstərməsi üçün görüləsi işlərdən bəhs olundu. Müşahidələrdən aydın olur ki, əmək bazarının tələblərinə uyğun işçi qüvvəsinin hazırlanmasında əsas məsuliyyət ali təhsil müəssisələrinin üzərinə düşür. Tədqiqatımızın növbəti hissəsində ali təhsildə rəqabət qabiliyyətli insan kapitalının inkişafı üçün müasir tələblərə nəzər yetirilir.

## 2. Ali təhsil müəssisələrində rəqabətədavamlı insan kapitalının yetişdirilməsi

Müasir dünyamızda hər bir ölkənin iqtisadiyyatının və əmək bazarının tələblərinə uyğun rəqabət qabiliyyətli insan kapitalının inkişafı üçün təhsil xidmətlərinin əhəmiyyətli dərəcədə vacibliyi həmin xidmətlərin təmin olunmasını zəruri edir. Çünki universitetlərin təlim və tədris prosesi həmişə maraqlı tərəflər – tələbələr, valideynlər, məktəblər, işəgötürənlər və hökumətin diqqətində olmuşdur (Tight, 2020). Buna görə də səmərəli nəticələr əldə edilməsi məqsədilə ali təhsil müəssisələrində keyfiyyət təminatı sistemini formalaşdırmaq və bunun üçün təxirəsalınmaz tədbirlərin görülməsi labüddür.

### 2.1. Ali təhsildə keyfiyyət təminatı sistemi

Keyfiyyət təminatının ali təhsilin idarə olunmasında ayrıca sahə olaraq yaranması XIX əsrin sonlarına, ABŞ-da ilk akkreditasiya təşkilatlarının meydana çıxdığı vaxta təsadüf edir (Westerheijden, Stensaker and Rosa, 2007). Həmin vaxtdan etibarən təhsil proqramlarının tələbələrə əsaslanan yanaşmanı əks etdirməsi məqsədilə keyfiyyət təminatının təkmilləşdirilməsi ilə bağlı əhəmiyyətli işlər görülmüş, müvafiq standartlar və təlimatlar hazırlanmışdır. Bu standartlar və təlimatlar Avropa ali təhsil məkanında həm milli və instisional keyfiyyət təminatı sisteminin təkmilləşdirilməsi, həm də regional əməkdaşlıq məsələsində vacib rol oynayır.

XXI əsrin tələblərinə cavab verən effektivliyi formalaşdırmaq üçün ali təhsil müəssisələrində keyfiyyət təminatı sisteminin qurulması vacibdir. Bu istiqamətdə görüləcək işlərdən biri də keyfiyyət təminatı agentliklərinin ali təhsil müəssisələrinin fəaliyyətinin və təhsil proqramlarının icrasının hər təhsil səviyyəsi üzrə dövlət təhsil standartlarının tələblərinə uyğunluğunu qiymətləndirməsidir. Bu, baş verdiyi təqdirdə, keyfiyyət təminatı sistemi vasitəsi ilə ali təhsil müəssisələri aşağıdakı üstünlüklərə sahib ola bilər:

- yerli və beynəlxalq səviyyədə rəqabət üstünlüyünün qazanılması və nüfuzun qorunması;
- maraqlı tərəflərdə inam və etibar hissinin formalaşması;
- vaxta və maliyyə resurslarına qənaət;
- iş yükünün azaldılması və xidmət keyfiyyətinin yaxşılaşdırılması;
- keyfiyyətdə davamlı inkişaf, effektiv keyfiyyət təminatı və ümumi fəaliyyətdə səmərəlilik.

Effektiv keyfiyyət təminatı ali təhsil müəssisələrində XXI əsrin tələblərinə uyğun rəqabət qabiliyyətli, dayanıqlı insan kapitalının inkişafının əsasını təşkil edir. Ona görə də ali təhsildə daxili keyfiyyət təminatı sisteminin qurulması üçün hazırlanmış proqramlar daim təkmilləşdirilməlidir.

## 2.2. XXI əsrin tələblərinə uyğun tələbəyönlü təhsil

Tələbəyönlü təhsil konsepsiyası öyrənmə və tədrisin təşkilinə təsir göstərən müxtəlif aspektləri əhatə edir. Bu konsepsiya tələbənin tədris prosesində və özünüqiymətləndirmədə, habelə tədris proqramlarının hazırlanmasında tərəfdaş kimi fəal iştirakını nəzərdə tutur. Bundan başqa, təhsilalanların tənqidi düşüncə bacarıqlarının inkişafı, hüquq və vəzifələrini dərk edən vətəndaş, ən əsası mövcud və gələcək əmək bazarı üçün rəqabət qabiliyyətli insan kapitalı kimi yetişməsinin təmin olunması da tələbəyönlü təhsilin prioritetlərindən sayılır. Onun bu faydalarından əlavə olaraq aşağıda qeyd olunan ümumi prinsipləri də vardır:

- tələbəyönlü təhsili təmin etmək və genişləndirmək məqsədi ilə təhsilalanların təlim nailiyyətlərinin nəticələr formasında müəyyən edilməsi;
- öyrənmək və öyrətmək üçün sosial axtarışda olan tələbə və müəllim heyəti arasında qarşılıqlı hörmət və məsuliyyətə əsaslanan əməkdaşlığın olması;
- inklüziv auditoriyalar yaratmaqla tələbəyönlü təlim-tədris prosesinin gücləndirilməsi;
- ömürboyu təhsildə özünənəzarəti təmin edə bilmək və tələbə müstəqilliyini inkişaf etdirmək üçün nəticəsi olan təcrübələrin təhsilalanlar arasında təşviq edilməsi.

Qeyd olunanlardan belə nəticə hasil olur ki, ali təhsil müəssisələri tələbələrin təhsil prosesində fəal iştirakını təmin etmək məqsədilə tələbəyönlü təhsilə daha çox əhəmiyyət verməlidirlər. Çünki tədrisin bu cür təşkili təhsilalanların motivasiyasının artırılması, özünü təhlil etməsi və təhsil prosesinə daha aktiv cəlb olunmasında vacib rol oynayır. Avropa Ali Təhsil Məkanında Keyfiyyət Təminatı üzrə Standartlar və Təlimatların "tələbəyönlü təhsil, tədris və qiymətləndirmə" adlı 1.3 yarımbəndində də bununla bağlı məsələlər öz əksini tapır. Bu sənədə əsasən tələbəyönlü təhsil prosesi aşağıdakıları özündə ehtiva edir (European Association of Institutions in Higher Education, 2015):

- ali təhsil müəssisələrində çevik öyrənmə metodlarının istifadəsi təmin olunmaqla irqindən, dinindən, milliyətindən, siyasi düşüncəsindən asılı olmayaraq bütün tələbələrə hörmətlə yanaşılması və onların ehtiyaclarına xidmət edilməsi;
- müvafiq hallarda tədris prosesinin müxtəlif yollarla icra edilməsinin nəzərdən keçirilməsi və tətbiq edilməsi;
- müxtəlif pedaqoji metodlardan məharətlə istifadə edilməsi;
- təqdimat formaları və pedaqoji metodların müntəzəm olaraq qiymətləndirilməsi və uyğunlaşdırılması;
- müəllimdən müvafiq təlimat və dəstək almaq şərti ilə təhsilalanlarda müstəqillik hissinin stimullaşdırılması;
- tələbə-müəllim münasibətlərində qarşılıqlı hörmətin inkişaf etdirilməsi;
- tələbələrin şikayətlərinə baxılması üçün müvafiq prosedurların olması.

Beləliklə, qeyd etmək olar ki, tələbəyönlü təhsildə tələbələr öyrənmək üçün müstəqildir və tam məsuliyyət daşıyır. Bu öyrənmə formasında onlar ixtisası və gələcək peşə fəaliyyəti ilə heç bir əlaqəsi olmayan materialları öyrənmək əvəzinə, aktual məsələ və problemlərlə birbaşa əlaqəli məlumatları mənimsəmək imkanına malik olurlar. Bununla da XXI əsrin əmək bazarının tələblərinə uyğun rəqabət qabiliyyətli insan kapitalının inkişafında effektivlik və səmərəlilik artır.

## NƏTİCƏ

Apardığımız tədqiqata əsasən belə nəticəyə gəlmək olar ki, təhsil müəssisələrinin bir-biri ilə koordinasiyalı şəkildə fəaliyyət göstərməsi, abituriyent hazırlığı istiqamətində PISA və ICILS-dan istifadəsi məqsədəuyğun hesab edilir. Digər tərəfdən isə rəqabətədavamlı ixtisaslı kadrların hazırlanması üçün universitetlərdə görüləcək işlərdən ən başlıcası effektiv keyfiyyət təminatı sisteminin qurulması və ixtisaslar üzrə təhsil proqramlarının əmək bazarının tələblərinə cavab verəcək şəkildə hazırlanmasıdır. Buna görə də XXI əsrin tələblərinə uyğun rəqabət

qabiliyyətli insan kapitalının yetişdirilməsi üçün aşağıdakılar təklif olunur:

1. Ali təhsil müəssisələrində rəqabət qabiliyyətli, dayanıqlı insan kapitalının yetişdirilməsini təmin edən keyfiyyət təminatı sistemin qurulması;

2. İxtisaslar üzrə təhsil proqramlarının tərtibində təhsilalanların kompleks problem həlletmə, tənqidi düşünmə, kreativlik və çevik idarəetmə kimi bir sıra bacarıqlarla təmin olunmasının nəzərə alınması;

3. XXI əsrin tələbləri əsasında yeni texnologiyaların və media vasitələrinin təhsil sisteminə inteqrasiyası, təhsil müəssisələrində ənənəvi tədris və öyrənmə metodlarının rəqəmsal sahəyə xas təlim metodları ilə əvəz olunması;

4. Məzunların əmək bazarında özlərini reallaşdırması statistikasının hazırlanması ilə mövcud problemlərin aşkar edilməsi üçün Məzun İzləmə Sisteminin formalaşdırılması;

5. Məzun İzləmə Sisteminin məzunların əmək bazarında özlərini reallaşdırma hesabatlarına əsasən ixtisaslar üzrə təhsil proqramında müvafiq dəyişikliklər və əlavələrin edilməsi.

XXI əsrin tələblərinə uyğun rəqabət qabiliyyətli, dayanıqlı insan kapitalının yetişdirilməsi, ali təhsil müəssisələrində keyfiyyət mədəniyyətinin formalaşdırılması, insan kapitalının əmək bazarında özünü reallaşdırmasında mövcud problemlərin aradan qaldırılması istiqamətində qeyd olunan təkliflərin yerinə yetiriləcəyi təqdirdə problemləri həll etmək və bu sahədə inkişafa nail olmaq mümkündür.

***Qeyd:*** *Məqalə Təhsil İnstitutunun dəstəyi, Təhsil İdarəçiləri Assosiasiyası və T-Network təhsil işçilərinin təcrübə və kommunikasiya platformasının təşkilatçılığı ilə 22-25 aprel 2021-ci ildə keçirilən Təhsil İdarəçiliyi Beynəlxalq Konfransında təqdim edilib.*

### İstifadə edilmiş ədəbiyyat

1 Azərbaycan Respublikası Prezidentinin sərəncamları. (2021). *"Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər"in təsdiq edilməsi haqqında.* (Xalq Qəzeti Nəşri, № 24). Bakı, Azərbaycan. https://president.az/articles/50474

2 Carolyn, C., Christina, R. (2002). Quality Assurance and the Development of Course Programmes. Carfax Publishing, Taylor & Francis Ltd, Bucharest.

3 European Association for Quality Assurance in Higher Education (ENQA), European Students' Union (ESU), European University Association (EUA) and European Association of Institutions in Higher Education (EURASHE). (2015). *Standards and Guidelines for Quality Assurance in the European Higher Education Area (ESG).* Brussels: Belgium. by EURASHE, on behalf of the authors.

4 General Secretariat of the Council of the European Union. (2021). *Council Resolution on a strategic framework for European cooperation in education and training towards the European Education Area and beyond (2021-2030).* (6289/1/21 REV 1). Brussels: Belgium. The Official Journal. https://www.consilium.europa.eu/media/48584/st06289-re01-en21.pdf

5 https://www.iea.nl/studies/iea/icils/2018

6 https://www.oecd.org/pisa/

7 Joseph, J.M., Godfrey, A.B. (1998). Juran's Quality Handbook. 5th Edition. McGraw-Hill, USA.

8 Lytras, M.D., Visvizi, A., Sarirete, A. (2019). Management and Administration of Higher Educations at Times of Change. Emerald Group Publishing Limited, London.

9 Michaela, M., Antony, S. (2007). External quality assurance in higher education: making choices. The United Nations Educational, Scientific and Cultural Organization, Paris.

10 Nair, C.S., Mertova, P. (2011). Student Feedback – The cornerstone to an effective quality assurance system in higher education. Chandos Publishing, UK.

11 Sterian, P. (1992). Accreditation and Quality Assurance in Higher Education. Cepes UNESCO, Bucharest.

12 Tight, M. (2020). *Research into Quality Assurance and Quality Management in Higher Education.* Theory and Method in Higher Education Research, Vol. 6, pp. 185-202.

13 United Nations Economic and Social Council. (2020). *Progress towards the Sustainable Development Goals.* (E/2020/57). https://unstats.un.org/sdgs/files/report/2020/secretary-general-sdg-report-2020—EN.pdf

14 United Nations General Assembly. (2015). *Transforming our world: the 2030 Agenda for Sustainable Development.* (A/RES/70/1). https://sdgs.un.org/2030agenda

15 Westerheijden, Don F., Stensaker, B., and Rosa, M,J. (2007). *Quality Assurance In Higher Education.* Dordrecht: Netherlands, Springer.

# ALİ TƏHSİL MÜƏSSİSƏLƏRİNİN BEYNƏLXALQ RƏQABƏT QABİLİYYƏTİ: REYTİNQ METODOLOGİYASI

**MƏTANƏT QURBANOVA**
Azərbaycan Respublikasının Təhsil İnstitutu, Təhsilin nəzəriyyəsi və tarixi şöbəsi, böyük elmi işçi. e-mail: m.qurbanova@arti.edu.az
https://orcid.org/0000-0001-7245-6275

**Məqaləyə istinad:**
Qurbanova M. (2021). Ali təhsil müəssisələrinin beynəlxalq rəqabət qabiliyyəti: reytinq metodologiyası. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 19–31

**ANNOTASİYA**

Məqalədə Azərbaycan Respublikasında ali təhsil müəssisələrində reytinq sistemi üzrə işin təkmilləşdirilməsi üçün beynəlxalq, milli və profil üzrə müvafiq sistemlərin tarixi və zəruri istiqamətləri araşdırılmış, hər bir istiqamət üzrə uyğunluğu təmin edəcək başlıca parametrlər müəyyənləşdirilmişdir. Pedaqoji/akademik heyətin keyfiyyəti və onların əsərlərinə edilən iqtibas tezliyi, məzunların iş təminatı və əmək bazarında keyfiyyət göstəriciləri, əcnəbi tələbələr üzrə qəbul faizi, elmi tədqiqatların aparılması sahəsində liderlik, tədqiqat işlərinin əhəmiyyətlilik dərəcəsinin yaxşılaşdırılması üzrə müvafiq təkliflər hazırlanmışdır. Ranqlaşdırma, reytinq sisteminin müəyyənləşdirilməsi üzrə işin öyrənilməsi, anlayışların mahiyyətinin nəzəri ümumiləşdirmələr aparmaqla əsaslandırılması, ali təhsil müəssisələrinin keyfiyyətinin müqayisəsi ali təhsilin keyfiyyətinin yüksəldilməsi alətlərindən biridir. Azərbaycan Respublikasında ali təhsil sistemi üçün qarşıda duran zəruri məsələni, ali təhsilin hazırkı vəziyyətini nəzərə almaqla elmi cəhətdən əsaslandırılmış metodikanın formalaşdırılması və təkmilləşdirilməsi, keyfiyyətin qiymətləndirilməsi və reytinqin qurulması sahəsində dünya təcrübəsindən istifadənin hansı səviyyədə mümkünlüyünün təyin edilməsi məsələləri problem olaraq qarşıya qoyulmuş, pedaqoji müstəvidə təhlil və müqayisə edilmişdir.

**Açar sözlər:** Beynəlxalq reytinq, milli reytinq, profil üzrə reytinq, reytinq metodologiyası, THE-QS reytinqi, ARWU – Şanxay reytinqi, H-indeksi.

**Məqalə tarixçəsi**
Göndərilib: 14.06.2021
Qəbul edilib: 27.06.2021

# INTERNATIONAL COMPETITIVENESS OF HIGHER EDUCATION INSTITUTIONS: RATING METHODOLOGY

**MATANAT GURBANOVA**
Education Institute of the Republic of Azerbaijan, Department of History and Theory of Education, senior researcher. e-mail: m.qurbanova@arti.edu.az
https://orcid.org/0000-0001-7245-6275

**To cite this article:**
Gurbanova M. (2021). International competitiveness of higher education institutions: rating methodology. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 19–31

**ABSTRACT**

This article examines the history and necessary directions of global, national and profile ranking systems to improve the work of the ranking system in higher education institutions in the Republic of Azerbaijan. The main parameters that will ensure compliance in each direction have been identified. Relevant proposals have been prepared to improve the quality of teaching staff and the frequency of citations to their works, employment of graduates and quality indicators in the labor market, the reputation of graduates in the labor market, the percentage of foreign students, leadership in research, the importance of research. Ranking, study of the work on determining the rating system, substantiation of the essence of the concepts by conducting theoretical generalizations, comparison of the quality of higher education institutions are one of the tools to improve the quality of higher education. Problems of formation of the scientifically based methodology, taking into account the current state of higher education, assessment of the quality of higher education and determination of the level of possibility of using the world experience in the field of rating were raised as a problem, were compared and analyzed at the pedagogical level.

**Keywords:** Global ranking, national ranking, profile rankings of universities, ranking methodology, THE-QS ranking, ARWU – Shanghai Ranking, H-index.

**Article history**
Received: 14.06.2021
Accepted: 27.06.2021

## GİRİŞ

Ali təhsil müəssisələrinin ranqlaşdırılması və reytinqinin müəyyən edilməsinə ilk dəfə 2003-cü ildən müxtəlif təşkilatlar və institutlar tərəfindən həyata keçirilməyə başlandı. Reytinq cədvəli müxtəlif kriteriyalar – ali təhsil müəssisələrinin elmi nəşrlərinin sayı, akademik mobillik, pedaqoji/akademik heyətin keyfiyyəti, onların əsərlərinə iqtibas tezliyi, məzunların işlə təminatı, h-indeks üzrə elmə verilən töhfələrin qiymətləndirilməsi, internet ünvanının aktivliyi və digər parametrlərə görə hazırlanır. Aparıcı universitetləri qiymətləndirmək üçün müxtəlif – qlobal, beynəlxalq reytinq sistemləri mövcuddur. Bəzi ölkələrin universitetləri bu sistemlərdə təmsil oluna bilmədiklərindən milli reytinq mexanizmlərini yaratmaqla qoşulmağa çalışırlar. 2003-cü ildə Şanxay Jiao Tong Universitetinin Ali Təhsil İnstitutunun Dünya Səviyyəli Universitetlər Mərkəzi tərəfindən ranqlaşdırılan və hər il yenilənən Academic Ranking of World Universities – ARWU (Dünya Universitetlərinin Akademik Ranqlaşdırılması), 2004-cü ildə İspaniyanın Kibermetriya Laboratoriyası tərəfindən həyata keçirilən Webometrics Ranking of World Universities (Dünya Universitetlərinin Vebometrik Reytinqi), 2004-cü ildə Böyük Britaniyanın “TSL Education Ltd” təşkilatı ilə “Quacquarelli Symonds” şirkətinin birgə layihəsi olan Times Higher Education – QS World University Rankings (THE-QS reytinqi), 2007-ci ildə Tayvan hökuməti tərəfindən yaradılmış Perfomance Ranking of Scientific Papers for World Universities (Dünya universitetlərinin elmi məqalələrinin ranqlaşdırılması) kimi bir sıra nüfuzlu beynəlxalq qiymətləndirmə sistemlərini buna nümunə göstərmək mümkündür.

İlk illərdə dünya ölkələrinin bir çoxunda (Argentina, Avstraliya, Braziliya, Kanada, Çili, Pakistan, Ukrayna və s.) ali təhsil müəssisələrinin veb-saytlarının xarici dildə, xüsusilə ingilis dilində versiyasının olmaması, universitetlərin elmi nəticələrinin veb-saytlarda yerləşdirilməməsi, beynəlxalq akademik bazalarda təhsil müəssisəsi adından məqalələrin nəşr olunması və s. səbəblərdən beynəlxalq reytinqlərdə yer ala bilmədiklərinə görə tədricən ayrı-ayrı milli reytinqlər işlənib hazırlanmışdır. MDB ölkələrindən Rusiya Təhsil və Elm Nazirliyi tərəfindən (prosesi Patani Xeyriyyə Cəmiyyəti həyata keçirmişdir) 2004-cü ildən, Qazaxıstanda isə 2006-cı ildən etibarən ali təhsil müəssisələrinin reytinqinin müəyyənləşdirilməsi işi aparılır.

Azərbaycan Respublikasında ali təhsil müəssisələrinin reytinqinin müəyyənləşdirilməsi prosesinə Azərbaycan Respublikası Təhsil nazirinin 11 oktyabr 2013-cü il tarixli, 842 nömrəli əmrinə əsasən təşkil olunmuş “İctimai təşəbbüslərin dəstəklənməsi üzrə layihə müsabiqəsi”nin qalibi olmuş, “Təhsil siyasəti üzrə təşəbbüslər” və “Təhsil sahəsi üzrə tədqiqat təşəbbüsləri” istiqamətini əhatə edən qalib layihədən biri olaraq başlanmışdır. Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası” strateji hədəf olaraq təqdim edilən cari problem baxımından əsas sənəd hesab olunur. Adı qeyd olunan layihənin icraçısı Azərbaycandan Kənarda Təhsil Almış Mütəxəssislər Təşkilatı (AKTAM) olmuşdur. “Azərbaycan Respublikasında ali məktəblərin reytinqinin müəyyən edilməsi” layihəsi çərçivəsində Azərbaycan universitetlərinin beynəlxalq qiymətləndirmə sistemlərində təmsil olunmasına nail olmaq məqsədi ilə milli reytinq mexanizminin hazırlanması sahəsində bir sıra təkliflər hazırlanmışdır.

Azərbaycan Respublikasında ali təhsil müəssisələrinin sürətlə dəyişən, inkişaf edən dünya elmi, xüsusilə əmək bazarı fonunda beynəlxalq qiymətləndirmə sistemlərində daha müvəffəqiyyətlə təmsil olunması üçün milli reytinq mexanizminin hazırlanması sahəsində daha çevik addımlar atılması labüddür.

Tədqiqatın aparılmasında məqsəd aşağıdakı kimidir:

- Ali təhsil müəssisələrinin reytinq sisteminin müəyyənləşdirilməsi üzrə işin (beynəlxalq, milli və profil üzrə reytinq sistemlərinin tarixi və zəruri istiqamətləri) öyrənilməsi;

- Pedaqoji/akademik heyətin keyfiyyəti və əsərlərinə edilən iqtibas tezliyi, məzunların iş təminatı və əmək bazarında keyfiyyət göstəriciləri, əmək bazarında formalaşdırılmış reputasiya, əcnəbi tələbələr üzrə qəbul faizi, elmi tədqiqatların aparılması sahəsində liderlik, tədqiqat işlərinin əhəmiyyətlilik dərəcəsinin yaxşılaşdırılması üzrə müvafiq təkliflər vermək.

Tədqiqatın obyekti ali təhsil müəssisələrinin beynəlxalq, milli və profil üzrə reytinq mexanizmləridir. Tədqiqatın predmeti ali təhsil müəssisələrinin beynəlxalq, milli və profil üzrə reytinq sistemləri və hər bir istiqamət üzrə uyğunluğunu təmin edəcək başlıca parametrlərin müəyyənləşdirilməsidir.

Tədqiqatın elmi yeniliyi ranqlaşdırma, reytinq sisteminin müəyyənləşdirilməsi üzrə işin öyrənilməsi, anlayışların mahiyyətinin nəzəri ümumiləşdirmələr aparmaqla əsaslandırılması, ali təhsil müəssisələrinin keyfiyyətinin müqayisəsi və yüksəldilməsi alətlərindən biridir. Azərbaycan Respublikasında ali təhsil sistemi üçün qarşıda duran zəruri məsələni, ali təhsilin hazırkı vəziyyətini nəzərə almaqla elmi əsaslandırılmış metodikanın təkmilləşdirilməsi, ali təhsilin keyfiyyətinin qiymətləndirilməsi sahəsində dünya təcrübəsindən istifadənin hansı səviyyədə mümkünlüyünün təyin olunması məsələləri problem olaraq qarşıya qoyulmuş, pedaqoji müstəvidə təhlil və müqayisə edilmişdir.

## Ali təhsil müəssisələrinin aparıcı beynəlxalq (QS, Times Higher Education, ARWU-Şanxay reytinqi, Forbes), milli və profil üzrə reytinq sistemləri

Ali təhsil sisteminin inkişafı cəmiyyətin ümumi inkişaf səviyyəsinin, sosial-iqtisadi vəziyyətin və həyat keyfiyyətinin ümumi mənzərəsini yaradır. Həm inkişaf səviyyəsini, həm də keyfiyyəti ölçmək, nəticəyə nəzarət etmək və onu yaxşılaşdırmaq üçün bu sahədə beynəlxalq və milli standartlara istinad etmək zəruridir.

Ali təhsil müəssisələrinin ranqlaşdırılması zamanı mövcud fərqli reytinq sistemləri və sıralamalar mütləq şəkildə obyektiv hesab edilmədiyi kimi, onlar arasında tam uyğunluq da mövcud deyil. Buna səbəb ali təhsil müəssisələrinin keyfiyyət göstəricilərinin və nailiyyətlərinin sadəcə rəqəmlə ifadə edilə bilinməyəcəyi ölçüdə fərqli imkanlara malik olmasıdır. Fərqli reytinq sistemlərinin müqayisəsi üçün ümumi standartların tətbiq edilməsi məqsədilə əsas meyarların müəyyənləşdirilməsi istiqamətində UNESCO Ali Təhsil Mərkəzi[1] tərəfindən beynəlxalq ekspert qrupunun iştirakı ilə 16 maddədən ibarət Berlin prinsipləri[2] işlənib hazırlanmışdır. Tibb, mühəndislik, riyaziyyat, memarlıq və s. sahələr üzrə profilləşmiş hər bir ali təhsil müəssisəsinin fərqli ehtiyacları, pedaqoji/akademik heyəti və tələbə profilləri olmasına baxmayaraq, elmi nəşrlərlə bağlı dəyərləndirmələr zəruri prinsip olaraq daxil edilmişdir.

Keyfiyyətin, ümumi göstəricilərin ölçülə bilən olması verilənlər bazasında xüsusi datalar vasitəsilə və etibarlı hesab edilən rəqəmlərlə ifadəsi sayəsində mümkündür. Beləliklə, hər bir ali təhsil müəssisəsi beynəlxalq təcrübədə təhsilin məzmununa inteqrasiya edə bilməsi üçün öz missiya və hədəflərini beynəlxalq və milli reytinq sistemlərinə görə tənzimləyə bilir. Beynəlxalq təcrübədə daha çox bilinən reytinq sistemləri THE – QS, ARWU-Şanxay reytinqi və s-dir.

QS Beynəlxalq Universitet Reytinqi 2004-cü ildən etibarən Quacquarelli Symonds şirkəti tərəfindən və fərqli akademik meyarlar əsasında ranqlaşdırılır. QS şirkəti universitetləri 4 əsas amilin hər biri maksimum 100 bal olmaqla, fərqli meyarlarla (həmçinin ixtisas və fakültələr üzrə) dəyərləndirərək sıralamanı müəyyənləşdirir (Cədvəl 1).

---

[1] UNESCO European Centre for Higher Education (UNESCO-CEPES).

[2] HEI rankings—the Berlin Principles on Ranking of Higher Education Institutions. (Berlin, 18 to 20 May, 2006) http://ireg-observatory.org/en_old/berlin-principles

**Cədvəl 1** QS Beynəlxalq Universitet Reytinqi üzrə nəticələrin hesablanması

| Amil | Meyar | Təsvir | Əhəmiyyətlilik |
|---|---|---|---|
| Elmi tədqiqatların keyfiyyəti | Hakim/ekspert rəyi | Hakim rəyi əsasında verilən ümumi bal | 40 % |
| | Pedaqoji/akademik heyətin iqtibas alan əsərləri | Universitet üzrə aparılan nəşrlərdə pedaqoji heyət üzrə nisbəti | 20 % |
| Məzunların iş tapmaq imkanları | İşverənlərin rəyi, münasibəti | İşverənlər arasında aparılan anket nəticələri | 10 % |
| Beynəlxalq əlaqələr | Əcnəbi müəllim | Universitetdə fəaliyyət göstərən əcnəbi müəllim sayı | 5 % |
| | Əcnəbi tələbə | Universitetdə təhsil alan tələbə sayı | 5 % |
| Təhsilin keyfiyyəti | Müəllim və tələbə heyəti | Müəllim və tələbə arasında say nisbəti | 20 % |

ARWU-Şanxay reytinqi – Shanghai Jiaotong Universiteti nəzdində Reytinq Şurası 2003-cü ildən etibarən hər il olmaqla dünyanın ən yaxşı 500 universitetinin reytinqini hazırlayır. Bu istiqamətdə ilk reytinqi hazırlayan Shanghai Universiteti başlanğıcda Çin universitetləri ilə dünyanın nüfuzlu universitetləri arasında müqayisə aparmağı məqsəd olaraq qarşıya qoymuşdu. ARWU-Şanxay reytinqi tərtibat və qiymətləndirmədə göstərdikləri çevik, əsaslandırılmış və düzgün qiymətləndirmə – ölçmə siyasəti səbəbi ilə bu sahədə ən çox təqdir alan qurum səviyyəsinə yüksələ bildi (Cədvəl 2).

Ali təhsil müəssisələrinin beynəlxalq səviyyədə reytinqini hazırlayan bir sıra digər nüfuzlu sistemlər də mövcuddur:

1. "Newsweek" jurnalının dünyanın ən yaxşı 100 universiteti reytinqi (Top 100 Global Universities);
2. Webometrics: Cybermetric Laboratoriyaları. Vebdə Dünya Universitetlərinin Reytinqi (Webometrics: World Universities' Ranking on the Web);
3. Google Search – Beynəlxalq Universitetlər Reytinqi (G-Factor International University Rankings);
4. MINES – Taris Texnologiyaları üzrə Beynəlxalq Universitetlərin Peşəkarlıq Reytinqi (Professional Ranking of World Universities);
5. HEETACT – "Higher Education Evaluation and Accreditation Council of Taiwan" Beynəlxalq Universitetlər Elmi Tədqiqatların Nəticələrinin Reytinqi (Performance Ranking of Scientific Papers for World Universities);
6. Leiden – Hollandiyanın Leiden Universiteti nəzdində Tibbi və Texnoloji Elmlər Mərkəzinin (The Centre for Science and Technology Studies) hazırladığı reytinq;
7. SCImago reytinqi – SCImago tərəfindən hazırlanan, 17000 jurnalı müqayisə edən Scopus data bazadan istifadə etməklə aparılan reytinq sistemi;
8. Çin Wuhan Universitetinin Qlobal Universitet Reytinqi (Global University Ranking) və s.

Azərbaycan Respublikasında ali təhsil müəssisələrinin beynəlxalq tələblərə cavab verən veb-səhifələrinin aktivliyi, elmi nəticələrin əlyetənliyi, impakt faktorlu jurnallarda məqalələrin nəşrinin artırılması, xarici universitetlərlə tələbə, müəllim mübadiləsi və s. bu kimi

**Cədvəl 2** ARWU-Şanxay reytinqi üzrə nəticələrin hesablanması

| Amil | Meyar | Kod | Əhəmiyyətlilik |
|---|---|---|---|
| Təhsilin keyfiyyəti | Nobel mükafatı əldə etmiş məzun və pedaqoji/akademik heyət üzvlərinin sayı | Təqaüdçü | 10 % |
| Məzunların iş tapmaq imkanları | Tədqiqat apardığı sahə üzrə medal qazanan pedaqoji/akademik heyət üzvlərinin sayı | Mükafat | 20 % |
| | 21 bölmə/sahə üzrə iqtibas alan pedaqoji/akademik heyət üzvlərinin sayı | HiCi | 20 % |
| Tədqiqat imkanları/vasitələri | "Nature and Science" jurnalında nəşr etdirilən məqalələr | N&S | 20 % |
| | Science Citation Index-Expanded, Social Science Citation Index' də nəşr etdirilən məqalələr | SCİ | 20 % |
| Universitetin böyüklüyü | Universitetlərin böyüklüyünə görə göstərdiyi nəticələr – infrastruktur | Böyük | 10 % |

göstəriciləri nəzərə alaraq milli reytinqin yaradılması böyük əhəmiyyət kəsb edir. Bu məqsədin həyata keçirilməsi ilə Azərbaycan ali təhsil müəssisələrinin beynəlxalq reytinqlərdə yer almasına, həmçinin yer alan universitetlərin ranqının yüksəlməsinə və s. bu kimi üstünlüklərə nail olmaq mümkündür:

**Pedaqoji/akademik heyət**

- professorların sayının tələbələrin sayına nisbəti;
- elmlər doktorlarının sayının tələbələrin sayına nisbəti;
- dosentlərin sayının tələbələrin sayına nisbəti;
- fəlsəfə doktorlarının (PhD) sayının tələbələrin sayına nisbəti;
- elmi dərəcə və elmi adı olmayanların sayının tələbələrin sayına nisbəti;
- xarici ölkələrdən olan müəllimlərin sayının tələbələrin sayına nisbəti;
- magistrlərin sayının tələbələrin sayına nisbəti;
- xarici ölkələrdən olan magistrlərin sayının tələbələrin sayına nisbəti;
- doktorantların və dissertantların sayının tələbələrin sayına nisbəti;
- xarici ölkələrdən olan doktorantların və dissertantların sayının tələbələrin sayına nisbəti;
- xarici ölkələrdən olan tələbələrin sayının tələbələrin ümumi sayına nisbəti.

**Elmi fəaliyyət**

- çap edilmiş elmi məqalələrin sayının pedaqoji/akademik heyət üzvlərinin sayına nisbəti;
- xarici ölkələrdə çap edilmiş elmi məqalələrin sayının pedaqoji/akademik heyət üzvlərinin sayına nisbəti;
- impakt faktoru olan jurnallarda çap edilmiş elmi məqalələrin sayının pedaqoji/akademik heyət üzvlərinin sayına nisbəti;
- monoqrafiyaların sayının pedaqoji/akademik heyət üzvlərinin sayına nisbəti;
- dərslik və dərs vəsaitlərinin sayının pedaqoji/akademik heyət üzvlərinin sayına nisbəti;
- Azərbaycanda ixtiralara alınmış patentlərin sayının pedaqoji/akademik heyət üzvlərinin sayına nisbəti;

- xarici ölkələrdən ixtiralara alınmış patentlərin sayının pedaqoji/akademik heyət üzvlərinin sayına nisbəti;
- profillər üzrə pedaqoji/akademik heyətin h-indeksi.

**Universitetlərin veb-saytı**

- universitetlərin veb-saytına edilən xarici istinadların (verilən iqtibasların) sayı;
- universitetlərin veb-saytında yerləşdirilmiş qiymətli faylların sayı;
- universitetlərin veb-saytında yerləşən alt səhifələrin və direktoriyaların sayı;
- universitetin veb-saytının keyfiyyəti.

Reytinqin müəyyənləşdirilməsində vahidliyin təmin olunmasına 2004-cü ildən YUNESKO-nun ali təhsil üzrə Avropa Mərkəzi və Ali Təhsil sahəsində Siyasət İnstitutunun (ABŞ) ranqlaşdırma üzrə beynəlxalq ekspert heyəti nəzarət edir. Heyətin hazırladığı xüsusi Berlin prinsipinə əsasən ali təhsil müəssisələrinin reytinqinin müəyyənləşdirilməsinin ümumi prinsipləri və standart metodikası təqdim edilib. Bu prinsipə əsasən ali təhsil müəssisələrinin reytinqi bir-birindən asılı olmayan üç müstəqil kateqoriya əsasında müəyyənləşdirilir:

- ali təhsil müəssisələrinin akademik resursları, ali təhsil müəssisələrinin pedaqoji/akademik heyəti, tələbələrin nailiyyəti, tədris, maliyyə resursları, təminat və s. kriteriyalar üzrə ranqlaşdırma;
- ali təhsil müəssisələrinin daxildən, yəni müəllim və tələbələr tərəfindən qiymətləndirilməsi;
- hər bir kateqoriya daxilində çoxsaylı kriteriya nəzərə alınmaqla, məzunların göstəricilərinin işəgötürənlər, o cümlədən mərkəzi və yerli icra hakimiyyəti orqanları, eləcə də böyük və kiçik şirkətlər tərəfindən qiymətləndirilməsi.

Hər bir kateqoriya daxilində çoxsaylı kriteriyalar mövcuddur. Məsələn, akademik resurslara aid kateqoriya çərçivəsində 7 kriteriya və 39 indikator əsasında ali məktəblərdən materiallar toplanır. Daha sonra hər bir ali təhsil müəssisəsinin tələbələri 7 qrupla anketləşdirilən sualları cavablandırır, həmçinin müəllim və tələbələr arasında sorğu həyata keçirilir. Eyni zamanda ali məktəb məzunlarının səviyyəsini müəyyənləşdirmək üçün dövlət və özəl təşkilatlar, müəssisələrin son illər işə götürdükləri, tanıdıqları məzunlar haqqında məlumatlar generasiya edilir, daha çox hansı universitetin məzunlarının işlə təmin olunması məsələsi müəyyənləşir. Beləliklə, ali təhsil müəssisələrinin reytinqi 3 kateqoriya çərçivəsində toplanan materialların cəmi ilə müəyyən olunur. Kateqoriyalar üzrə qiymətləndirmə balları öncədən tərtib edilir, resursların müəyyən edilməsi, pedaqoji/akademik heyətin, tələbələrin tərkibinin keyfiyyəti, ödənişli və ödənişsiz təhsil, əcnəbi tələbələrin say nisbəti, ali məktəblərin elmi-tədqiqat potensialı, maliyyələşmə, əldə edilən gəlirlərin mütənasib və optimal xərclənməsi, tələbə qəbulunun və tədris prosesinin nəticələri, beynəlxalq əməkdaşlığın səviyyəsi, sosial-mədəni həyat və s. kriteriyalar üzrə qiymətləndirmə – ölçmələr aparılır.

### Pedaqoji/akademik heyətin keyfiyyəti və onların əsərlərinə iqtibas tezliyi

Ali təhsilin keyfiyyətini yaxşılaşdırmaq məqsədilə ali məktəblərin reytinqinin müəyyən edilməsi üçün beynəlxalq təşkilatların dəstəyi ilə müxtəlif ölkələrdə davamlı şəkildə bir sıra tədqiqatlar həyata keçirilir. Ali təhsil müəssisələrinin keyfiyyətinin müqayisə mexanizmi onların keyfiyyətinin yüksəldilməsi alətlərindən biri hesab olunur. Azərbaycan Respublikasında ali təhsilin hazırkı vəziyyətini nəzərə almaqla elmi əsaslandırılmış metodikanın yaradılması, təkmilləşdirilməsi, keyfiyyətin qiymətləndirilməsi və inkişaf etmiş ölkələrin reytinqinin qurulması sahəsində dünya təcrübəsindən istifadənin mümkünlüyünün təyin edilməsi zəruri məsələlərdəndir. Reytinqi təyin etmənin əsas məqsədləri aşağıdakı kimidir:

- qərar qəbul etmək üçün ictimaiyyətə informasiyanın təqdim olunması (abituriyentə və onların valideynlərinə; təhsil siyasətini formalaşdıran mütəxəssislərə, fondlara, işəgötürənlərə, beynəlxalq təşkilatlara);

- ali təhsil müəssisələrinin inkişafını stimullaşdırmaq və bu sahədə rəqabət mühitinin yaradılmasına kömək etmək;
- ali təhsil müəssisələrinin daxili keyfiyyətartırma mərkəzlərinin yaradılmasına və mövcud mərkəzlərin inkişafına təkan.

Ranqlaşdırma metodikasının yaradılması "Ali təhsil müəssisələrinin ranqlaşdırılmasının Berlin prinsipləri"nə (Berlin, may 2006-cı il) əsaslanmalıdır.

Azərbaycan ali təhsil sistemində, ilk növbədə aşağıdakı vacib prinsiplər nəzərə alınır:

- tədris müəssisələrinin müxtəlifliyini (o cümlədən dövlət və özəl təhsil müəssisələrinin ənənəvi fərqini) qəbul etmək, onların missiya və məqsədlərini nəzərə almaq;
- Azərbaycanda ali təhsil sistemində dil, mədəni, iqtisadi, eləcə də tarixi kontekstlərin və müvafiq olaraq beynəlxalq təcrübənin dəqiq uçotu (bütün ölkələrdə və ya təhsil sistemlərində ali təhsil müəssisələrinin keyfiyyətinə eyni cür baxılmır);
- təsdiq olunmuş müstəqil mənbələrdən və ya yoxlanılmış məlumatlardan, mümkün olduğu qədər daha çox istifadə etmək;
- yaradılmış reytinqlərə etibarlılığı artıran təşkilati qaydaların tətbiqi;
- reytinqin tərtib olunmasında istifadə olunan bütün faktorların reytinq istifadəçiləri tərəfindən dəqiq anlaşılmasının təmin edilməsi.

Azərbaycanda ali təhsil müəssisələrinin (milli) reytinqini müəyyən etməkdə məqsəd, əsasən, aşağıdakılardır:

1. İctimaiyyətə (abituriyent və onların valideynlərinə, siyasətçilərə, beynəlxalq təşkilatlara, işlə təmin edən təşkilatlara) qərar qəbul etmək üçün informasiyanın verilməsi;
2. Ali məktəblər arasında rəqabətin inkişafına təkan vermək;
3. Ali məktəblərin daxili keyfiyyətinin artırılması mərkəzlərinin yaradılmasına və inkişafına təkan;
4. Ali təhsil ocaqlarının akademik muxtariyyətinin müəyyənləşməsi;
5. Ali təhsil müəssisəsində və tədris prosesində özünüidarənin tətbiqinə təkan vermək.

Ali təhsil müəssisəsinin reytinqinin müəyyənləşdirilməsi amillərindən biri olan pedaqoji/akademik heyətin dəyərləndirilməsi bütün dünyada təxminən bir-birinə yaxın və ortaq meyarlarla ölçülür. Məsələn, Amerika universitetlərindən North Carolina Universitetində pedaqoji/akademik heyət üzvlərinin dəyərləndirilməsi zamanı nəzərə alınan meyarlar aşağıdakı istiqamətlərdə ümumiləşdirilir:

1. Tədris, tövsiyə, tədris proqramı, təhsil üzrə inkişafyönlülük:
   a) ixtisas üzrə elmi dərəcəsi;
   b) dərs tərtibatı;
   c) dərs təqdimatı, tədris prosesinin təşkili;
   d) tələbə tədqiqatlarının idarə edilməsi;
   e) məzunlarla iş aparan assistentlərə rəhbərlik;
   f) tədris planları ilə bağlı inkişafyönlü addımlar.
2. İxtisas üzrə tədqiqatlar, yaradıcılıq və peşəkar fəaliyyətlər:
   a) elmi nəşrlər;
   b) konfranslarda çıxışlar.
3. Universitetə, ictimaiyyətə, mediaya və peşəyə xidmət:
   a) universitet idarəetməsinə faydası;
   b) ictimaiyyətə, mediaya xidmət;
   c) peşəyə xidmət.

Təqdim edilən meyarlar üzrə hər bir heyətin portfoliosu hazırlanır, heyət üzvlərinin qiymətləndirmə zamanı əldə edilən nəticələr əsasında yenidən təyinatına, mükafatlandırılmasına və ya daimi əsaslarla işdə davam etməsinə qərar verilir.

### Məzunların işlə təminatı, əmək bazarında keyfiyyət göstəriciləri və formalaşdırılmış reputasiya

Ali təhsilin keyfiyyətini yaxşılaşdırmaq məqsədilə ali məktəblərin reytinqinin müəyyən edilməsi üçün ölkə ictimaiyyətinin, ayrı-ayrı nazirliklərin, idarə və təşkilatların ali təhsil müəssisəsinin məzunlarının hazırlıq səviyyəsini qiymətləndirməsi aşağıdakı kriteriyalar əsasında həyata keçirilir:

**Cədvəl 3** Ali təhsil müəssisələrinin məzunlarının təhsildən sonrakı dövrdə ictimai-iqtisadi fayda, ictimai-sosial fayda, fərdi-iqtisadi fayda və fərdi-sosial fayda kateqoriyaları

| İctimai-iqtisadi fayda | İctimai-sosial fayda | Fərdi-iqtisadi fayda | Fərdi-sosial fayda |
|---|---|---|---|
| Vergi gəlirlərində artım | Cinayətlərin sayında azalma | Yüksək yaşayış səviyyəsi | Sağlamlıq və uzunömürlülük |
| Məhsuldarlıqda artım | İanə və sosial xidmət sahəsində fəaliyyətlərdə artım | Əmək bazarına daha asan daxil ola bilmək | Övladlar üçün yüksək rifah – həyat şəraiti |
| İstehlakda artım | Vətəndaşlıq məsuliyyətinin inkişafı | İnvestisiyada artım | Müştəri olaraq daha sağlam qərarlar vermək |
| İş qabiliyyətinin uyğunlaşmasında yüksəliş | Sosial birlik/bərabərlik | Daha yaxşı iş şəraiti | Fərdi statusun yüksəlməsi |
| Dövlətdən gözlənilən maliyyə dəstəyinin azaldılması | Texnologiyaya uyğunlaşma və istifadə bacarıqlarının inkişafı | Fərdi/ixtisas hərəkətliliyi | Daha çox hobbi və asudə vaxt fəaliyyətləri |

- məzunun kvalifikasiyası, biliyi və işgüzar keyfiyyətinin qiymətləndirilməsi;
- gənc mütəxəssisin 8 saatlıq iş gününə hazırlığı;
- bir fəaliyyət növündən digərinə keçmək bacarığı;
- praktiki və ya cari məsələləri həll etmək üçün işçi qrup toplamaq və onlara rəhbərlik etmək bacarığı;
- yaxşı icraçılıq və ideyalar vermək bacarığı;
- fundamental və nəzəri hazırlığın keyfiyyəti.

Ali təhsil müəssisələrinin məzunlarının təhsildən sonrakı dövrdə ictimai-iqtisadi fayda, ictimai-sosial fayda, fərdi-iqtisadi fayda və fərdi-sosial fayda kateqoriyaları Cədvəl 3-dəki kimi qruplaşdırılmışdır.

Avropa Statistika Ofisinin (EUROSTAT[3]) təqdim etdiyi verilənlərə – dataya əsasən 20-34 yaş aralığında olan və son üç il ərzində hər hansı ali təhsil müəssisəsindən məzun olmaqla işlə təmin edilmə faizinin ən yüksək olduğu Avropa ölkəsi 96,7 % nəticə ilə Maltadır. İkinci yerdə 95,8 % nəticə ilə İslandiya, üçüncü yerdə isə 94,8 % nəticə ilə Hollandiya dayanır.

Universitetdən məzun olaraq üç il içərisində işlə təmin olunanların nisbəti Almaniyada 94,3, Birləşmiş Krallıqda 88,4, Finlandiyada 88,3, Fransada 84,4, İspaniyada 77,9, Türkiyədə 64,2, İtaliyada 62,8, Yunanıstanda isə 59 %-dir.[4]

## Elmi tədqiqatların aparılması sahəsində liderlik, tədqiqat işlərinin əhəmiyyətlilik dərəcəsi (H-index üzrə elmə verilən töhfələrin qiymətləndirilməsi)

Tədqiqat universiteti anlayışı ilk olaraq 1818-ci ildən etibarən Humboldt Universitetinin nümunəsində formalaşmışdır. 200 illik müsbət ənənənin mövcudluğu universitetlərin missiya və hədəfləri ilə bağlı müxtəliflikləri saxlamaqla

[3] European Statistical Office
[4] EUROSTAT – Employment rates of young people not in education and training by sex, educational attainment level and years since completion of highest level of education.

tədqiqat universitetinə çevrilmənin əsas şərtlərini ödəməyə imkan verir. Bütün reytinq sistemlərində bəzən tamamilə, bəzən də böyük ölçüdə tədqiqatların və elmi nəşrlərin xüsusi çəkisinin olduğu aydın müşahidə edilir. Azərbaycan Respublikasının ali təhsil müəssisələrinin də mövcud reytinq sistemlərində daha yuxarı səviyyələrdə təmsil oluna bilməsi üçün ilkin şərt ciddi, peşəkar, məhsuldar tədqiqatçıları işçi heyətə daxil etmək, tələb olunan şəraiti yaratmaqla onları karyera hədəfləri istiqamətində idarə etmək lazımdır. Məhsuldar tədqiqatçılarının olduğu təqdirdə istənilən ali təhsil müəssisəsi “tədqiqat universiteti, elm müəssisəsi” statusu qazanır. Belə müəssisələrin diqqət yetirməli olduğu məqamlara aşağıdakılar aid edilir:

- tədqiqatçılıq bacarıqları yüksək olan pedaqoji/akademik heyətin işə cəlb edilməsi;
- pedaqoji/akademik heyətə tədqiqatın aparılması üçün əlavə zaman imkanı yaradılması;
- tədqiqatın aparılması üçün tələb olunan maliyyənin təmin edilməsi;
- tədqiqatın aparılması üçün infrastrukturun qurulması;
- tədqiqatın aparılması üçün müəssisəyə doktorantların, tədqiqatçı assistentlərin cəlb edilməsi;
- pedaqoji/akademik heyətin attestasiyası, qiymətləndirilməsi işində xüsusilə elmi nəşrlərə üstünlük verilməsi.

Aparılan elmi tədqiqat işlərinin, elmi nəşrlərin qiymətləndirilməsi üçün müəyyən edilmiş ilkin meyarlar az, yaxud çox əhəmiyyətli olmaq şərti ilə nəşrin elmi tutumu haqqında informasiyanı təqdim edir:

*Ümumi nəşr sayı* – Məhsuldarlığı nümayiş etdirmək məqsədilə faydalı meyardır. Lakin nəşrin əhəmiyyətliliyi, faydalılığı baxımından informasiya verə bilmədiyi üçün kifayət qədər əsaslı meyar hesab edilmir.

*Ümumi iqtibas sayı* – aparılan tədqiqatın, araşdırmaların faydalılıq dərəcəsini aşkara çıxarmaq baxımından iqtibas (sayı) tutarlı meyardır. Bu, tədqiqatın hansı səviyyədə müzakirə mövzusu olduğundan, növbəti tədqiqatlar üçün etibarlı mənbə olaraq istinad edildiyindən xəbər verir.

*Hər bir nəşrə edilən iqtibas sayı* – həm ilk iki meyarın birlikdə dəyərləndirilməsini təmin edir, həm də nəşrinin sayı çox olan təcrübəli elm adamı ilə nəşr sayı nisbətən məhdud miqdarda olan gənc tədqiqatçını müqayisə edə bilmək üçün önəmli imkandır.

*Keyfiyyətli/faydalı nəşr sayı* – müəyyən saydan (məsələn, 5-dən) çox iqtibas edilən nəşrlərin önəm verildiyi, diqqət yetirildiyi meyardır.

H-indeksi 2005-ci ildə Argentina əsilli ABŞ fiziki Xorxe Hirşanın təklif etdiyi elmmetrik göstərici əsasında və alimin şərəfinə eyni adla qəbul edilmişdir. H-indeksi alimlərin (müəlliflərin), yaxud alim qrupunun (müəlliflər qrupunun), eyni zamanda təmsil olunduqları elm, təhsil müəssisəsinin fəaliyyətinin elmi nəşrlər və həmin nəşrlərə istinada görə kəmiyyət göstəricisidir.

H-indeksinə elmi ədəbiyyatda hirşa indeksi[5] olaraq rast gəlmək də mümkündür. Elmi məhsuldarlığın ölçülməsi baxımından geniş istifadə edilən h-indeksi, bir alimin (alim qrupunun) reputasiyasının yalnız vahid, rəqəmlə ifadəsinə görə məhdud təəssürat yaratmaqla yanaşı, müəyyən suallar da yaradır. Lakin buna baxmayaraq, o, sadəcə ümumi nəşr sayı, bütün nəşrlərə ümumi iqtibas və hər bir nəşrə ayrı-ayrılıqda iqtibas sayının nəzərə alındığı sistemlərdən daha faydalı hesab edilir. Məsələn, müvafiq sahə üzrə yalnız bir (ilkin) məqalə nəşr etdirən, yaxud bir neçə məqalənin hər birində 1-2 iqtibas gətirilən müəllifləri reytinq siyahısından çıxarmağa imkan verir. Bu da, yüksək h-indeksinə sahib olmaq üçün daha çox məqalə nəşr etdirməklə yanaşı, hər bir məqalədə maksimum sayda iqtibas gətirilməsi uğrunda rəqabəti[6] təmin edir:

$$\text{h-index} = n_a$$

[5] Yerli, xüsusilə MDB məkanında elmmetriya sahəsində hirşa indeksi olaraq adı çəkilən bu sistem beynəlxalq elm mühitində daha qısa – h-indeks olaraq qeyd edilir.

[6] Məqaləyə gətirilən hər bir iqtibas eyni zamanda onun özündən sonrakı tədqiqatlar üçün nə dərəcədə faydalı ola bildiyini ölçməyə imkan verir.




**Şəkil 1** h-indeksin qiymətinin asılılıq qrafiki

| Məqalə | İqtibas sayı |
|---|---|
| 1 | 39 |
| 2 | 32 |
| 3 | 27 |
| 4 | 11 |
| 5 | 9 |
| 6 | 6 |
| 7 | 5 |
| 8 | 3 |

**Şəkil 2** h-indeksin hesablanma qaydası

Müəllifin bir məqaləsinə edilən 10 istinad, onun 10 məqaləsinin hər birinə edilmiş 1 istinada bərabərdir, yəni hər iki halda müəllifin h-indeksi 1-ə bərabərdir (Şəkil 1).

Formal olaraq, f-i hər hansı bir nəşrə verilmiş iqtibas sayı (funksiya) götürsək, h-indeksi aşağıdakı qaydada hesablanır:

f-in qiymətini ən böyükdən ən kiçiyə doğru sıraladıqdan sonra f-in mövqeyindən böyük, yaxud ona bərabər olan son mövqeyi müəyyən etmək lazımdır. Bu mövqeni h adlandırırıq. Məsələn, 5 elmi nəşrində – A, B, C, D, E – də sıra ilə 10, 8, 5, 4 və 3 dəfə iqtibas gətirilən müəllifin h-indeksi 4-ə bərabərdir, çünki dördüncü nəşrdə iqtibas sayı 4-dür. Beşinci nəşrdə sadəcə 3 iqtibas var. Eyni nəşrlərdə 25, 8, 5, 3, 3 iqtibas gətirildiyi nümunədə isə h-indeksi 3-dür, çünki dördüncü nəşrə gətirilən iqtibas sayı 3-dür.

f(A)=10, f(B)=8, f(C)=5, f(D)=4, f(E)=3 → h-index=4

f(A)=25, f(B)=8, f(C)=5, f(D)=3, f(E)=3 → h-index=3

f funksiyasının ən böyük qiymətindən ən kiçik qiymətinə doğru sıralasaq, h-indeksini aşağıdakı qaydada hesablaya bilərik:

h-index (f) = {\displaystyle \max _{i}\ min(f(i),i)}\max _{i}\min(f(i),i)

Növbəti nümunədə eyni şərti daha sadə hesablama üsulu ilə (hesablama ağacı) təqdim etmək mümkündür (Şəkil 2).

*Qeyd: müəllifin h-indeksi Google Scholar[7]-dakı istifadəçi profilindən daxil olmaqla avtomatik (sistem tərəfindən) təqdim edilir, ona görə "əl ilə" hesablanmasına ehtiyac yaranmayacaqdır.*

Yaranan rəqabət fonunda müəlliflər öz h-indeksinin yüksəldilməsinə iki variantda birbaşa şəxsi təşəbbüslə nail ola bilirlər:

- yeni araşdırmalarda öz əvvəlki əsərlərindən iqtibas gətirməklə[8];
- iqtibas sayının az, yaxud çoxluğuna əhəmiyyət vermədən ümumi məqalə sayını artırmaqla.

Birinci halda aşağıdakı səbəblər müəllifin özündən iqtibas gətirməsinə təşviq edir:

- əvvəlki məqalə və ya tədqiqatı daha təkmil səviyyəyə çatdırmaq və yeniləmək;
- əvvəlki məqalə və ya tədqiqatın əlyetənliyini artırmaq, daha az reytinqli jurnaldan müvafiq sahə üzrə daha məşhur jurnalda iqtibas verərsə, rast gəlinmə tezliyini yüksəltməyə nail olmaq;
- az, yaxud heç iqtibas ala bilməyən əvvəlki məqalə və ya tədqiqatı tanıtmaq, xatırlatmaq;

[7] "Google Scholar" - elmi nəşrlərin tam mətnləri üzrə axtarış sistemi.

[8] Self-citation – özünə iqtibasın ümumi hesabda nəzərə alınmadığı hallarda belə müəllifin araşdırmalarını, yaradıcılığı davam etdirmə səyi baxımından faydalı hesab edilir.

- müvafiq sahə üzrə özünün "peşəkar", "mütəxəssis" olduğunu isbat etmək, məqalə və tədqiqatları dəyərləndirən rəyçiləri inandırmaq;
- əvvəlki məqalə və tədqiqatda təklif edilən metod, metodologiya, yanaşma, üsul, vasitə və s. üçün doğruluğunu əsaslandıracaq, möhkəmləndirəcək nümunələri təqdim etməklə problemin aktuallığını artırmaq;
- rəqəm olaraq öz iqtibasgətirmə sayını yüksəltmək.

İkinci halda, hər birinə minimum sayda iqtibas gətirilsə belə, ümumi məqalə sayının artması ilə digər tədqiqatçıların həmin müəllifin məqalələrinə daha çox rastgəlmə imkanını artırır. Yüksələn rastgəlmə tezliyi daha çox sayda iqtibas gətirə bilmək imkanını artırdığından, h-indeksini yüksəltmək mümkün olur.

Beynəlxalq səviyyədə elm mühitində humanitar elmlər sahəsi ilə sosial elmlər, həmçinin riyaziyyat sahəsi baxımından h-indeksin imkanlarının müqayisəsi tam uğurlu hesab edilmir. Əldə edilən nəticələr ayrı-ayrı elmlərarası ciddi fərqlər yaradır. H-indeksi fərqli elm sahələrindən olan elm adamlarının nüfuzunun ədalətli müqayisə edilməsi üçün vahid, optimal mexanizm kimi təklif edilə bilməz.

## NƏTİCƏ

Azərbaycan Respublikasında ali təhsil müəssisələrində elmi nəticələrin əlyetənliyi, impakt faktorlu jurnallarda məqalələrin nəşrinin artırılması, xarici universitetlərlə tələbə, müəllim mübadiləsi, beynəlxalq tələblərə cavab verən veb-səhifələrinin aktivliyi və s. kimi göstəriciləri nəzərə alaraq, milli reytinqdə əhəmiyyətli mövqeyə nail olmaq, eləcə də beynəlxalq reytinq sistemlərində uğurla təmsil olunmaq mümkündür. Bunun həyata keçirilməsi ilə Azərbaycan ali təhsil müəssisələrinin beynəlxalq reytinq hesabatlarında yer alması, həmçinin orada yer alan universitetlərin ranqının yüksəlməsi kimi üstünlüklərə nail olmaq mümkündür.

Tədqiqat materiallarının ümumiləşdirilməsi aşağıdakı nəticələrə gəlmək və təkliflər irəli sürmək imkanı verir:

Ali təhsilin keyfiyyətinin yüksəldilməsi alətlərindən biri – ali təhsil müəssisələrinin keyfiyyətinin müqayisə mexanizmi hesab olunur. Cari vəziyyəti nəzərə almaqla elmi əsaslandırılmış metodikanın yaradılması, təkmilləşdirilməsi, ali təhsilin keyfiyyətinin qiymətləndirilməsi və inkişaf etmiş ölkələrin reytinqin yüksəldilməsi sahəsində təcrübəsindən məqsədyönlü istifadə Azərbaycan Respublikasının ali təhsil sistemi üçün zəruri məsələlərdəndir. Reytinqi təyin etmənin əsas məqsədləri aşağıdakı kimidir:

- qərar qəbul etmək üçün ictimaiyyətə informasiyanın təqdim olunması (abituriyentlərə və onların valideynlərinə; təhsil siyasətini formalaşdıran mütəxəssislərə, işəgötürənlərə, beynəlxalq təşkilatlara);
- ali təhsil müəssisələrinin inkişafını stimullaşdırmaq və bu sahədə rəqabət mühitinin yaradılmasına kömək etmək;
- ali təhsil müəssisələrinin daxili keyfiyyətartırma mərkəzlərinin yaradılmasına və mövcud mərkəzlərin inkişafına təkan vermək.

Reytinqlər, ali təhsildə keyfiyyətin təmin edilməsinə xidmət edir və ayrı-ayrı kateqoriyalar üzrə ranqlaşdırılmış cədvəllərdə hər bir universitet qərarlaşdığı yeri və cari vəziyyətini, problemləri, çatışmazlıqları, eyni zamanda üstünlüklərini aydın müşahidə edə bilir. Ona görə də ali təhsil müəssisələri keyfiyyətin yaxşılaşdırılması üçün müvafiq addımlar atmağa daxili təşəbbüsü əsasında səfərbər olmalı, reytinqin nəticələrinə – informasiyaya dövlət, cəmiyyət, valideyn və xüsusilə də abituriyent/tələbənin çıxışını təmin etməlidir.

### İstifadə edilmiş ədəbiyyat


1. Azərbaycan Respublikası ali məktəblərinin reytinqləri üzrə tədqiqatlar. URL: http://www.rating.edu.az/index.php/az/layihe-haqqinda (istinad tarixi 07.05.2019).
2. Azərbaycan Respublikasının Təhsil sahəsində İslahat Proqramı. // Təhsil xəbərləri. 2009, № 4, s. 5-40.
3. Azərbaycan Universitetlərinin Vebometrik Reytinqinin Keçirilməsi Konsepsiyasının Hazırlanması. Azərbaycan Respublikasının

Prezidenti yanında Elmin İnkişafı Fondunun elmi-tədqiqat proqramlarının, layihələrinin və digər elmi tədbirlərin maliyyələşdirilməsi məqsədi ilə qrantların verilməsi üzrə 2011-ci il üçün Gənc Alim va Mütəxəssislərin müsabiqəsinin (EIF/GAM-2011-2(4)) qalibi olmuş və yerinə yetirilmiş layihə. EIF/GAM-1-2011-2(4)-26/05/1-M-26

4 Azərbaycan-2020: Gələcəyə baxış inkişaf konsepsiyası. “Azərbaycan”, 2012, 30 dekabr.

5 Əhmədov, H.H. (2010). Azərbaycan təhsilinin inkişaf strategiyası. Bakı, Elm. 800 s.

6 Leiden Ranqlaşdırması. Hollandiyanın Leiden Üniversitesi nəzdində CWTS-nin (The Centre for Science and Technology Studies) hazırladığı reytinq saytı. URL: http://www.cwts.nl/ranking/LeidenRankingWebSite.html (istinad tarixi 09.05.2019).

7 Məmmədov, H., Hüseynov, H. (2014). Təhsilin inkişafı üzrə Dövlət Strategiyasının bəzi icra mexanizmləri. “Azərbaycan”. 8 yanvar. № 1. s.6.

8 Mərdanov, M. (2009). 525-ci qəzet. 2 may. s.10-11. URL: http://anl.az/down/meqale/525/525_may2009/77276.htm (istinad tarixi: 09.06.2019).

9 Yaşar, Ə. (2013). Azərbaycan Universitetlərinin Reytinqinin Keçirilməsi Üçün Milli Mexanizmin İşlənməsi. Bakı Universitetinin Xəbərləri. №3 Fizika-riyaziyyat elmləri seriyası. s. 112-117.

10 Academic Ranking of World Universities (ARWU – (ShanghaiRanking Consultancy)). URL: http://www.shanghairanking.com/resources.html (istinad tarixi 07.05.2019).

11 Aydın, M.S., Kaya, H., Kete, H. (2017). Yükseköğretim Hizmetlerinin Özellikleri Ve Türkiye’de Yükseköğretim Hizmetlerinin Görünümü (Features Of Higher Education Services And Appearance Of Higher Education Services In Turkey). Journal Of Awareness 2 / 2 (June): 1-24.

12 Azerbaijan Ranking Web of Universities. URL: https://www.webometrics.info/en/Europe/Azerbaijan#content (istinad tarixi 06.05.2019).

13 Berlin Principles on Ranking of Higher Education Institutions. URL: https://www.che.de/downloads/Berlin_Principles_IREG_534.pdf (istinad tarixi 09.05.2019).

14 CHE-Excellence Ranking (Center for Higher Education). URL: http://www.che-ranking.de/cms/?getObject=613 (istinad tarixi 10.05.2019).

15 Kalaycı, N. (2008). Yükseköğretimde Öğretimi Değerlendirme Anketlerinde Öğrenci. Algılarındakı Farklılıkların Puanlamaya Etkileri. Kuram ve Uygulamada Eğitim Yönetimi. Bahar, Sayı 54, ss: 235-275.

16 QS World University Rankings (Quacquarelli Symonds). URL: https://www.topuniversities.com/university-rankings (istinad tarixi 10.01.2019).

17 Özer, M., Gür, B.S., ve Küçükcan, T. (2009). Yükseköğretimde Kalite Güvencesi. SETA Yayınları X, I Baskı, Pelin Ofset, Ankara. 115 s.

18 Performance Ranking of Scientific Papers for World Universities (Higher Education Evaluation and Accreditation Council of Taiwan). URL: http://nturanking.lis.ntu.edu.tw/ (istinad tarixi 09.05.2019).

19 Ranking Web of World Universities (Cybermetrics Lab (CCHS), a unit of the Spanish National Research Council (CSIC)). URL: http://www.webometrics.info/en (istinad tarixi 20.05.2019).

20 SCImago reytinqi – SCImago tərəfindən hazırlanan, 17000 jurnalı müqayisə edən Scopus data bazadan istifadə etməklə aparılan reytinq sistemi. URL: (istinad tarixi 09.05.2019)

21 THE (Times Higher Education) World University Rankings. URL: https://www.timeshighereducation.com/world-university-rankings (istinad tarixi 14.05.2019).

22 The World Higher Education Database – the WHED. International Association of Universities/UNESCO Information Centre on Higher Education. International Handbook of Universities (IHU). URL: http://www.unesco-whed.org/ (istinad tarixi 10.05.2019).

23 Türkiye’nin Yükseköğretim Stratejisi. (Yükseköğretim Kurulu tarafından hazırlanmıştır. Yayın No: 2007-1.) URL: http://www.oktemvardar.com/articles/turkiyenin%20yok_strateji_kitabi.pdf (istinad tarixi 07.05.2019).

24 Universitas 21. U21 Ranking of National Higher Education Systems – 2019. URL: https://universitas21.com/rankings (istinad tarixi 11.05.2019).

25 UTD Top 100 Business School Research Rankings (The UT Dallas’ School of Management). URL: http://jindal.utdallas.edu/the-utd-top-100-business-school-research-rankings/index.php (istinad tarixi 10.05.2019).

26 Рейтинг национальных систем высшего образования / U21 Ranking of National Higher Education Systems. URL: https://gtmarket.ru/ratings/u21-ranking-of-national-higher-education-systems/info (istinad tarixi 08.01.2019).

27 Рейтинги высшего образование. URL: https://www.iqconsultancy.ru/articles/reytingi-vysshego-obrazovaniya/ (istinad tarixi 09.05.2019).

# AZƏRBAYCANDA TƏHSİLİN KEYFİYYƏTİNİN İDARƏ OLUNMASI PROBLEMLƏRİ VƏ ONLARIN HƏLLİ İSTİQAMƏTLƏRİ

**AFAQ KƏRİMLİ**
Azərbaycan Dövlət İqtisad Universitetinin doktorantı
e-mail: karimliafag@gmail.com
https://orcid.org/0000-0001-5079-0096

**Məqaləyə istinad:**
Kərimli A. (2021). Azərbaycanda təhsilin keyfiyyətinin idarə olunması problemləri və onların həlli istiqamətləri. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 32–42

**ANNOTASİYA**

Təhsil vacib sahələrdən biri olmaqla yanaşı, həm də əhalinin və cəmiyyətin sosial həyatının əsas inkişaf istiqamətlərindəndir. Miqyas baxımından dəyərləndirsək, insan fəaliyyətinin bu sferası dünyada ən geniş və şaxələnmiş sahələrdən biridir. Çünki hazırda cəmiyyətin bütün təbəqələrini özünə bu cür geniş miqyasda cəlb edən və davamlı olaraq inkişafı hər bir dövlət üçün prioritet təşkil edən ikinci bir sfera tapmaq çətindir. Hər bir ölkənin iqtisadi, sosial və siyasi həyatında innovasiya proseslərinin intensiv inkişafı həm dövlət, həm də xüsusi təhsil müəssisələri səviyyəsində təhsilin idarə edilməsində müxtəlif problemlər yaradır. Bu problemlərin həll yollarının araşdırılması və tapılması isə hər bir dövlətin təhsil siyasətində öz aktuallığını saxlayır. Bir çox dövlətlər kimi Azərbaycan da təhsilin davamlı və dayanıqlı olması üçün inkişaf istiqamətlərini müəyyənləşdirən milli təhsil konsepsiyası və təhsil sisteminin bütün sahələrinin inkişafını özündə cəmləşdirən dövlət proqramları həyata keçirir. Burada əsas istiqamət kimi təhsilin keyfiyyətinin nəzərdə tutulması labüddür. Təhsilin keyfiyyəti dedikdə, təkcə tələbələrin biliklərinin dövlət standartlarına uyğunluğu deyil, həm də təhsil müəssisəsinin özünün uğurlu fəaliyyəti, habelə təhsil xidmətlərinin keyfiyyətinin təmin olunması yönündə pedaqoqların və idarəedənlərin fəaliyyətinin təşkil olunması başa düşülür.

**Açar sözlər:** Təhsilin keyfiyyəti, təhsil siyasəti, tədris metodları, təhsilin idarə olunması.

**Məqalə tarixçəsi**
Göndərilib: 05.05.2021
Qəbul edilib: 27.05.2021

# EDUCATION QUALITY MANAGEMENT IN AZERBAIJAN: PROBLEMS AND THEIR SOLUTIONS

**AFAG KARIMLI**
Doctoral student, Azerbaijan State University of Economics.
e-mail: karimliafag@gmail.com
https://orcid.org/0000-0001-5079-0096

**To cite this article:**
Karimli A. (2021). Education quality management in Azerbaijan: problems and their solutions. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 32–42

**ABSTRACT**

In addition to being one of the important areas, education is also one of the main fields of development of the social life of the population and society. In terms of scale, this sphere of human activity is one of the largest and most diversified in the world. Because nowadays it is difficult to find a second sphere that attracts all segments of society on such a large scale and sustainable development is a priority for each state. The intensive development of innovation processes in the economic, social and political life of each country creates various problems in the management of education at the level of both public and private educational institutions. The study and finding solutions to these problems remains urgent in the education policy of each state. Like many countries, Azerbaijan implements the national education concept, which defines the directions of development for the long-term sustainability and sustainability of education in this direction, and state programs that include the development of all areas of the education system. It is necessary to consider the quality of education as the main direction, and the quality of education means not only the compliance of students' knowledge with state standards, but also the successful operation of the educational institution itself, as well as the organization of each educator and administrator.

**Keywords:** Quality of education, education policy, teaching methods, education management.

**Article history**
Received: 05.05.2021
Accepted: 27.05.2021

## Giriş

Cəmiyyətin fəaliyyətinin mühüm sahələrindən və sosial həyatın vacib inkişaf istiqamətlərindən biri təhsildir. Azərbaycanda təhsil sahəsində dövlət siyasətinin əsas istiqamətlərindən birini də təhsilin uzunmüddətli zamanı əhatə edən strateji inkişafını müəyyənləşdirmək üçün vacib olan milli təhsil konsepsiyaları və dövlət proqramları təşkil edir. Əsas hədəf təhsilin keyfiyyətinin artırılması məqsədilə həm tələbələrin bilik və bacarıqlarının dövlət standartlarına uyğun olmasını, həm də təhsil müəssisələrinin uğurlu fəaliyyət göstərməsi, habelə təhsil xidmətlərində keyfiyyətin təmin olunması istiqamətində idarəedənlərin və pedaqoqların səmərəli fəaliyyətini təmin etməkdir.

## Təhsil sistemində inkişafa nail olmaq dövlətin əsas hədəflərindən biri kimi

Təhsil sistemində inkişafa nail olmaq dövlətin əsas hədəflərindən biri hesab edildiyindən bu sferada qəbul olunan normativ aktların, hüquqi-normativ sənədlərin və qərarların işlək olması keyfiyyətli idarəetmənin əsas şərti hesab edilir. Bu səbəbdən də keyfiyyətin təmin olunması üçün peşəkar idarəetməyə şərait yaratmaq, effektivliyi və davamlılığı qorumaq, idarəetmənin nəzəri və praktik məsələlərini bilmək, bu sahədə zəruri bacarıqlara yiyələnmək çox önəmlidir.

Öz fəaliyyətini dinamik mühitdə həyata keçirən təhsil müəssisələrinin davamlı olaraq təkmilləşməsi, fəaliyyətində beynəlxalq təcrübədə sınanmış metod və üsulları tətbiq etməsi keyfiyyətli idarəetmədə mühüm amildir.

Təhsilin idarə olunması dedikdə, ilk növbədə aşağıdakılar başa düşülür:

- Qərarların qəbulu, problemlərin həll olunması, kommunikasiya, informasiya və effektiv komanda qurmaq;
- Makro səviyyədə planlaşdırma, məqsəd, prinsip, yanaşma və prosesləri vasitəsilə mikro səviyyədə təşkilati planlaşdırma;
- Tədris planı və fəaliyyətinin planlaşdırılması, proqram və akademik təqvim;

**Cədvəl 1** Təhsilin idarə edilməsi




*Mənbə:* 900igr.net – Сущность, функциии и принципы управления образовательными системами – (Sushnost, funktsii i printsipı upravleniya obrazovatelnımi sistemami)

- Təhsil idarəçisinin vəzifə və öhdəliklərini təsvir edən idarəetmə nəzəriyyəsi və bacarıqlarını inkişaf etdirmək;
- Maliyyə resurslarının effektiv bölüşdürülməsi və təşkilatların büdcələrinin planlaşdırılması;
- Məlumatların saxlanılması və tələbənin qiymətləndirilməsi.

Təhsilin idarə edilməsində onun əhatə dairəsinin düzgün müəyyənləşdirilməsi mühüm əhəmiyyət kəsb edir. Bu istiqamətdə qarşıya qoyulan məqsədə nail olmaq üçün əlverişli olan hər hansı bir fəaliyyət təhsil idarəçiliyinin komponenti hesab edilir. Bu cür fəaliyyət ümumtəhsil məktəbi, kollec və universitet səviyyəsində ola bilər. Təhsilin idarə olunmasında vacib hesab edilən əsas komponentləri Cədvəl 1 formasında səciyyələndirmək olar. Göründüyü kimi, idarəetmənin vacib olan hər bir komponenti təhsilin idarə edilməsi prosesində aktiv və bir-birinin ardınca davam edir. Bütün bunların tam düzgün həyata keçirilməsinin nəticəsi olaraq təhsilin düzgün idarəedilməsi reallaşdırılır.

## Təhsildə keyfiyyətə nail olunmasında iştirak edən əsas tərəflərin hüquq və vəzifələri

Keyfiyyətin yaranması dedikdə, bunu təşkil edən tərəf kimi yalnız dövlət nəzərdə tutulmamalıdır. Keyfiyyətin təmin edilməsi elə bir anlayışdır ki, burada iştirak edən tərəflərin hamısı əsasdır. Birtərəfli yanaşma ilə nə təhsil

**Cədvəl 2** Təhsildə keyfiyyətn idarə olunmasında adekvatlılıq və səmərəliliyin rolu

**Təhsilin keyfiyyəti**

↓ ↓

**Təhsilin adekvatlığı**

- Şəxslərin və fərdlərin tələbləri;
- Dünya ictimaiyyətində meydana çıxan tendensiyalar;
- Dünya təhsil məkanında təhsil sisteminin funksionallaşması üzrə yeni parametrlər.

**Təhsil sisteminin səmərəliliyi**

- İstənilən nəticəyə nail olmaq üçün investisiya xərcləri;
- İnsan və informasiya kapitalı resurslarının formalaşdırılmasında təhsilin nəticələri.

↓ ↓

**Dövlətin təhsil siyasəti**

↓

**Ölkənin davamlı iqtisadi inkişafı, cəmiyyətin sosial və mədəni tərəqqisi**

*Mənbə:* infourok.ru – Управленые кацеством образования (Upravleniye kachestvom obrazovaniya)

sistemində, nə də digər vacib sistemlərdə nailiyyət əldə oluna bilər. Buraya dövlətin təhsil sahəsində siyasətini həyata keçirən cavabdeh orqan pedaqoqlar, tələbə və şagird kollektivi, bir sözlə təhsil prosesində iştirak edən bütün tərəflər aid olunmalıdır. Bu tərəflərin hər biri öz tutduqları mövqeyə görə qanundan irəli gələrək həm hüquqlarını, həm də vəzifələrini bilməli və buna əməl etməlidirlər. Bu mümkün olduğu halda təhsildə keyfiyyətin təmin olunmasından söhbət gedə bilər. Ümumiyyətlə, tərəflərin hüquq və vəzifələrini bu cür göstərmək olar: bu sahəyə aid olan standartların hazırlanması və tətbiqi, təhsildə bərabər imkanların əldə olunması üçün şəraitin yaradılması, mövcud qayda və qanunlara riayət olunması, müasir tələbləri nəzərə almaqla yeni təşkilati-iqtisadi modellərin yaradılması, təhsil sahəsində əməkdaşlığın qurulması və s.

## Keyfiyyət ölkənin sosial-iqtisadi inkişaf göstəricisi kimi

Müasir dövrdə keyfiyyət ölkənin sosial-iqtisadi inkişafını təmin edən əsas göstəricilərdən biri kimi qəbul olunur. Bildiyimiz kimi, daim inkişaf edən cəmiyyətin tələblərinə keyfiyyət göstəricisi olmadan cavab vermək qeyri-mümkündür. Keyfiyyətin idarə edilməsi istehsalın planlaşdırılmasından son məhsulun satışı və daha sonra xidmət də daxil olmaqla bütün mərhələləri əhatə edən sistemli prosesdir. Buraya keyfiyyətin planlaşdırılması, təminatı, nəzarəti və yaxşılaşdırılması aiddir.

Təhsildə keyfiyyət dedikdə isə, beynəlxalq səviyyədə keyfiyyət göstəricilərinin təhsil sistemində əks olunması nəzərdə tutulur. Bu akademik fəaliyyəti əhatə edən bütün funksiyaları özündə birləşdirən bir anlayışdır. Buna görə də keyfiyyətin qiymətləndirilməsi üçün təhsilalanların, müəllimlərin, müvafiq infrastrukturun, tədris prosesinin və resurslarının keyfiyyəti nəzərə alınmalıdır. Fikrimizcə, təhsil müəssisələri müasir tələblərə uyğun nəticələr əldə etmək üçün keyfiyyət səviyyəsinin modelləşdirilməsi, keyfiyyətin əldə edilməsinin təmin olunması və onun diaqnostikası kimi kompleks məqsədlər müəyyənləşdirməli və onları həyata keçirmək məqsədilə sistemli işlər görməlidir.

Təhsildə keyfiyyət nəticələrə əsaslandığına görə müvafiq göstəricilər əsas götürülməlidir.

**Cədvəl 3** Təhsildə keyfiyyətin idarə olunmasının formaları (Yakovlev, 2000)




Buraya sərbəst fikir söyləməyi və düzgün qiymətləndirməyi, obyektivliyi təmin etməyi, tənqidi və analitik düşünməyi, savadlı və dünyagörüşlü olmağı aid etmək olar. Bunlarla yanaşı, empatiya (özünü başqasının yerində hiss etmək və ya başqasının emosional halını duymaq qabiliyyəti), habelə cəmiyyətdə sosial, siyasi və iqtisadi cəhətdən iştirak etmək də vacib məsələlərdəndir. Təhsildə keyfiyyətin idarə olunmasının formalarını nəzərdən keçirərkən görürük ki, hər bir forma özlüyündə nəticə olaraq keyfiyyətli təhsilə birbaşa yönəlir: məsələn, məqsədlərin keyfiyyəti – əgər bir fəaliyyət həyata keçirilərkən məqsədlər düzgün olaraq müəyyən olunmasa, əldə olunan nəticə də düzgün dəyərləndirilə bilməz. Məqsədli olaraq təyin olunan hər bir prosesi idarə etmək, əldə olunan nəticələrin də ölçüləbilən olmasına gətirib çıxarır. Təhsildə keyfiyyətin idarə olunmasının formaları Cədvəl 3-də verilir.

Təhsilin idarə edilməsi *planlaşdırma, tətbiqetmə* və *nəzarət* olmaqla 3 əsas funksiyadan ibarətdir.

***Planlaşdırma***

Təhsilin idarə edilməsində mühüm amil olan planlaşdırma müəssisənin gələcəyinin proqramlaşdırılmasının rasional və sistematik bazası olmaqla bərabər, gələcəkdəki fəaliyyət prosesini formalaşdıraraq dəyişilməyə hazırlıq prosesidir. Bu həm də hədəflərin müəyyən olunması, onlara çatmaq üçün həyata keçiriləcək mümkün tədbirlərin qiymətləndirilməsi və qərarvermə mərhələsidir.

Planlaşdırma prosesi davamlı və pilləli fəaliyyətlərdən ibarətdir. Bu prosesdə hansı işlərin görülməsi müəyyən olunsa da, gələcəkdə baş verə biləcək maneələrin aradan qaldırılması üçün ən uyğun texnikaların seçilməsində dəqiq olaraq proqnozlaşdırma aparmaq mümkün olmur. Çünki ehtimallar və risklər həmişə mövcud olduğundan gələcək fəaliyyət tam və dəqiq olaraq proqnozlaşdırıla bilməz. Planlaşdırma uyğunlaşdırıla bilən, elastik və elmi əsaslı olmalı, təhsil prosesində hər kəs tərəfindən mənimsənməli və doğru informasiyaya əsaslanmalıdır.

***Tətbiqetmə***

Planları hər zaman reallıqlara uyğunlaşdırmaq vacibdir. Bu prosesin daxilində təşkil etmək, kommunikasiya qurmaq, işçi qüvvəsini formalaşdırmaq, idarə etmək və motivasiya vardır. Təşkil etmək – resurs toplamaq, bu resursların istifadəsinin təmin olunması və hədəflərə çatmaq üçün vəzifələri müəyyən etməkdir. Buraya hansı vəzifələrin yerinə yetiriləcəyi, onların necə qruplaşdırılacağı, vəzifələrdən kimlərin məsul olması və qərar verəcəyi daxildir. Təşkil etmək insan resurslarını bir araya gətirmək və qarşıya qoyulan hədəfə çatmaqdan ibarət olan prosesdir. Buna universitet misalında baxsaq, tələbələrin səmərəli şəkildə təhsil almasını təmin etmək üçün müəllimlərin, personalın, binaların və tədris resurslarının birləşdirilməsi lazımdır. İstiqamətləndirmək isə qarşıya qoyulan hədəfə çatmaq üçün insanlar arasında iş birliyinin təmin edilməsidir. Bu, təhsil personalının təşkilati hədəflərin

**Cədvəl 4** Ali təhsil müəssisələrində təhsilin keyfiyyətinin idarə olunması sisteminin qurulmasının əsas mərhələləri (Yakovlev, 2000)

**Təhsil xidmətləri bazarının, əmək bazarının və digər əlaqəli tərəflərin tələbatlarının analizi.
Təhsil sahəsində universitetin missiyaları, strategiyaları, siyasəti, məqsəd və vəzifələrinin formulu**

↓

**Keyfiyyəti idarəetmə sisteminin təşkilati strukturunun formalaşdırılması və personalın tədrisi**

↓

**Universitetin özünü qiymətləndirməsi (işçi proseslərin yoxlanılması)**

↓

**Vacib sənədləşmələri qaydaya salan işçi proseslərin təsviri və müəyyənləşdirilməsi**

↓

**Keyfiyyətin idarə edilməsi sisteminin sənədləşmələrinin işlənilib hazırlanması**

↓

**İşçi proseslərin xarakteristikalarının və əsas göstəricilərinin ölçülməsi sisteminin işlənilib hazırlanması**

↓

**Xəbərdaredici və korrektedici fəaliyyət sisteminin işlənilib hazırlanması**

↓

**Universitetin özünüqiymətləndirmə və daxili auditinin həyata keçirilməsi**

reallaşdırılmasına təsirli və məhsuldar fayda vermək üçün motivasiya edildiyi prosesdir.

***Nəzarət***

Bəzən təşkilatın mövcud vəziyyəti ilə hədəfi fərqli ola bilər. Bundan başqa, müəyyən dövrlərdə hədəfdən kənarlaşmalar da olur. Belə anlarda nəzarət xüsusi əhəmiyyət kəsb edir. Çünki fəaliyyət planlaşdırmaya uyğun olmadıqda keyfiyyətin təmin olunması məqsədilə müdaxilə edilməlidir. Təhsilin keyfiyyəti dedikdə, təhsil müəssisəsinin kollektiv əməyinin nəticəsi nəzərdə tutulur. Müasir dövrdə hər bir müəssisənin fəaliyyətinin keyfiyyəti həyata keçirilən təhsil xidmətlərinin təhsilalanların şəxsiyyətinin inkişafını nə dərəcədə təmin etməsindən və cəmiyyətin təhsilin qarşısında qoyduğu vəzifələrin yerinə yetirilməsindən asılıdır. Ali təhsil müəssisələrində təhsilin keyfiyyətinin idarə olunması sisteminin qurulmasının əsas mərhələləri Cədvəl 4-də verilmişdir.

## Təhsilin keyfiyyətinin idarə edilməsi üzrə D. Timmermen konsepsiyası

Təhsilin keyfiyyətinin idarə edilməsi üzrə bir çox xarici müəlliflər müxtəlif konsepsiyalar irəli sürmüşlər. Bu konsepsiyalardan biri də D.Timmermenin irəli sürdüyü modeldir (Bordovskiy, Nesterov, Trapitsyn, 2001). Onun təhsilin keyfiyyətini idarə etmək üçün təklif etdiyi sxem Cədvəl 5-də verilir.

D.Timmermenin giriş fazası, aralıq faza və çıxış fazasından ibarət olan modeli təhsildə keyfiyyətin idarə olunması üzrə əsas konsepsiyalardan biridir. Burada birinci faza – giriş fazası, məktəbdə təhsil prosesinin təşkilini

**Cədvəl 5** D.Timmermenin təhsil sahəsində keyfiyyətin idarə edilməsi sxemi (Bordovskiy, Nesterov, Trapitsyn, 2001)

| Keyfiyyət sahəsinin idarə edilməsi | | |
|---|---|---|
| **Fəaliyyət sahəsi:**<br>– Məktəbin inkişafı;<br>– Kadrların idarə olunması;<br>– Təşkiletmə və idarəetmə;<br>– Məktəb və tərəfdaşlar arasında qarşılıqlı əlaqə. | **Fəaliyyət növü:**<br>– Planlaşdırma və inkişaf;<br>– Daxili və xarici kommunikasiya;<br>– Qərarlar;<br>– Nəzarət;<br>– Göstərişlər;<br>– Məsləhətləşmə;<br>– Moderasiya. | **Səlahiyyət:**<br>– Sosial;<br>– Konkret (xüsusi);<br>– Pedaqoji;<br>– İdarəetmə;<br>– Təşkilati;<br>– Hüquqi. |

özündə ehtiva edir. Bunlara müəllim heyətinin peşəkarlıq səviyyəsini, binanın və siniflərin vəziyyətini, avadanlıq və dizaynı, tədris planlarını və tədris materiallarını aid etmək olar. Aralıq fazaya təhsil prosesinin məzmunu, təşkili, müəllimin peşə fəaliyyəti, sosial-psixoloji mühit, şəxslərarası münasibətlər, qarşılıqlı əlaqələr daxildir. Çıxış fazası isə təhsil nəticələrini əks etdirir.

## Təhsilin keyfiyyəti üzrə həyata keçirilən uğurlu layihələr

İnkişaf etmiş ölkələr təhsil də daxil olmaqla, müxtəlif sahələrdə beynəlxalq arenada aparıcı subyektlərdir. Həmin ölkələrdə təhsil sisteminin inkişafı daha az səmərəsi olan üsullardan imtina olunmasına gətirib çıxarmışdır. İllər keçdikcə daha çox qəbul edilənlər isə ictimai tələbatın təzyiqi ilə dəyişikliklərə məruz qalanlardır. Dünya təcrübəsində həyata keçirilmiş bəzi layihələrə diqqət yetirək :

Rəqəmsal yaradıcılıq məktəbi olan “Kodabra” uşaqların özlərinin kompüter oyunları, mobil proqramlar və interaktiv animasiyalar yaratması üçün tədris kurslarıdır. Sinifdə uşaqlar komandalarda işləyir, vəzifələri öz aralarında bölüşdürür, beyin fırtınası qurur, layihələr üçün fikirlər ortaya qoyur və planlarını yerinə yetirmək üçün bir-birinə kömək edirlər. Burada deviz belədir: “Oynamağı dayandır, yaratmağa başla”.

“Lifecamp” – şagirdlərin şüurlu şəkildə peşə seçməsinə imkan verən səyyar məktəb proqramıdır. Hazırda bu cür proqramlar Krasnoyarsk ərazisində, Xakasiya Respublikasında, Moskva vilayətində, eləcə də Çinin Şanxay və ABŞ-ın San-Fransisko şəhərlərində həyata keçirilir. Əsas məqsədi məktəb şagirdlərinin şüurlu formada hansı peşədə özlərini gördüklərini müəyyən etməkdir.

“Scratch Russia” – proqramlaşdırma dilinin öyrənilməsinə imkan verən təhsil proqramıdır. Bu layihə çərçivəsində xüsusi metodiki göstərişlər, dərsliklər, dəstək materialları olan onlayn platforma hazırlanır. Layihənin əsas vəzifəsi uşağın erkən yaşdan proqramlaşdırma ilə maraqlanmasını təmin etməkdir. Bu baş verdiyi təqdirdə şagirdlər müasir tələblərə uyğun olaraq artıq məktəb yaşlarında informasiya texnologiyaları sahələrinə meyillənmiş və bu sahə üzrə biliklər əldə etmiş olurlar.[1]

Dünya təcrübəsində tətbiq olunan və uğurlu nəticələri olan bir çox layihələr indi də reallaşdırılmaqdadır. Burada əsas məsələ bu sahədə həyata keçirilən layihələrdən təhsil sisteminin məzmununa uyğun olaraq, milli dəyərlər nəzərə

[1] hse.ru – Двенадцать решений для нового образования

alınmaqla ən optimal dünya təcrübəsindən faydalanmaqdır.

Azərbaycan Respublikasında həyata keçirilən islahatlar və genişmiqyaslı infrastruktur layihələri sosial-iqtisadi sferanın yenidən qurulması və davamlı inkişafı üçün şərait yaratmışdır. Ölkəmizin qarşısında duran növbəti strateji vəzifə sosial-iqtisadi həyatın daha da modernləşdirilməsi, qabaqcıl beynəlxalq təcrübəyə uyğunlaşdırılması yolu ilə davamlı iqtisadi inkişafın təmin edilməsi və əhalinin həyat səviyyəsinin yüksəldilməsindən ibarətdir (Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası, 2013). Sosial iqtisadi sferanın müasirləşdirilməsində isə təhsilin rolu böyükdür. Ona görə də təhsildə keyfiyyət Avropanın təhsil məkanında keyfiyyət təminatı üzrə standartlara uyğunlaşdırılmalıdır. Bunun üçün bir sıra mühüm əhəmiyyətli məsələlərin, o cümlədən təhsilalanların qazandığı bilik və bacarıqların vərdişə çevrilməsinin forma və metodlarının mənimsədilməsi zəruridir. Bu vəzifələrə, həmçinin aşağıdakıları aid etmək olar:

1. Təhsildə maraqlı tərəflər olan şagird, valideyn, müəllim kontingentinin, ümumən isə cəmiyyətin mənafeyinə xidmət edən yeni təhsil-tədris və idarəetmə yanaşmasının tətbiqi;

2. Təhsildə maraqlı tərəflərin qərar qəbul etməsinə müvafiq əsaslar çərçivəsində təsir etməklə pedaqoji mühitdə demokratiya düşüncəsinin və mədəniyyətinin inkişafı;

3. Dini və irqi ayrı-seçkiliyə yol verməməklə, gender bərabərliyi gözlənilməklə, təhsil sisteminin əsas prinsiplərindən biri olan bərabərlik prinsipinin şərtlərinə əməl etməklə hər kəsin bilik və bacarıqlarının inkişafı;

4. Təhsildə insani dəyərlərin öncül mövqeyinə əsaslanaraq, yüksək intellektli insanların yetişdirilməsi;

5. Təhsilin idarə edilməsində davamlı inkişafın təmin edilməsi;

6. Təhsilə ayrılmış qaynaqlardan səmərəli istifadə olunması;

7. Çağdaş mədəniyyətin daşıyıcısı olan fərdlərin yetişdirilməsi;

8. Təhsilalanların yaxşı insan, layiqli vətəndaş, peşəkar mütəxəssis olmasına kömək edilməsi;

9. Cəmiyyətin düşüncə və əxlaqının formalaşmasına dəstək verilməsi;

10. İnsanların öyrənməsinə və özlərini reallaşdırmasına mane olan bütün əngəllərin aradan qaldırılması;

11. Əmək bazarında tələb olunan işçi qüvvəsinin formalaşmasına dəstək verilməsi;

12. Təhsildə universal prinsiplərə riayət edilməsi.[2]

Bu vəzifələrin müvəffəqiyyətli həlli səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət göstəricilərinə görə aparıcı mövqe tutan, iqtisadi cəhətdən dayanıqlı təhsil sisteminin yetirməsi olan rəqabət qabiliyyətli kadrladan asılıdır. Ona görə də, respublikamızın inkişaf konsepsiyasına əsaslanaraq, fərdlərə müxtəlif tipli biliklərin və bacarıqların aşılanması məqsədi ilə təhsil sisteminin institusional əsasları, infrastrukturu və insan resursları inkişaf etdirilməlidir. Təhsilin inkişaf etdirilməsi ölkədə əhalinin rifahının yaxşılaşdırılması və fərdin həyat tərzinin daha yüksək səviyyədə qurulması üçün zəmin yaradır. Təhsil insanlara texnologiyaları daha tez mənimsəmək, əmək bazarında özünəməxsus yer tutmaq, ömür boyu təhsil prosesinə qoşulmaq və ətraf mühitə münasibətdə düzgün mövqe seçmək imkanı verir.

Təhsilin idarə edilməsi dinamik bir sistem olmaqla, lazımi idarəetmə qərarları qəbul etmək üçün inkişaf perspektivləri haqqında proqnozlaşdırıcı məlumatlar tələb edir. Bu prosesdə keyfiyyət üzrə proqnozlaşdırılan qiymətləndirmələr insan (intellektual) kapitalı və ümumilikdə iqtisadiyyatın fəaliyyətindən asılıdır. Təhsil sisteminin idarə edilməsi üçün proqnozlaşdırma qısa, orta və uzun müddətli perspektivdə qazanılmış biliyin ən yaxşı şəkildə istifadəsi məqsədilə müvafiq metod və yanaşmanın seçilməsini özündə birləşdirir.

İnkişaf etmiş ölkələrdə təhsil sisteminin inkişafının proqnozlaşdırılması çox vacib amillərdən hesab olunur. Bu istiqamətdəki tədqiqat və inkişaf xərcləri təhsil sahəsinə ayrılan illik

[2] muhaz.org – Eğitimde kalite ödülü

xərclərin təxminən 2% -ni təşkil edir. Tədqiqat və inkişafdan əldə olunan fayda, onların həyata keçirilməsi ilə bağlı xərclərdən 50 dəfə artıqdır. Ona görə də, xüsusilə iqtisadi böhran şəraitində təhsil sisteminin inkişafını proqnozlaşdırmağa xüsusi önəm verilməlidir.

Proqnoz gələcək nəticələrin, təhsil sisteminin inkişaf yollarının, habelə onun həyata keçirilməsi üçün zəruri olan resursların və təşkilati tədbirlərin ehtimal olunan qiymətləndirilməsidir. Təhsil sisteminin inkişafı üçün proqnozların hazırlanması prosesində aşağıdakı metodik prinsiplərə riayət etmək lazımdır:

- proqnozlaşdırma obyektini (yəni təhsil) və proqnoz fonunu təhsilin keyfiyyətinə təsir edə bilən amillərin qarşılıqlı əlaqələr sistemi kimi hesab etməyi tələb edən sistemlilik;
- minimal xərclə dəqiq və etibarlı proqnozların hazırlanmasını təmin edən optimallıq;
- proqnozlaşdırma obyektinin inkişafı üzrə alınmış informasiya mənbələrindən istifadə etməyi özündə birləşdirən analogiyalılıq;
- proqnozlaşdırma obyektinin hərtərəfli təsvirini təmin edən komplekslilik;
- yalnız təhlil edilmiş obyektə xas olan fərqlilik, göstərici və xarakterik xüsusiyyətlərin hesablanmasını tələb edən spesifiklik.

Proqnozlaşdırma təhsil sisteminin dövlət tənzimlənməsinin, perspektivli strateji planların, milli proqramların və layihələrin inkişaf etdirilməsinin vacib elementidir. Nəticələrin proqnoz qiymətləndirmələrini nəzərə almadan strateji qərarlar qəbul etmək sosial-iqtisadi sferada və cəmiyyətin həyatında böhranı dərinləşdirir. Ona görə də belə qərarları qəbul edən peşəkar kadrların hazırlandığı təhsil sisteminin dövlət tənzimlənməsi proqnozlaşdırma, strateji və indikativ planlaşdırma, proqramlaşdırma, elmi, maliyyə, maddi-texniki və kadr təminatının bir-birinə uyğunlaşdırılmasına əsaslanmalıdır. Çünki proqnozlaşdırma (uzunmüddətli, orta müddətli və qısamüddətli) xarici və daxili amillərin təsiri altında təhsil sisteminin inkişafında mümkün tendensiyaları müəyyənləşdirir, proqnoz dövründə optimal inkişaf yolunu seçə bilmək üçün onun dinamikasının trayektoriyalarını, bu trayektoriyalara təsir yollarını və nəticələrini qiymətləndirir.

## Təhsilin keyfiyyətinin idarə edilməsinin struktur elementləri

Struktur elementlər dedikdə, əsas olaraq təhsilin idarə edilməsinin məqsədləri və onun inkişafa uyğunluğunun təhlil olunması, təhsil sistemində sistemli əks-əlaqənin təminatı, ehtiyac yaranarsa, təhsil prosesinin requlyasiyası və ya korreksiyasının reallaşdırılması nəzərdə tutulur. Bütün bu struktur elementlər nəticə olaraq təhsildə keyfiyyətin təmin olunmasına gətirib çıxarır. Bu struktur elementlərindən birində tamamlama axıradək reallaşdırılmasa, ona yenidən nəzər salmaq, üzərində işləyib son nəticəyə əsaslı təsir göstərə biləcək səviyyəyə çatdırmaq mümkündür. Təhsilin keyfiyyətinin struktur elementləri Cədvəl 6-da verilir.

Məqalədə qeyd edilən təhlillər onu göstərir ki, təhsil sistemində həyata keçirilən hər bir layihənin nəticəsinin uğurlu olması onun keyfiyyət səviyyəsindən asılıdır. Təhsil cəmiyyətin əsasıdır və bu həmişə diqqətdə saxlanılmalı, dünya təcrübəsinə uyğun keyfiyyət təmin olunmalıdır.

Təhsilin modernləşdirilməsinin məqsədi təhsil sisteminin davamlı inkişaf mexanizminin qurulmasından ibarət olduğuna görə qoyulmuş hədəfə çatmaq üçün, ilk növbədə qarşılıqlı münasibətlərin yeni müasir formaları əsasında aşağıdakı problemlər həll olunmalıdır:

- təhsil almaq üçün konstitusiyada nəzərdə tutulan dövlət təminatlarının tam formada ödənilməsi və bərabər imkanların yaradılması;
- təhsilin bütün pillələrində və diplomdan sonrakı təhsildə keyfiyyətin müasir tələblərə uyğun səviyyəyə çatdırılması;
- təhsil sisteminə büdcədənkənar vəsaitlərin mümkün olduğu qədər çox miqdarda cəlb edilməsi və ondan səmərəli istifadəyə dair yeni hüquqi və iqtisadi mexanizmlərin formalaşdırılması;
- təhsil işçilərinin sosial statusunun yüksəldilməsi və professionallığının artırılması;
- təhsilin idarə olunmasının dövlət-ictimai sistem formasında inkişafı, təhsilin əsas subyektlərinin və təhsil prosesinin bütün

**Cədvəl 6** Təhsilin keyfiyyətinin idarə edilməsinin struktur elementləri




*Mənbə:* infourok.ru –Управление кацеством образования (Upravleniye kachestvom obrazovaniya)

iştirakçılarının (təhsilalanlar, pedaqoqlar, valideynlər, təhsil müəssisələri) bu sahədə rolunun gücləndirilməsi.[3]

## Nəticə

Təhsil sahəsində əsas yeri keyfiyyət siyasəti tutur. Keyfiyyət siyasəti, bütövlükdə isə təhsil sahəsində dövlət siyasəti Azərbaycan Respublikasının Konstitusiyası və təhsil sahəsində müvafiq qanunvericiliklə müəyyən olunur. Bu qanunvericiliyə "Təhsil haqqında" Qanunu, "Azərbaycan 2020: Gələcəyə baxış" inkişaf konsepsiyası, Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi və digərləri daxildir.

Azərbaycanın təhsil sferasında keyfiyyətin artırılması üçün aşağıdakı istiqamətləri qeyd etmək olar:

1. Təhsil sahəsinə ayrılan maliyyə vəsaitinin həcminin artırılması;

2. Keyfiyyətin idarə edilməsinin təkmilləşdirilməsi, beynəlxalq təcrübəyə uyğun yeni idarəetmə və nəzarət mexanizmlərinin tətbiq olunması;

3. Ali təhsil müəssisələrində təhsilin idarə edilməsi və keyfiyyətin təmin edilməsi ilə bağlı xüsusən son dövrlərdə yazılmış kitabların, elmi nəşrlərin, jurnal və qəzetlərin olduğu xüsusi otaqların və ya bölmələrin yaradılması, bu istiqamət üzrə daim yardımçı ola biləcək mentorların təyin olunması;

4. Hazırda aktual olan ixtisaslar üzrə kadr potensialının hazırlanması məqsədi ilə müxtəlif şirkətlər, qurumlar, eləcə də tibb müəssisələrindən nümayəndələrin məktəblərə dəvət olunmasının, onların şagirdlərin bilik və bacarıqlarına uyğun sahələrə marağının artırılması üçün öz təcrübələri əsasında motivasiya yaratmasının təmin edilməsi.

5. Ölkəmizin təhsil sisteminin inkişaf etmiş ölkələrin təhsil sistemi ilə rəqabətə davamlılığını daha da artırmaq üçün dövlətin təhsil siyasəti cəmiyyət tərəfindən dəstəklənməli, keyfiyyət göstəricilərinin artırılması məqsədilə lazımi resursların ayrılması və onlardan effektiv istifadə olunması mexanizmin yaradılması, bu sahənin hərtərəfli modernləşdirilməsi təmin edilməlidir. Bu çox vacibdir, çünki dövlətin təhsil siyasətinin əsas prinsiplərinin, cəmiyyətin inkişaf tendensiyaları ilə əlaqəli olan problemlərin və sosial-iqtisadi siyasətin əsas istiqamətlərinin də daxil olduğu strateji yol təhsilin modernləşdirilməsi və təkmilləşdirilməsindən keçir.

[3] ebooks.az – Təhsilin idarə olunmasının əsasları

***Qeyd:*** *Məqalə Təhsil İnstitutunun dəstəyi, Təhsil İdarəçiləri Assosiasiyası və T-Network təhsil işçilərinin təcrübə və kommunikasiya platformasının təşkilatçılığı ilə 22-25 aprel 2021-ci ildə keçirilən Təhsil İdarəçiliyi Beynəlxalq Konfransında təqdim edilib.*

### İstifadə edilmiş ədəbiyyat


1 “Azərbaycan 2020: Gələcəyə baxış” İnkişaf konsepsiyası. (2012). Bakı.
2 900igr.net - Suşnost, funktsii i printsipı upravleniya obrazovatelnımi sistemami.
3 Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. (2013). 24 oktyabr. https://president.az/articles/9779
4 Azərbaycan Respublikasının Konstitusiyası.
5 Quliyeva, S. (2019). “Keyfiyyətin idarə olunması prinsipi və onun əsas istiqamətləri”.
6 Mehdiyev, M.İ. (2007). “Keyfiyyətin idarə edilməsi”. Bakı: Çaşıoğlu.
7 Məmmədzadə, R. (2010). “Təhsildə keyfiyyət aparıcı istiqamətlərdən biri kimi”. Bakı: Müəllim.
8 Mərdanov, M. (2003). “Təhsil sistemində monitorinq və qiymətləndirmə”. Bakı: Çaşıoğlu.
9 Bordovskiy, Q.L., Nesterov, A.A., Trapitsyn, S.Y. (2001). Upravleniye kachestvom obrazovatelnogo prochessa. SPb.: İzd-vo RQPU im. A.İ.Qerchena. 359 s.
10 Burchfield, S. (1991). “Planning and implementing educational management”.
11 Gümüşeli, A.İ. (2014). “Eğitim ve öğretim yönetimi”. Ankara: Pegem Akademi Yayıncılık.
12 infourok.ru – Upravleniye kachestvom obrazovaniya
13 Johnson, F.C., Golomskilis, W.A.J. (1999). “Quality concepts in education”.
14 scow-baku.ru - Osobennosti azerbaydzhanskoy sistemı obrazovaniya.
15 studwood.ru - Teoreticheskiye aspektı upravleniya kachestvom obrazovaniya.
16 TS-EN ISO 9004 “Kalite yönetim sistemi – Temel kavramlar”.
17 Turan, S. (2014). “Eğitim yönetimi: teori, araşdırma ve uygulama”. Ankara: Pegem Akademi Yayıncılık.
18 Yakovlev, E.V. (2000). Upravleniye kachestvom obrazovaniya. nsportal.ru

# COVID-19 PANDEMİYASI DÖVRÜNDƏ AZƏRBAYCANIN TƏHSİL MÜƏSSİSƏLƏRİNDƏ QARIŞIQ ÖYRƏNMƏ ÜSULUNUN TƏTBİQİ

**AYDIN ƏLİYEV,** Pedaqogika üzrə fəlsəfə doktoru, Azərbaycan Dövlət İqtisad Universiteti. e-mail: aydinaliyew@gmail.com
https://orcid.org/0000-0002-4914-3788

**DÜNYA ƏHMƏDOVA,** Azərbaycan Dillər Universiteti.
e-mail: dunya.ahmadova2000@gmail.com
https://orcid.org/0000-0002-4740-4040

**NƏZRİN BABAYEVA,** Azərbaycan Dillər Universiteti.
e-mail: nezrin.babayeva02@gmail.com
https://orcid.org/0000-0003-3028-4879

**Məqaləyə istinad:** Əliyev A., Əhmədova D., Babayeva N. (2021). Covid-19 pandemiyası dövründə Azərbaycanın təhsil müəssisələrində qarışıq öyrənmə üsulunun tətbiqi. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 43–50

**ANNOTASİYA**

Tədris texnologiyalarının geniş vüsət aldığı indiki dövrdə ənənəvi tədris metodları öz xüsusiyyətlərini dəyişmiş, COVID-19 pandemiyası təhsil müəssisələrində dərslərin onlayn şəkildə təşkil olunmasını qlobal miqyasda zəruri etmişdir. Məqalənin yazılmasında məqsəd həm müəllimlərin distant öyrənməyə olan münasibətini dəyərləndirmək, həm də Azərbaycandakı təhsil müəssisələrində qarışıq öyrənmənin zəruri olub-olmadığını müəyyən etməkdir. Məqalə nəşrə hazırlanarkən məlumatların toplanmasında kəmiyyət metodu tətbiq edilmişdir. Google anket formalarında hazırlanmış suallar, əsasən, çoxsaylı seçim və qeyd xanaları növlərindədir. Sosial media mesajlaşma platformaları (əsasən, WhatsApp və Telegram) vasitəsilə sorğunun bağlantısı Abşeron yarımadasındakı (Bakı, Xırdalan və Sumqayıt) beş fərqli özəl təhsil müəssisəsinin müəllimlərinə təqdim edilmişdir. Toplanan məlumatlar cədvəl şəklində əyani olaraq təsvir edilmiş və ətraflı müzakirə olunmuşdur. Bu tədqiqatda 147 müəllim iştirak etmiş və aydın olmuşdur ki, texnologiyanın olduqca inkişaf etdiyi bir dövrdə rəqəmsal məntiqə əsaslanan şagirdlərə (tələbələrə) dərs demək çətindir. Tədqiqatda həm də qarışıq öyrənmə məsələlərinə toxunulur, tədqiq olunan mövzular təhlil edilir və bu cür öyrənmənin müasir təhsil sistemindəki əhəmiyyətindən bəhs olunur. Bu nəticəyə gəlinir ki, müəllimlər onlayn şəkildə təhsilin tərəfdarı deyil, buna görə də qarışıq öyrənmə tədris prosesindəki tarazlığın qorunması üçün daha faydalıdır.

**Açar sözlər:** Qarışıq öyrənmə, onlayn öyrənmə, ənənəvi öyrənmə, İKT, təhsil.

**Məqalə tarixçəsi**
Göndərilib: 07.05.2021
Qəbul edilib: 30.06.2021

# IMPLEMENTATION OF BLENDED LEARNING AS A RECOVERY METHOD IN EDUCATIONAL CENTERS IN AZERBAIJAN DURING THE COVID-19 OUTBREAK

**AYDIN ALIYEV,** PhD in Education, Azerbaijan State Economic University.
e-mail: aydinaliyew@gmail.com
https://orcid.org/0000-0002-4914-3788

**DUNYA AHMADOVA,** Azerbaijan University of Languages.
e-mail: dunya.ahmadova2000@gmail.com
https://orcid.org/0000-0002-4740-4040

**NAZRIN BABAYEVA,** Azerbaijan University of Languages.
e-mail: nezrin.babayeva02@gmail.com
https://orcid.org/0000-0003-3028-4879

**To cite this article:** Aliyev A., Ahmadova D., Babayeva N. (2021). Implementation of Blended Learning as a Recovery Method in Educational Centers in Azerbaijan during the COVID-19 Outbreak. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 43–50

**ABSTRACT**

Technology-embedded context became quite prevalent in contemporary classes. Traditional teaching methods changed their nature and moved to a new stage through integrating modern technologies. Particularly in the COVID-19 period, the situation has forced educational institutions to go online on a global scale. The goal of this paper is to measure teachers' attitudes towards remote learning in Azerbaijan. The study also aims to analyze the necessity of the Blended Learning approach during the pandemic period. A quantitative method was applied in data collection. The questionnaire was prepared in Google forms, with multiple-choice and checkboxes types of questions. The link to the survey was introduced to the teachers of five different private educational centers in the Absheron peninsula (Baku, Khirdalan, and Sumgayit) via social media messaging platforms (mainly WhatsApp and Telegram). Data collected was illustrated visually in the form of a table and was discussed in detail. The questionnaire that was conducted on 147 teachers reveals that advancement and improvement of digital innovations could be face-threatening and arduous for instructors whose current and future students are more and more digital natives (were born in the Information and Communication Technology world). The presented study addresses the concept of blended learning and analyzes the literature on the issue under a study. Furthermore, the article highlights the necessity of blended learning in the process of transition to online education. The research concludes that teacher-subjects do not advocate e-learning, so blended learning would be beneficial to keep the balance between online and in-class education.

**Keywords:** Blended Learning, e-learning, face to face learning, ICT, education.

**Article history**
Received: 07.05.2021
Accepted: 30.06.2021

## INTRODUCTION

Blended learning appeared with the popularity of web-based instruction. Along with the introduction and spread of internet-based instruction, many threats, dangers, and barriers have also occurred. With Internet-based education, learners can be anxious about losing control of the learning process and may feel forgotten in the complexity of ICT. For example, learners may not know how to study and what to study, or they may not understand definitions and clarifications about their subject in an online written way. Sharma & Barrett (2007) stated that rapid technological changes might be challenging for teachers whose current and future students are digital natives. Also, some teachers in the digital era who are often regarded as digital immigrants may need to adapt themselves to fast improving and changing digital innovations (Wang, 2013). For many teachers, it may be difficult to control the teaching process, like explaining something, giving feedback, and so on. As a completion and balanced education, many scholars agreed on blended learning. Therefore, the blended learning approach -the integration of face-to-face and online learning – has been seen as a hopeful opportunity for traditional teaching and learning (So & Bonk, 2010; Garrison & Kanuka, 2004; Shea, 2007; Mahaye, 2020).

## LITERATURE REVIEW

Simply, “blended learning is the thoughtful integration of classroom face-to-face learning experiences with online learning experiences” (Garrison & Kanuka, 2004, p. 96). In addition, BL is interpreted as pedagogically organized courses that combine online lessons with traditional face-to-face classroom practices. Also, Colis & Moonen (2001) comment blended learning as a hybrid of the internet and traditional face-to-face education since instruction takes place both online and in the classroom, where the web component becomes a natural production of in-person instruction.

Shea (2007) states that blended learning often combats the access problem. Due to the fact that some parts of blended learning take place online, with less demand for physical classroom space, institutions can care for more learners with the same opportunity.

In their study about the flexibility of the BL materials, Collopy & Arnold (2009) concluded that flexibility of the use of the sources is another significant plus of blended learning. The authors also emphasize the appropriateness of sharing various teaching materials in BL. Additionally, individual teachers could also match and mix face-to-face and online materials within courses just as they continue both online and in-class discussions. All these opportunities contributed to improved flexible learning and teaching environment.

In his recent article, Mahaye (2020, p. 19) states that “Blended learning would enable learners have access to online learning materials as well as being able to interact with each other and teachers or instructor. This can be a useful system for curriculum support and recovery during and after COVID-19 era”.

In accordance with North American Council for Online Learning (NACOL) (2013; as is cited in (Camahalan & Ruley, 2014)), it is very likely that blended learning will be the predominant model of the future and will become much more familiar than just online or face-to-face learning alone.

On the other hand, some researchers are not in favor of blended learning. For instance, Mswazi et al. (2014) argue that blended learning accepts the term “blending” from teachers’ viewpoint and does not incorporate the perspective of the student. Also, they point out that blended learning requires systematic and logical instructional techniques in order to make the educational process meaningful, which is hard and will take careful planning to achieve. Besides it, only a few learners could absorb and deal with all the units of blended learning. So, there is no need to make such an effort. Some other disadvantages may include computer and internet accessibility, limited knowledge in the

use of technology, lack of computer labs on the university campus, and so forth.

## METHODOLOGY

### Research Question

This study has tried to investigate the following questions:

1. Are teachers satisfied with compulsory e-learning?

2. Is there a need to implement blended learning?

### Design of the study

The study was set out to figure out whether teachers in Azerbaijan support online learning and if it is necessary to apply blended learning. Quantitative research was applied in this research. The questionnaire was prepared in Google forms in the Azerbaijani language so that all teachers can understand it, and then it was translated into English. The link to the survey (https://docs.google.com/forms/d/e/1FAIpQLSffcqJckac6qPzkjUSzOnUGRWLtbll0Wa_D0ACQn8hamD9paw/viewform?usp=sf_link) was introduced to 5 different private educational centers (TESL, Ulduz, Zafar, Ideal, Hedef ) in Baku, Khirdalan, and Sumgayit, and teachers voluntarily asked to respond to the survey. The reason to choose these education centers is that conducting a study was more accessible because the researchers were employed in those schools on an hourly basis. After volunteer participants answered the questionnaire, responses were analyzed and described.

### Participants

49 (33.3%) male and 98 (66.7 %) female teachers who teach different subjects (English, math, history, biology, and so on) participated in this study. Of 46.9% of participants are aged between 22 and 30, and about 39 % are aged between 30 and 40. The rest of the teachers are aged between 40 and 60. It should also be noted that according to the survey the age of the majority of students is ranged between 15 and 18. The link to the survey was sent to the teachers through social messaging platforms (mainly WhatsApp and Telegram) and voluntarily asked to complete the survey.

### Data Collection

In the research, question types were multiple-choice and checkboxes, ranging from strongly disagree to strongly agree. Eleven questions were prepared in total about online education. Data collected was illustrated visually in the form of a table. In the following section, results were analyzed and interpreted by the researcher for the benefit of fellow researchers and educators.

## FINDINGS and DISCUSSION

The first question aimed to reveal teachers' general attitudes towards online education. The majority of the participants (75 teachers) agreed with the importance of online education, which makes exactly 51%. 35 teachers (23.8%) in this case do not have a certain opinion. About one-fourth of the participants (25.2%) disagree (25 teachers) or strongly disagree (12) that online education is vital.

The purpose of the second question was to identify the prospects of online education among the teachers. The majority of the participants expect the continuation of e-learning in the future, with 44 teachers agreeing (29.9%) and 31 teachers strongly agreeing (21.1%). 23 teachers (15.6%) in this case take a neutral stance. 21.8% of participants disagree (32 teachers) and 11.6% strongly disagree (17 teachers) that e-learning is a forthcoming trend.

Teachers many times complain about the learning process in online education. As is illustrated by the table 1, 40 teachers (27.2%) agreed that it is difficult to deliver lessons productively and 52 teachers (35.4%) strongly agreed with it. 19.7% of participants (29 teachers) took a neutral position about this issue. The proportion of those who disagreed that it is not challenging to lead the students online was 8.2% (12 teachers). 14 participants (9.5%) strongly disagreed with this viewpoint.

**Table 1** Survey questions and results

| | Strongly Disagree | Disagree | Neutral | Agree | Strongly Agree | Total |
|---|---|---|---|---|---|---|
| 1. E-learning is inevitable in today's education | 8,2% | 17% | 23,8% | 38,1% | 12,9% | 147 |
| 2. E-learning will be implemented more in the future | 11,6% | 21,8% | 15,6% | 29,9% | 21,1% | 147 |
| 3. It has been difficult for me (teachers) to get adapted new system (in the COVID-19 period) – transformation onto an online platform | 9,5% | 8,2% | 19,7% | 27,2% | 35,4% | 147 |
| 4. The sudden change to online education was more challenging | 5.2% | 10.3% | 5.2% | 43.1% | 36.2% | 147 |
| 5. Having in-class lessons from time to time helped both us and the students | 6.9% | 1.7 | 3.4% | 36.2% | 51.7% | 147 |
| 6. The traditional teaching process (e.g., checking homework, giving feedback) is easier than online platforms | 12,9% | 22,4% | 13,6% | 32,7% | 18,4% | 147 |
| 7. Teaching online also has several advantages | 12,9% | 12,9% | 12,2% | 51% | 10,9% | 147 |
| 8. Teaching online is as effective as the traditional method | 25,2% | 50,3% | 11,6% | 11,6% | 1,4% | 147 |
| 9. It has been difficult for learners to adopt the new system | 3,4% | 7,5% | 13,6% | 52,4% | 23,1% | 147 |
| 10. Students tend to be better at using technology than teachers | 2,7% | 16,3% | 16,3% | 48,3% | 16,3% | 147 |
| 11. Students are more responsible in online teaching than traditional | 27.9% | 52,4% | 4,1% | 10,9% | 4.8% | 147 |

In the question about the sudden change to online education, only 5,2 % (7 participants) stayed neutral. The overwhelming majority of the respondents (79.3%) believe in general that the abrupt transition to online teaching was more challenging, where 36.2% of them strongly agreed.

The teachers were also asked if continuing lessons in-class occasionally were helpful both for them and students. A hefty 87.9% of

teacher-subjects agreed in general that (51.7% strongly agreed) it was helpful. An insignificant 5% said that it was not beneficial.

It is debatable to claim either of the educational systems (online and in-person) to be easier. The share of the participants who agreed that it is simpler to make assignments, to check homework, to give feedback, etc. in the classroom environment was 32.7% (with 48 teachers). 18.4% (with 27 teachers) strongly agreed with this standpoint. 13.6% of teachers (20) did not have a clear opinion about this statement. The proportion of those who agreed that it is easier to teach efficiently online was 22.4% (33). 19 participants (12.9%) strongly agreed with this viewpoint.

During the survey, the participants were also asked whether online education has superior aspects. As the illustration depicts, almost half of the participants (75 teachers) agreed with the high productivity of online teaching, and 16 teachers (10.9%) strongly agreed with this statement. Conversely, 19 teachers (12.9%) disagreed with the perspective, and the same number of teachers (19) strongly disagreed. Of the 18 participants (12.2%) preferred not to state their opinion and stayed neutral.

Differing from the results of the previous questions, most of the teachers have hesitated to state that online education might be more efficient compared to offline education. In more detail, 74 teachers (50.3%) disagreed on the same efficiency levels of both systems, and 37 teachers (25.2%) strongly disagreed. 11.6% of teachers (17) did not have a clear opinion about this statement. Interestingly, 13% of the participants agreed (17) or strongly agreed (2).

As is illustrated by the table, 77 teachers (52.4%) agreed that it was difficult for the learners to adjust to online lessons and 34 teachers (23.1%) strongly agreed with it. 13.6% of participants (20 teachers) took a neutral position about this issue. The proportion of those who disagreed that it is not challenging to lead the students online was 7.5% (11 teachers). 5 participants (3.4%) strongly disagreed with this viewpoint.

The participants were asked whether students tend to be better at using technology than teachers. The majority of the participants said that learners are better at technology skills, with 71 teachers agreeing (48.3%) and 24 teachers strongly agreeing (16.3%). 24 teachers (16.3%) in this case take a neutral stance. 16.3% of participants disagree (24 teachers), and 2.7% strongly disagree (4 teachers) on the viewpoint.

As the table depicts, over half (52.4%) of the participants (75 teachers) disagreed on the learners' high responsibility for online lessons, and 41 teachers (27.9%) strongly disagreed with this statement. Conversely, 16 teachers (10.9%) agreed with the perspective, and 7 teachers (4.8%) strongly agreed. Of the 6 participants (4.1%) preferred not to state their opinion and stayed neutral.

## Discussion

Natela, et al., (2020) conducted a study to measure teachers' attitudes and readiness towards online education in the COVID-19 period in many countries, including Azerbaijan. The responses implied that the introduction of compulsory distance learning turned out to be stressful for many teachers. Findings with respect to the teachers' attitude towards online education in the current study are in line with Natela's study. Although the previous study was conducted a year before the current research, beliefs towards e-learning have not changed much among the teachers.

In Mahaye's (2020) research, he reviewed the applicability of Blended learning in academic recovery in the COVID-19 period. He stated that the education system could be affected negatively by several factors such as natural disasters, pandemics, wars, and so on. Thus, Blended Learning can be applied to recover the loss in curriculum due to the COVID-19 pandemic. Apart from this, Mahaye emphasizes that the Blended Learning approach should be implemented as a vehicle from a traditional classroom to a digital classroom. In this

regard, the presented study also offers Blended learning as a recovery tool in Azerbaijani educational institutions. Questions in the survey, especially those are about abrupt change (79.3% agreed) and having lessons in person from time to time, allow us to hypothesize that blended learning is necessary for Azerbaijan.

### Limitations of the Study

The main limitation of this study is that it was only conducted in the capital city and nearby cities. Results of the survey might not have been the same in regions of Azerbaijan. Thus, the general conclusion might not be generalized throughout Azerbaijan. Therefore, future studies will be directed at learners and surveys will be carried out in the other cities, and towns to draw more reliable conclusions about the implementation of Blended learning in Azerbaijan.

## CONCLUSION and RECOMMENDATIONS

As indicated earlier, this investigation was guided by the following research questions:

- Are teachers satisfied with compulsory e-learning?
- Is there a need to implement blended learning?

The research reached the following conclusions and recommendations about teachers' attitudes towards online education and implementing blended learning in educational institutions in Azerbaijan.

Regardless of the fact that the majority of the teachers acknowledge that e-learning is inevitable in the modern education system and expect that it will be implemented more in the future, they find it challenging to get adopted this system. Teacher-subjects also held that the abrupt transition to online learning was more challenging; nevertheless, they also maintained that having some lessons in-class somehow handled the situation. On top of that, even though teachers agree that online education has advantages, they are still of the opinion that traditional educational processes are more effective and efficient. Nonetheless, the vast majority of the teachers held that students had difficulty adjusting to online education. In view of all that has been mentioned so far, it could be concluded that teacher-subjects were dissatisfied with e-learning and prefer traditional teaching. Additionally, considering the respondents' perceptions regarding the sudden shift to online teaching and having in-class lessons from time to time, it could be suggested and hypothesized that blended learning would be helpful to keep the balance between online and in-person.

---

*The article was presented at the International Conference on Education Management held on April 22-25, 2021, with the support of the Institute of Education of the Republic of Azerbaijan, organized by the Association of Educators and the T-Network educators' experience and communication platform.*

---

### References

1 Camahalan, F. M., & Ruley, A. G. (2014). Blended learning and teaching writing:A teacher action research project. *Journal of Instructional Pedagogies,* 15(1), 1-13.

2 Colis, B., & Moonen, J. (2001). *Flexible learning in a digital world: Experiences and expectations.* London: Kogan-Page.

3 Collopy, R., & Arnold, J. (2009). To blend or not to blend: online and blended learning environments in undergraduate teacher education. *Issues in Teacher Education,* 18(2), 85-101.

4 Garrison, R. D., & Kanuka, H. (2004). Blended learning: Uncovering its transformative potential in higher education. *The Internet and higher education,* 7(2), 95–105.

5 Mahaye, N. E. (2020). The impact of COVID-19 pandemic on education: navigating forward the pedagogy of blended learning. *Research online.*

6 Mswazi, T., Charity, N.-N., & Tiana, M. (2014). Implementing Blended Learning at a Developing University: Obstacles in the way. *Electronic Journal of e-Learning,* 12(1), 101-110.

[7] Natela Doghonadze, H. H. (2020). The Degree of Readiness to Total Distance Learning in the Face of COVID-19 - Teachers' View (Case of Azerbaijan, Georgia, Iraq, Nigeria, UK and Ukraine). *Journal of Education in Black Sea Region,* 5(2), 1-34.

[8] Sharma, P., & Barrett, B. (2007). *Blended Learning: Using Technology in and Beyond the Language Classroom.* Oxford: Macmillan.

[9] Shea, P. (2007). Towards a conceptual framework for learning in blended environments. A. G. Dziuban içinde, *Blended learning: Research perspectives* (s. 19–36). Needham, MA: Sloan Consortium.

[10] So, H.-J., & Bonk, C. J. (2010). Examining the Roles of Blended Learning Approaches in Computer-Supported Collaborative Learning (CSCL) Environments: A Delphi Study. *Educational Technology & Society,* 13(3), 189–200.

[11] Wang, Q.(., Myers, M.D. & Sundaram, D. Digital Natives and Digital Immigrants. *Bus Inf Syst Eng* 5, 409–419 (2013). https://doi.org/10.1007/s12599-013-0296-y

# ONLAYN TƏHSİLDƏ KEYFİYYƏTİN TƏMİN EDİLMƏSİ

**AYTAC YUSİFOVA**
Azərbaycan Dövlət İqtisad Universitetinin müəllimi.
e-mail: a.yusifova1993@gmail.com
https://orcid.org/0000-0002-9301-5003

**Məqaləyə istinad:**
Yusifova A. (2021). Onlayn təhsildə keyfiyyətin təmin edilməsi. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 51–58

**ANNOTASİYA**

Müasir dövrdə keyfiyyətli təhsil ənənəvi təlim metodları ilə onlayn təlim vasitələrinin optimal (uğurlu) vəhdəti hesabına mümkündür. Məqalədə pandemiya ilə əlaqədar təhsilin, demək olar ki, bütün mərhələlərinin onlayn sistemə keçirilməsində həm təhsilalanlar, həm də təhsilverənlər üçün yaranmış çətinliklərdən və onların həlli yollarından bəhs edilmişdir. Məqalənin əsas məqsədi onlayn təhsilə marağın artırılması, keyfiyyətin təmin edilməsi və yeni metodologiyalardan istifadənin genişləndirilməsidir. Təhsilin onlayn rejimdə olması, təbii ki, ənənəvi tədris prosesinin və qiymətləndirmə metodlarının öz təsirini itirməsinə gətirib çıxarmışdır. Məqalədə qeyd olunur ki, onlayn təhsildə tələbələrin mühazirə tipli dərslərə marağının çox aşağı olması ilə bərabər, bu forma təhsilalanları əzbərləməyə və qiymət almaq xatirinə oxumağa təhrik edir. Hazırkı dövrdə elektron tədris texnologiyalarını tətbiq etməyi bacarmayan, onlayn təhsilin təşkilinin əsaslarını mənimsəməyən müəllim özünün rəqabətə davamlılığını itirir, həm də müasir ünsiyyət üsullarında mobilliyinin olmaması tələbələr üçün maraqsız və arzu edilməz olur. Bunun qarşısını almaq üçün daha yeni metodlardan istifadə edərək dərslərin qarşılıqlı diskussiya şəraitində keçirilməsi məqsədəmüvafiqdir və bu zaman tələbələrin dərs prosesinə marağının artdığı müşahidə olunacaqdır. Qiymətləndirmə prosesində Kahoot və Quizziz kimi öyrədici oyun platformalarından istifadə edilməsi tələbələrin dərs prosesinə marağının artmasına gətirib çıxaracaqdır.

**Açar sözlər:** Onlayn təhsil, təhsildə keyfiyyət, yeni metodlardan istifadə, təhsildə qiymətləndirmə, qiymətləndirmənin təşkili.

**Məqalə tarixçəsi**
Göndərilib: 31.05.2021
Qəbul edilib: 07.06.2021

# QUALITY ASSURANCE IN ONLINE EDUCATION

**AYTAJ YUSIFOVA**
Lecturer, Azerbaijan State University of Economics.
e-mail: a.yusifova1993@gmail.com
https://orcid.org/0000-0002-9301-5003

**To cite this article:**
Yusifova A. (2021). Quality assurance in online education. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 51–58

**ABSTRACT**

Quality education in modern period is possible with optimal (successful) combination of traditional teaching methods and online teaching tools. The article discusses the difficulties that have arisen for both learners and teachers and their solutions in the transfer of almost all stages of education in connection with the pandemic to the online education system. The main aim of the article is to increase interest in the online education, quality assurance and to expanding the use of new methodologies. Of course, the fact that online education has led to the loss of the old way of teaching and assessment methods. The article states that very low interest of students in lecture-type classes in online education, at the same time, this mechanism encourages students to memorize and read in order to get a grade. A teacher who is currently unable to apply e-learning technologies and master the basics of online education loses his competitiveness and becomes uninteresting and undesirable for students due to lack of mobility in modern communication methods. To prevent this, it is advisable to hold classes in a discussion environment using newer methods, and at the same time, students' interest in the learning process will increase. The use of tools such as Kahoot and Quizziz in the assessment process will increase students' interest in the learning process.

**Keywords:** Online education, quality in education, use of new methods, assessment in education, organization of assessment.

**Article history**
Received: 31.05.2021
Accepted: 07.06.2021

## GİRİŞ

Azərbaycan Respublikasında bir çox sahələrdə olduğu kimi, təhsil sahəsində də köklü islahatlar həyata keçirilir. Əsas məqsəd cəmiyyətin tələbləri nəzərə alınmaqla, təhsildə keyfiyyəti yüksəltmək, həmçinin onun inkişafını təmin etməkdir. Bununla əlaqədar təhsilin keyfiyyətini şərtləndirən amillərə, ilk növbədə təhsilin məzmununa, müəllim hazırlığına və qiymətləndirmə sistemlərinə yenidən baxılması zərurəti yaranmışdır.

Təhsildə keyfiyyət anlayışı həmişə gündəmdə olmuşdur, çünki təhsil varsa, keyfiyyət də olmalıdır. Müasir dövrdə təhsil sistemi əsaslı şəkildə cəmiyyətin sosial-iqtisadi inkişafına təsir göstərir. Təhsilin inkişaf perspektivləri ölkə miqyasında hamını narahat edir, düşündürür və çıxış yolları axtarmağa məcbur edir.

Təlim və tədris prosesinin təkmilləşdirilməsi, ölkə üzrə tələbələrin nailiyyətləri barədə obyektiv məlumatların əldə edilməsi, habelə dövlət təhsil standartlarının monitorinqinin həyata keçirilməsi üçün müasir qiymətləndirmə mexanizmlərinin yaradılması mühüm vəzifə kimi hər bir təhsil işçisini narahat edən əsas məsələlərdir. Təhsildə keyfiyyətin müəyyənləşdirilməsində əsas göstərici təhsilalanın nəticələri olduğundan, həmin nəticələrin obyektiv qiymətləndirilməsi də keyfiyyəti üzə çıxaran ən etibarlı mənbə hesab olunur.

## AZƏRBAYCANDA ONLAYN TƏHSİLƏ KEÇİD

Son dövrlərdə bütün dünyada geniş yayılan COVİD-19 pandemiyası digər sahələrdə olduğu kimi təhsilin keyfiyyətinə də mənfi təsir etmişdir. BMT-nin 2020-ci ilin avqust ayına olan "COVİD-19 dövründə və ondan öncəki dövrdə təhsil" buraxılışında qeyd olunur ki, bu pandemiya bütün dünyada 190 ölkədə, təxminən 1,6 milyard təhsilalana təsir etmişdir. Məktəblərin və təhsil müəssisələrinin bağlanması dünya üzrə təhsilalanların 94%-nə təsir göstərmişdir ki, bunların da 99%-i aşağı və orta aşağı gəlirli ölkələrin payına düşür.[1]

COVİD-19 pandemiyası bütün dünyada ənənəvi şəraitdən tam fərqli bir situasiya yaratmış, sosial-iqtisadi prioritetlərə yenidən baxılmasını zəruri etmişdir. Pandemiyanın təsirlərini minimuma endirmək məqsədilə Azərbaycan Respublikasının Prezidenti tərəfindən vaxtında və çevik qərarların qəbul edilməsi, qabaqlayıcı tədbirlərin görülməsi bu virusun geniş yayılmasının qarşısını aldı. İlk mərhələdə Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2020-ci il 30 yanvar tarixli 35s nömrəli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında yeni koronavirus xəstəliyinin yayılmasının qarşısının alınmasına dair Fəaliyyət Planı"nın icrası ilə bağlı Təhsil Nazirliyi tərəfindən Tədbirlər Planı hazırlandı və nazirliyin 2020-ci il 28 fevral tarixli qərarı ilə ənənəvi təhsil prosesindən onlayn təhsilə keçildi.[2]

Pandemiya ilə əlaqədar təhsilin, demək olar ki, bütün pillələrində onlayn təhsil sisteminə keçilməsi həm təhsilalanlar, həm də təhsilverənlər üçün böyük çətinliklər yaratdı. Bu çətinliklərə birbaşa fərdlərdən asılı olmayan problemlər (internet, texniki avadanlıqlar və s.) və birbaşa fərdlərlə bağlı olan çətinliklər (texniki avadanlıqlardan düzgün istifadə, yeni yaranmış proqramlardan istifadə və s.) daxildir. Onu da qeyd etmək lazımdır ki, son zamanlar təhsil müəssisələrimizdə nəzərə çarpacaq dərəcədə dəyişikliklər (yeni texniki avadanlıqlar, kompüter təminatı və s.) müşahidə olunsa da, tədris prosesində, müəllim-tələbə-valideyn münasibətlərində keyfiyyət baxımından inkişaf və yeni texnologiyalardan istifadə bir o qədər qənaətbəxş deyil. Çünki bəzi müəllimlərdə yeni təfəkkür tərzi formalaşmır, onlar keçmişin təsirindən uzaqlaşmır və köhnə dünyagörüşü ilə işləyirlər. Təhsil müəssisələrinin rəhbərlərinin bu problemləri məktəb şuralarında, pedaqoji

[1] https://www.un.org/development/desa/dspd/wp-content/uploads/sites/22/2020/08/sg_policy_brief_covid-19_and_education_august_2020.pdf

[2] https://old.edu.gov.az/upload/file/NK-qerar/2020/09/Nk-qerar-No332.pdf

şuralarda müzakirə etməməsi və lazımi tədbirlər görməməsi isə təlimdə mənimsəmənin keyfiyyətinin azalmasına şərait yaradır. Bu araşdırmanın məqsədi pandemiya dövründə onlayn təhsil sisteminə daha sürətlə adaptasiya olmağın, yeni metodlardan istifadə etməklə keyfiyyətin artırılmasının təmin edilməsidir.

Onlayn təhsilə keçidin müsbət xüsusiyyətlərindən biri hər kəsin yeni informasiyaları rahatlıqla əldə edə bilməsidir. Təhsilalmanın bu formada təşkili, təbii ki, ənənəvi qiymətləndirmə metodlarının öz təsirini itirməsinə səbəb olur. Çünki ənənəvi tədris üsulunda testləşdirmə, yazılı imtahan və başqa üsullarla aparılan qiymətləndirmə hazırda bu təhsilalma formasında məqsədəuyğun hesab olunmur.

Tələbələrin karyera baxımından bacarıqlarını inkişaf etdirməsində onlayn təhsil əhəmiyyətli rol oynayır. Onlar qiymətləri, rəyləri və sertifikatları onlayn təhsil vasitəsilə daha sürətli alırlar. Dərs materiallarının hər zaman əlçatan olması, dərslərdə iştirak etmək üçün əlavə vaxtın sərf olunmaması, mütaliə etmək üçün vaxtın çoxluğu da onlayn təhsilin müsbət xüsusiyyətləri kimi xarakterizə oluna bilər.

Bütün dünyada onlayn tədris yalnız internet ilə deyil, həmçinin televiziya və radio kanalları vasitəsilə də təşkil olunub. Bunun obyektiv səbəbi olaraq göstərə bilərik ki, YUNESKO-nun Statistika İnstitutu (UIS) və Müəllimlərin İş Qrupunun apardığı son araşdırmaya görə, pandemiya səbəbi ilə dünyada 1.5 milyard şagird sinif-dərs prosesindən kənarda qalmış, təxminən 826 milyon şagirdin (50%) isə evdə kompüterlə təminat imkanı olmamışdır. Təxminən 706 milyon şagirdin internetə çıxışı yoxdur və onların 56 milyonu mobil şəbəkələrin əhatə olunmadığı ərazilərdə yaşayır. Ona görə də, effektiv həll yolu kimi televiziya və radio evdə internet və kompüter olmadığı bir şəraitdə ən yaxşı alternativdir.[3] Bu texnoloji uçurumu nəzərə alaraq dünyanın əksər ölkələri məsafəli təhsili həyata keçirmək üçün televiziya və radio əsaslı proqramlardan da istifadə edirlər.

Bu proqramlar nə qədər önəmlidirsə, COVİD-19 pandemiyası ilə bağlı maarifləndirici verilişlər də bir o qədər əhəmiyyətlidir. Bununla belə, radio və televiziyanın məsafədən təhsil vermək üçün vasitə kimi istifadəsi aşağıda qeyd olunan problemlər də yaradır:

- tədris məzmunlu audio-vizual formatlarda mövzuların olmaması;
- qısa müddət ərzində kəmiyyət və keyfiyyət baxımından tədris məzmunlu verilişlərin çəkilməsinin çətinlikləri;
- təhsil məzmunlu proqramların dizaynı və yayımı üçün əvvəlcədən təhsil qurumları və televiziya şirkətləri arasında razılaşmanın olmaması;
- təhsil proqramları hazırlamaq üçün təhsil mütəxəssisləri ilə televiziya və radioda işləyən mütəxəssislər arasında ünsiyyət və əməkdaşlığa ehtiyac;
- onlayn təhsilin monitorinqi və qiymətləndirilməsi ilə bağlı bilik və təcrübənin yetərli olmaması və s.

BMT-nin “COVİD-19 dövründə və ondan öncəki dövrdə təhsil” adlı 2020-ci il buraxılışında qitələr üzrə göstəricilər statistika qrafik 1-dəki kimidir.

Əksər televiziya və radio şirkətləri proqramlarını daha çox interaktiv komponentlərlə hazırlayaraq öyrənənlərin, xüsusən də gənclərin diqqətini cəlb etmək istəyir. Proqramlar nəsillər arasında məlumat və təcrübə mübadiləsi üçün bir platforma təmin etmək məqsədilə də hazırlanır. Məsələn, Litvanın milli televiziya kanalı təhsilalanları öz videolarında interaktiv ev tapşırıqlarına aid video çəkib kanala göndərməklə təhsil prosesində daha fəal iştirak etməyə təşviq etmişdir.

Uzaqdan təhsil həlləri kimi radio və televiziya yayımının istifadəsi, təhsil sektorundakı rəqəmsal uçurumu aradan qaldırmaq və bu prosesdən kənarda qalanları da əhatə etmək üçün güclü bir metoddur. Bununla birlikdə, nəzərə alınması lazım olan bəzi vacib məsələlər də var. Məsələn, təhsil proqramlarının keyfiyyət təminatı,

[3] https://en.unesco.org/news/startling-digital-divides-distance-learning-emerge

**Qrafik 1** COVİD-19 dövründə və ondan öncəki dövrdə təhsil[4]




**Source:** UNESCO-UNICEF-World Bank joint database, May–June 2020, http://tcg.uis.unesco.org/survey-education-covid-school-closures.

öyrənənlərin, xüsusən ən gənc olanların motivasiyası, öyrənmə nəticələrinin qiymətləndirilməsi və ya ölçülməsi ilə bağlı bir çox məsələ həll edilsə də, görüləsi işlər də çoxdur.

Bu sahədə qarşılaşdığımız problemlərdən biri də onlayn təhsildə tələbələrin mühazirə tipli dərslərə marağının aşağı olmasıdır. Bu mexanizm subyektiv xarakter daşıyır, tələbəni, bir qayda olaraq, əzbərləməyə və qiymət almaq xatirinə oxumağa təhrik edir. Təlim-tədris prosesində yalnız formal biliklər qiymətləndirilir, çox hallarda məqsəd qiymət yazmaqla məhdudlaşır və təhsilalanlara özünüqiymətləndirmə imkanı verilmir. Qiymətləndirmə nəticələrinin təhlilinin aparılmaması və müvafiq hesabatların hazırlanmaması da məsələnin həllinin uzanmasına gətirib çıxarır. Motivasiyanın azalması, bəzi yerlərdə internet və kompüter çatışmazlığı, ünsiyyətin canlı olmaması və digər texniki problemləri də onlayn təhsilin mənfi tərəfləri kimi qeyd etmək olar.

Birinci kurs tələbələri arasında distant təhsilin idarə edilməsi barədə keçirilmiş sorğunun nəticələri 1-6-cı diaqramlarda verilir.

## Nəticə

Ənənəvi dərs prosesində tələbələr sinif otaqlarında parta arxasında oturduqları zaman özlərini tədris mühitinin bir parçası kimi hiss

[4] Policy Brief: Education during COVID-19 and beyond. August 2020. United Nations. https://www.un.org/development/desa/dspd/wp-content/uploads/sites/22/2020/08/sg_policy_brief_covid-19_and_education_august_2020.pdf

**Diaqram 1** Məsafədən təhsilə necə adaptasiya oldunuz?




**Diaqram 2** Məsafədən təhsil prosesi sizi qane edirmi?




**Diaqram 3** Ənənəvi təhsillə müqayisədə məsafədən təhsil əlverişlidir?




edirlər və müəllimlərini rahat bir şəkildə dinləyərək dərsləri qavrayırlar. Lakin onlayn təhsil sistemində onlar bu mühiti hiss edə bilmədikləri üçün dərs prosesinə fokuslanmaqda çətinlik çəkirlər. Bu problem xüsusilə aşağı kurslarda daha çox müşahidə olunur. Bunun qarşısını almaq üçün daha yeni metodlardan istifadə edərək dərslərin qarşılıqlı diskussiya şəraitində keçirilməsi məqsədəmüvafiqdir. Bu zaman tələbələrin dərs prosesinə marağının artdığı müşahidə olunacaqdır. Qiymətləndirmə prosesində Kahoot və Quizziz kimi qiymətləndirmə vasitələrindən istifadə edilməsi də tələbələrin dərs prosesinə marağının artmasına kömək edən əsas amillərdən biri hesab olunur. Bu proqramlar vasitəsi ilə müəllimlər öz viktorinalarını yarada, pulsuz şəkildə mövcud viktorinalardan istifadə edə, tələbələr isə dərs prosesində bu sistemə daxil olaraq rahat şəkildə sualları cavablandıra bilərlər.

Kahoot – müəllimlərin təhsilalanlar üçün sadə testlər və sorğular hazırlaya biləcəyi sual-cavab platformasıdır. Müəllim getkahoot.com saytına daxil ola və pulsuz üzv olaraq testlər, sorğular yarada bilər. Viktorinaları tamamladıqdan sonra təhsilalanların cihazında hər hansı bir internet brauzerini açması, kahoot.it saytına qoşulması və viktorina kodunu və adlarını daxil etməsi lazımdır.[5]

Quizizz gündəlik həyatda, işdə və ya təhsildə istifadə edə biləcəyimiz qiymətləndirmə prosesini əyləncəli və maraqlı etmək üçün yaradılmış veb-platformadır. Bu platformadan istifadə etməklə təhsilalanları qruplar halında qiymətləndirə və quizizz ilə qiymətləndirməni asanlaşdırmaq üçün sorğular, testlər yarada bilərik. Bu qiymətləndirmə metodlarından tələbələr asanlıqla istifadə edə bilir, lakin şagirdlərdə xüsusilə aşağı sinifdə oxuyanlarda müəyyən problemlər yaşanır. Belə texniki problemlərin qarşısının alınması üçün xüsusi maarifləndirici təlimatların hazırlanması məqsədəuyğun hesab edilir.[6]

Onlayn təhsil sistemində əsasən Zoom və MS Teams platformalarından istifadə edilir ki, bu platformalar bir çox üstünlükləri ilə seçilir. Məsələn, təhsilalanlar ehtiyac olduqda, dərsi (təqdimat, video, canlı mühazirə, səs yazısı və s.) qeyd edərək daha sonra internet üzərindən yükləyə bilərlər.

[5] https://www.ozeldersalani.com/kahoot-nedir-nasil-kullanilir

[6] https://egitimaraclari.net/quizizz-nedir-nasil-kullanilir/

**Diaqram 4** Hansı onlayn platformalardan istifadə edirsiniz?




**Diaqram 5** Gələcəkdə məsafədən təhsil almaq istərdinizmi?




**Diaqram 6** Məsafədən təhsil zamanı qiymətləndirmə sizi qane edirmi?




Fikrimcə, hazırkı dövrdə ənənəvi təhsil prosesində alınan nəticələr məsafədən təhsildə hələ müəyyən müddət olmayacaq. Lakin pandemiya dövrünün nə qədər davam edəcəyinin bilinməməsi və təhsilin keyfiyyətinin azalmasının qəbuledilməzliyi onlayn təhsilin keyfiyyətinin artırılması üçün yuxarıda sadalanan metodların istifadəsini labüd edir. Bu metodların əsas vacib xüsusiyyətləri aşağıdakılar hesab oluna bilər:

- interaktiv və qarşılıqlı;
- əyləncəli;
- cəlbedici interfeys;
- istifadəçiyönlü.

Qənaətimiz belədir ki, koronavirus pandemiyası dövrünün gətirdiyi çətinliklərin qarşısı yalnız keyfiyyətli təhsil nəticəsində əldə edilmiş biliklər sayəsində alınacaqdır.

***Qeyd:*** *Məqalə Təhsil İnstitutunun dəstəyi, Təhsil İdarəçiləri Assosiasiyası və T-Network təhsil işçilərinin təcrübə və kommunikasiya platformasının təşkilatçılığı ilə 22-25 aprel 2021-ci ildə keçirilən Təhsil İdarəçiliyi Beynəlxalq Konfransında təqdim edilib.*

**İstifadə edilmiş ədəbiyyat**

1 "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. (2009). Bakı.
2 "Ümumi təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. (2019). Bakı.
3 Məmmədzadə, R. (2010). Təhsildə keyfiyyət aparıcı istiqamətlərdən biri kimi. Bakı.
4 Baytak, A. (2014). "Eğitimde Web Teknolojilerinin Kullanımı". Pegem Akademi Yayıncılık.

[5] İşman, A. (2011). "Uzaktan Eğitim". Pegem Akademi Yayıncılık.
[6] Kaya, Z. (2007). "Uzaktan Yüksek Öğretim" Değişim Çağında Yüksek Öğretim Global Trendler Paradigmal Yönelimler. Yaşar Üniversitesi Yayınları.
[7] Talbot, C.J. (2003). Studying at a distance: A guide for students. Open University Press.
[8] Uşun, S. (2009). "Dünyada ve Türkiye'de Bilgisayar Destekli Öğretim". Pegem Akademi Yayıncılık.
[9] http://www.wlac.edu/online/documents/otl.pdf
[10] https://elearnmag.acm.org/
[11] https://en.unesco.org/news/learning-through-radio-and-television-time-covid-19
[12] https://oedb.org/ilibrarian/10-advantages-to-taking-online-classes/
[13] https://online.illinois.edu/articles/online-learning/item/2017/06/05/5-benefits-of-studying-online-(vs.-face-to-face-classroom)
[14] https://onlinelearningconsortium.org/read/olc-online-learning-journal/
[15] https://www.britannica.com/topic/distance-learning
[16] https://www.iau-aiu.net/IMG/pdf/iau_covid19_and_he_survey_report_final_may_2020.pdf
[17] https://www.un.org/development/desa/dspd/wp-content/uploads/sites/22/2020/08/sg_policy_brief_covid-19_and_education_august_2020.pdf
[18] https://www.unicef.org/globalinsight/sites/unicef.org.globalinsight/files/2020-06/UNICEF-Global-Insight-remote-learning-issue-brief-2020.pdf
[19] https://www.uopeople.edu/blog/what-is-distance-learning
[20] https://egitimaraclari.net/quizizz-nedir-nasil-kullanilir/
[21] https://www.ozeldersalani.com/kahoot-nedir-nasil-kullanilir

# FORMATİV QİYMƏTLƏNDİRMƏDƏ DÜZGÜN ƏKS-ƏLAQƏ VƏ ŞAGİRD NAİLİYYƏTLƏRİNİN QİYMƏTLƏNDİRİLMƏSİNDƏ ONUN ROLU

**GÜNEL QASIMOVA**
Azərbaycan Respublikasının Təhsil İnstitutunun mütəxəssisi.
e-mail: gunel.qasimova@arti.edu.az
https://orcid.org/0000-0003-0079-2944

**Məqaləyə istinad:**
Qasımova G. (2021). Formativ qiymətləndirmədə düzgün əks-əlaqə və şagird nailiyyətlərinin qiymətləndirilməsində onun rolu. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 59–65

## ANNOTASİYA

Formativ qiymətləndirmənin əsas komponentlərindən biri olan əks-əlaqənin tapşırıqların icrası zamanı düzgün qurulması və tapşırıqyönlü olması şagird nailiyyətlərinin yüksəldilməsi baxımından xüsusi əhəmiyyətə malikdir. Lakin tədqiqat və müşahidələr göstərir ki, müəllimlərin şagirdlərə tapşırıqla bağlı verdiyi rəy bir çox hallarda eqoyönlüdür, ona görə də onların inkişafında səhvlərinin daha düzgün təhlilində ciddi rol oynaya bilmir. Bir çox hallarda isə həmin rəylər şagirddə prosesə qarşı marağı azaldır. Hətta bu cür rəylərin təsir imkanı o qədər güclüdür ki, düzgün qurulmayan əks-əlaqə bəzən şagirdlərdə özünəinamsızlıq, ruh düşkünlüyü və s. yarada bilir. Konstruktiv, yəni düzgün əks-əlaqə isə şagirddə motivasiya yaradaraq, onu işə daha məsuliyyətlə yanaşmağa sövq edir, düşündürür və "Öyrənilmiş çarəsizlik" sindromundan xilas edir. Beləliklə, effektiv və tapşırıqyönlü əks-əlaqə tapşırıqlarla bağlı verilən tərif və ya tənqid deyil, nəyi və necə etmək barədə düzgün, qərəzsiz istiqamətləndirmədir. Bu cür əks-əlaqə (feedback) şagird nailiyyətlərinin artmasına ciddi təsir göstərə bilir. Beynəlxalq araşdırmalar və yerli müşahidələrə istinadən qeyd etmək mümkündür ki, qiymətləndirmə prosesində özünəməxsus və həssas yer tutan rəyvermə prosesinə müəllimlər arasında səthi yanaşma mövcuddur. Beləliklə, şagird motivasiyasına təsir edən effektiv əks-əlaqə mexanizminin işlənilməsinə və müəllimlərdə düzgün əks-əlaqə təfəkkürünün formalaşdırılması ilə bağlı işlərin görülməsinə ehtiyac duyulur.

**Açar sözlər:** Formativ qiymətləndirmə, əks-əlaqə, şagird, müəllim, öyrənmə.

**Məqalə tarixçəsi**
Göndərilib: 24.05.2021
Qəbul edilib: 04.06.2021

# CORRECT FEEDBACK IN FORMATIVE ASSESSMENT AND ITS ROLE IN EVOLUATION OF STUDENTS ACHIEVEMENT

**GUNEL GASIMOVA**
Specialist of the İnstitute of Education of the Republic of Azerbaijan.
e-mail: gunel.qasimova@arti.edu.az
https://orcid.org/0000-0003-0079-2944

**To cite this article:**
Gasimova G. (2021). Correct feedback in formative assessment and its role in evoluation of students achievement. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 59–65

**ABSTRACT**

One of the main components of formative assessment is feedback. In formative assessment, the correct and task-oriented feedback provided by the teacher during the performance of tasks is especially important in terms of improving student achievement. However, research and observations show that teachers 'opinions on assignments are often selfish and do not play a significant role in students' development or in a more accurate analysis of their mistakes. In many cases, these opinions reduce the student's interest in the process. Even such opinions are so powerful that improper feedback can sometimes create disbelief, discouragement, and so on. Constructive is properly given feedback motivates the student to approach work in a more structured and responsible way, makes him think, and saves him from the syndrome of "learned helplessness". Thus, effective and task-oriented feedback is not a definition or critique of tasks, but a correct, unbiased guide to what and how to do it. Such feedback can have a significant impact on student achievement. Based on international research and local observations, it can be noted that there is a superficial approach among teachers to the feedback process, which has a unique and sensitive place in the assessment process. Thus, there is a need to develop an effective feedback mechanism that affects student motivation and to work on the formation of correct feedback thinking in teachers.

**Keywords:** Formative assessment, feedback, student, teacher, learning.

**Article history**
Received: 24.05.2021
Accepted: 04.06.2021

## Giriş

Məktəbdaxili qiymətləndirmə təlim və tədris prosesinin ayrılmaz tərkib hissəsi olaraq daim diqqət mərkəzində olmuşdur. Məlumdur ki, tədris prosesində məzmunun mənimsənilmə səviyyəsi, şagirdlərin bilik və bacarıqlarının inkişaf vəziyyəti qiymətləndirmə vasitəsi ilə müəyyənləşdirilir. Məktəbdaxili qiymətləndirmə həm də öyrənmə prosesini davamlı olaraq izləməyə, yaranan çətinlik və problemləri aradan qaldırmağa kömək edir.

Böyük və sürətli dəyişikliklər əsri olan XXI əsr həm də yeni tələblər, yanaşmalar və prinsiplər əsridir. Adıçəkilən yeniliklər təhsildə nəticə ilə yanaşı, nəticəyə aparan yola, yəni prosesə də fokuslanmağı, qiymətləndirmə prosesində də yeni yanaşmalar tətbiq etməyi tələb edir. Bu kontekstdə götürdükdə, qiymətləndirmə prosesi təkcə şagirdlərin hər hansı bir formal qaydada sualları cavablandırması deyil, eyni zamanda onun yazılı, şifahi və ya tətbiqi bacarığını göstərmək imkanı yaradan, müəllimə öyrətmə prosesində istiqamət verən bir proses kimi dəyərləndirilir. Qeyd olunan istiqamətdə Azərbaycanın təhsil sistemində də xeyli işlər görülmüş, yeni standart və tələblərə uyğunlaşdırmalar aparılmışdır. 2018-ci ildə Təhsil Nazirliyi Kollegiyasının müvafiq qərarı ilə "Ümumi təhsil pilləsində təhsilalanların attestasiyasının (yekun qiymətləndirmə (attestasiya) istisna olmaqla) aparılması Qaydası" təsdiq edilmişdir.

Şagirdlərin nailiyyətlərini qiymətləndirmək məqsədilə məktəbdaxili qiymətləndirmələrin aparılması, qiymətləndirmə vasitələrinin yaradılması və tətbiq olunması üzrə təlimatlar dəyişdirildiyi üçün qiymətləndirmənin də yeni sistemi yaradılmışdır. Yeni sistemdə təhsilalanların bilik və bacarıqları ilə yanaşı, həm də bu prosesdə onların fəaliyyəti, yəni necə öyrəndiyi, düşündüyü, davrandığı da qiymətləndirilir.

Məktəbdaxili qiymətləndirmənin hər üç növünə (diaqnostik, formativ və summativ) qısaca nəzər salsaq, diaqnostik qiymətləndirmə şagirdin bilik və bacarıqlarının ilkin səviyyəsinin yoxlanılmasına və müvafiq təlim strategiyalarının seçilməsinə xidmət edirsə, summativ qiymətləndirmə təlim prosesində müəyyən mərhələlərə (tədris vahidinin, yarımilin sonunda) yekun vurmaqla, müvafiq vasitələrlə şagirdin nailiyyətini qiymətləndirmək məqsədi daşıyır. Formativ qiymətləndirmə isə şagirdin bilik və bacarıqları mənimsəməsinə yönəlmiş fəaliyyətini izləmək, eyni zamanda bu yolda qarşıya çıxan problemləri aradan qaldırmaq və təhsilalanı istiqamətləndirmək baxımından öyrənmə prosesinin daha səmərəli təşkilini təmin edir. Diaqnostik və summativ qiymətləndirmədən fərqli olaraq, formativ qiymətləndirmə dərsi müşayiət edən, şagirdin ehtiyaclarını öyrənən, onun uğur qazana bilməməsinin səbəblərini yerindəcə araşdıraraq, onları aradan qaldırmağa yönələn strategiyalar müəyyənləşdirən davamlı bir prosesdir. Bu məqsədlə formativ qiymətləndirmə zamanı müxtəlif üsul və vasitələrdən istifadə olunur: müşahidə üsulu və müşahidə vərəqləri vasitəsindən, müsahibə üsulu və şifahi nitq bacarıqları üzrə qeydiyyat vərəqi vasitəsindən, yazı üsulu və yazı işləri vasitəsindən, oxu üsulu və mətnlər vasitəsindən və s. istifadə edən öyrədənlər öz şagirdlərində "öyrənməyi öyrənmək" bacarıqları formalaşdırmağa çalışır.[1]

Şagirdin fəaliyyətinin bütün dərs boyu izlənildiyi formativ qiymətləndirmə zamanı məzmun standartları əsasında qiymətləndirmə meyarları müəyyənləşdirilir və hər bir meyarın səviyyələri (rubrikləri) hazırlanır. Eyni zamanda əvvəlcədən hazırlanan qiymətləndirmə meyarları əsasında şagirdlərin müşahidə oluna biləcək fəaliyyəti üç, dörd və daha artıq səviyyədə təsvir olunmuş rubriklər (holistik və analitik rubriklər) şəklində yazılır.

Formativ qiymətləndirmədə diqqət mərkəzində saxlanılacaq ən əsas məsələlərdən biri də onun davamlılığıdır (Torrance and Pryor, 1998). Bu, şagirdin öyrənmə çətinliklərini daha erkən müəyyənləşdirilməsinə və aradan qaldırılmasına xidmət edir. Beynəlxalq miqyasda formativ qiymətləndirmənin həyata keçirilməsi və öyrənmə prosesinə təsiri barədə xeyli sayda

[1] https://www.oecd.org/site/educeri21st/40600533.pdf

**Cədvəl 1** Əks-əlaqə ilə bağlı 3 əsas sual

| Hara gedirəm? | Necə gedirəm? | Növbəti addım nədir? |
|---|---|---|
| Məqsəd nədir? | Necə etdim? | Özümü necə inkişaf etdirə bilərəm? |
| Keyfiyyətli iş dedikdə nə nəzərdə tutulur? | Nəyi yaxşı etdim? | Bu məlumat növbəti tapşırılqlara təsir edirmi? |
| Hansı çətinliklərdən xəbərdar olmalıyam? | Harada hədəfdən yayındım və necə? | Öyrənmə səviyyəmi növbəti səviyyəyə necə çatdıra bilərəm? |

əsaslı araşdırmalar aparılmasına baxmayaraq (Clark, 2012; Black, Wiliam, 2009), ölkəmizdə bu sahədə tədqiqatlara az rast gəlinir.

### Əks-əlaqənin tədris prosesində stimullaşdırıcı rolu

Şagirdin gündəlik inkişafının (eyni zamanda geriləməsinin) izlənilməsinə əsaslanan formativ qiymətləndirmədə mühüm məsələlərdən biri də müəllimin bu proseslə bağlı şagirdlə apardığı fikir mübadiləsidir. Buraya öyrədənin öyrənənə real nailiyyət səviyyəsi, hədəfə çatmaq üçün mövcud maneələr və bu maneələrin aradan qaldırılması yolları barədə verdiyi məlumatlar daxildir. Söhbət formativ qiymətləndirmə zamanı verilən rəylərdən və şagirdi inkişafa istiqamətləndirən əks-əlaqədən gedir. Çünki formativ qiymətləndirmənin mərkəzində əks-əlaqə dayanır (Hattie and Timperley, 2007).

Əks-əlaqə dünya təhsilində geniş yer tutan və araşdırılan mövzulardan biridir. Təhsildə əks-əlaqə dedikdə, müəllimin şagirdə tapşırıqları icra etməsi, davranışı və gördüyü digər işlərlə bağlı verdiyi rəy başa düşülür. Müəllimlə şagird arasında, bir növ, məlumat mübadiləsi olan bu prosesin düzgün təşkili şagird nailiyyətlərinə və öyrənmə prosesinin keyfiyyətinə ciddi təsir göstərir, təhsilalana səhvlərindən nəticə çıxarmaq və nailiyyət səviyyəsini artırmaq üçün lazımi addımlar atmaq fürsəti verir. Onların öyrənmə prosesindəki “Mən bacarmıram” yanaşmasını “Mən hələ bacarmıram” yanaşmasına çevirir.

Elmi ədəbiyyatda “rəyvermə, feedback” kimi də tanınan əks-əlaqə tədris prosesində stimullaşdırıcı rol oynayır. O, şagirdlərin cari vəziyyətinin qiymətləndirilməsində, motivasiyasında mühüm vasitələrdən biri hesab olunur. Belə ki, əks-əlaqə həm şagirdi güclü və zəif tərəflərini anlamağa, fəaliyyətini ona uyğun istiqamətləndirməyə sövq edir, həm də müəllimi təhsilalanın fəaliyyətini öyrənmə vəziyyətinə uyğun olaraq qurmağa yönləndirir.

Təhsil sahəsindəki tədqiqatları ilə tanınan C.Hətti və H.Temperley əks-əlaqə ilə bağlı 3 əsas suala diqqəti cəlb edirlər (Cədvəl 1) (Hattie and Timperley, 2007).

Əks-əlaqəni üç başlığa – məzmun, növ və strategiya başlıqlarına bölmək mümkündür (Sarsar, 2014). Burada məzmun dedikdə, əsasən, aşağıdakı yeddi prinsip nəzərdə tutulur:

- *Fokuslanma* – əks-əlaqəni şagirdin etdiyi işə uyğun olaraq vermək;
- *Qarşılaşdırma* (müqayisə) – şagirdlərin tapşırığını hazırlanan rubriklər vasitəsilə dəyərləndirmək;
- *Funksionallıq* – şagirdlərə və etdiyi işə qarşı qərəzli mövqe nümayiş etdirməmək;
- *Dəyərlilik* – əks-əlaqəni motivəedici formada vermək;
- *Aydınlıq* – rəyi hamı üçün aydın və başadüşülən şəkildə vermək;

- *Özünəməxsusluq* – əks-əlaqəni məhz mövzu və görülən işlə bağlı qurmaq;
- *İntonasiya* – rəy verərkən fərdiliyi və şagirdə uyğunluğunu nəzərə almaq.

Bir çox hallarda əks-əlaqə ilə tərif eyniləşdirilsə də, bunlar bir-birindən əsaslı surətdə fərqlənir. Tərif müəllim və şagird arasında münasibətlərin müsbət yöndə qurulmasını təmin etsə də, təhsilalan harada nəyi düzgün etdiyi üçün tərifləndiyini bilmir, bu səbəbdən də, onda öz bacarığı ilə bağlı düzgün təsəvvür formalaşmır. Müəllimin verdiyi düzgün rəy (əks-əlaqə) isə şagird üçün bir növ kompas və ya mayak rolunu oynayır, onu daha düzgün istiqamətləndirə bilir.

Ümumilikdə götürsək, yaxşı əks-əlaqə aşağıdakı xüsusiyyətləri özündə ehtiva edir:

- Təhsilalanlara hazırkı vəziyyətləri barədə məlumat verir;
- Şagirdləri verilən tapşırığı yerinə yetirmək bacarığı ilə bağlı düşünməyə sövq edir;
- Şagirdləri ondan gözlənən nəticələr barədə əvvəlcədən məlumatlandırır;
- Hazırkı səviyyə ilə gözlənilən nəticə arasındakı boşluğu doldurmağa istiqamət verir.

## Formativ qiymətləndirmədə əks-əlaqə

Əks-əlaqə (rəyvermə) formativ qiymətləndirmədə açar rolunu oynayır. Aparılan tədqiqatlar göstərir ki, müəllimlər şagirdlərə ən müxtəlif formalarda rəylər verir. Lakin bütün əks-əlaqələrin şagird nailiyyətlərinə təsir göstərmədiyi və fərqli rəylərin bu nəticələrə müxtəlif şəkildə təsir etdiyi müşahidə olunmuşdur.

Təlim prosesində ciddi dəyişikliklər olsa da, qiymətləndirmə prosesi hələ də müəllim tərəfindən idarə olunur və əks-əlaqə qiymətin şagirdlərə və digər maraqlı tərəflərə ötürülməsi kimi başa düşülür (Nicol, Macfarlane-Dick, 2006).

Formativ qiymətləndirmə zamanı tapşırığı yerinə yetirmək qabiliyyəti ilə bağlı verilən detallı təhlil və məlumat şagirdləri istiqamətləndirmək baxımından öyrənmə prosesini dəstəkləyir. Ancaq ədəd, simvol və ya tək kəlmə ilə ifadə olunan cəzalandırma, eləcə də tərif xarakterli əks-əlaqə şagirdlərə nə edəcəkləri barədə məlumat vermədiyi üçün faydalı hesab olunmur. Digər tədqiqatçılar da qiymət formasında verilən əks-əlaqənin şagirdin nailiyyət səviyyəsində hər hansı bir yüksəlişə səbəb olmadığını, nailiyyətlərlə bağlı verilən yazılı və ya şifahi məlumatın isə onların uğurlarını artırdığını qeyd etmişdir (Wiliam, 2016). Tərif və hədiyyə formasında verilən rəylər isə seyrək, konstruktiv, real və özünəməxsus olduqda faydalı sayılır. Yaxşı müəllimlərin bu tip motivasiya metodlarına az müraciət etdiyi müəyyən olunmuşdur. Çünki öyrənmə prosesində davamlı olaraq verilən hədiyyələr şagirdlərdə "öyrənmək üçün çalışmaq" fikri əvəzinə "hədiyyə üçün çalışmaq" fikri formalaşdıra bilər.

Müəllim formativ qiymətləndirmə zamanı təkcə şagirdə verdiyi cavabın düzgün olub-olmadığını deməklə kifayətlənmir, eyni zamanda onların prosesdə göstərdiyi qabiliyyəti haqqında ətraflı və sadə dildə rəylər verərək, onu həm də qiymətləndirmə prosesinin iştirakçısına çevirir. Bu zaman öyrənənlərdə nəyi və necə öyrəndikləri barədə fikirlər dolğunlaşmağa başlayır.

Dilan Uilyamın fikrincə, bir əsas fikri anlamaqla bütün prosesə təsir etmək və faydalı işlər görmək mümkündür: əks-əlaqə zamanı vacib məqam şagirdlərin bu rəydən necə faydalanacaqlarıdır. Həmin məqamı müəllim davamlı olaraq yaddaşında saxlamasa və bu prinsip əsasında hərəkət etməsə, məqsəddən yayınmış olacaq. Yəni əsas məqsəd şagirdin mövcud səviyyəsini yaxşılaşdırmaq, onu A nöqtəsindən B nöqtəsinə gətirmək olmalıdır. Müəllim əks-əlaqə zamanı məqsədin tapşırığı deyil, şagirdi dəyişdirmək olduğuna diqqət yetirsə, faydalı rəylər verə bilər. Əksinə, əks-əlaqə şagirdi düşünməyə yönləndirmir və onda heç bir dəyişiklik yaratmırsa, bu, sadəcə vaxt itkisi hesab olunur. Çünki əks-əlaqə şagirdi tapşırıq üzərində düşünməyə sövq etməlidir, məsələn: görülən işin keyfiyyətindən asılı olaraq nəticəsi dəyişə bilən bir tapşırığı bitirdikdən sonra şagirdləri "Bu tapşırığı yenidən etsəydim, nəyi daha fərqli şəkildə edərdim" sualı ilə qarşı-qarşıya qoymaq kimi. Bu məsələlərin üzərində

**Cədvəl 2** Düzgün əks-əlaqənin prinsipləri




düşünmə bacarığı formalaşan şagird zamanla əsas həyati bacarıqlardan olan öz üzərində tez-tez refleksiya etməyi də öyrənəcəkdir (Wiliam, 2016).

Əks-əlaqə zamanı müəllimin diqqət edəcəyi məsələlərdən biri də öyrənmə mühiti və şagirdin xüsusiyyətləridir. Belə ki, müəllimin şagirdə hansısa məsələ ilə bağlı verdiyi rəy onu prosesə və hədəfə çatmağa motivasiya edər, ancaq eyni müəllimin başqa bir təhsilalana göstərdiyi əks-əlaqə isə şagirdin təslim olmağına səbəb ola bilər. Buna görə də əks-əlaqədə həssas və fərdi yanaşma şərtdir və əvvəlcə müəllim sinfi səhv etmək üçün etibarlı mühitə çevirməlidir. Elə bir mühit ki, şagird burada özünü psixoloji olaraq rahat, səhv etdikdə belə hər hansı bir təzyiqə məruz qalmayacağı şəraitdə hiss etsin (Sarsar, 2014).

Əks-əlaqəyə qarşı şagird tərəfindən fərdi olaraq aşağıdakı cavablar verilə bilər:

- Davranışı dəyişə bilər;
- Hədəfi dəyişdirə bilər;
- Hədəfdən yayına bilər;
- Verilən rəyi rədd edə bilər (Wiliam, 2012).

Xüsusilə mənfi yöndə rəy verərkən “Sendviç” üsulundan istifadə etmək faydalı hesab olunur (Dohrenwend, 2002). Bu üsul mənfi rəyi iki müsbət rəyin arasında qeyd etmək kimi başa düşülür. Xüsusilə özünə inamı az olan uşaqlarla işləyərkən “Sendviç” modeli səmərəli olur.

Effektiv əks-əlaqə üçün əvvəlcə güclü müəllim-şagird münasibətlərinin formalaşdırılması da mühüm rol oynayır. Bu elə formada qurulmalıdır ki, şagird müəlliminin onun inkişafında maraqlı olduğunu anlasın. Ancaq bu halda biz faydalı əks-əlaqədən danışa bilərik. Əks halda, rəy düzgün verilsə belə, təhsilalan vəziyyətin düzəlməsi üçün əlavə vaxt və enerji itirmək marağında olmayacaqdır. Deməli, müəllimin şagirdinin hansı əks-əlaqəyə ehtiyacının olduğunu anlaması üçün onu dərindən tanıması vacibdir.

Müəllim olduqca həssas və həlledici məsələ kimi əks-əlaqə ilə bağlı müəyyən bacarıqlara sahib olmalı və onun vacibliyini anlamalıdır. Faydalı əks-əlaqə müəllimin bu situasiyanı əvvəlcədən planlaşdırması ilə başlayan, təhsilverənin müəyyən məqsədlər müəyyənləşdirməsi, əks-əlaqə mühitini hazırlaması zamanı və istifadə edəcəyi üslubu seçməsi və s. daxil olduğu çoxtərəfli prosesdir.

Formativ qiymətləndirmə ilə bağlı araşdırmalarda düzgün əks-əlaqənin prinsipləri Cədvəl 2-dəki kimi müəyyən olunmuşdur (Nicol and MacFarlane-Dick, 2006).

## Nəticə

Formativ qiymətləndirmə zamanı rəy verilən şagird mövcud öyrənmə səviyyəsi və bu

səviyyəni artırmaq üçün görəcəyi işlər haqqında məlumatlandırılır. O, təkcə şagirdi məlumatlandırmaq funksiyası daşımır, eyni zamanda öyrədənə də öyrətmə prosesindəki səhvlərini görmək, seçdiyi təlim strategiyalarını dəyişdirmək və ya yeniləmək imkanı verir. Beləliklə də öyrədən və öyrənənin, yəni hər iki tərəfin inkişafına zəmin yaradır.

Müşahidələr onu göstərir ki, müəllimlər şagirdlərlə müxtəlif formalarda əks-əlaqələr yaratsa da, hər əks-əlaqə şagirdin bilik, bacarıq və qabiliyyətinə müsbət yöndə təsir göstərə bilmir. Bu səbəbdən, müraciət etdiyimiz mövzu üzərində daha detallı tədqiqatlar aparmağa, təhsilverənlər və təhsilalanlar arasında müxtəlif sorğular keçirməklə və digər vasitələrlə Azərbaycan reallığında mövcud vəziyyətin öyrənilməsinə ciddi ehtiyac var.

***Qeyd:*** *Məqalə Təhsil İnstitutunun dəstəyi, Təhsil İdarəçiləri Assosiasiyası və T-Network təhsil işçilərinin təcrübə və kommunikasiya platformasının təşkilatçılığı ilə 22-25 aprel 2021-ci ildə keçirilən Təhsil İdarəçiliyi Beynəlxalq Konfransında təqdim edilib.*

### İstifadə edilmiş ədəbiyyat

1 Assessment for learning – the case for formative assessment https://www.oecd.org/site/educeri21st/40600533.pdf
2 Dohrenwend, A. (2002). Serving up the feedback sandwhich. Fam Pract Manag. Nov-Dec; 9(10): 43-46.
3 Hattie, J., and Timperley, H. (2007). The Power of feedback. Review of Educational Research March.
4 Nicol, D.J., & MacFarlane-Dick, D. (2006). Formative assessment and self-regulated learning: A model and seven principles of good feedback practice. Studies in Higher Education, 31(2), 199-218.
5 Nicol, D.J., Macfarlane-Dick, D. (2006). Formative assessment and self-regulated learning: A model and seven principles of good feedback practice. Published in Studies in Higher Education.
6 Sarsar, F. (2014). The Effectiveness of Emotional Motivational Feedback Messages. Spring 5-16.
7 Torrance, H., and Pryor, J. (1998). Investigating Formative Assessment: Teaching, Learning and Assessment in the Classroom. Philadelphia: Open University Press.
8 Wiliam, D. (2012). Feedback: Part of a System. Volume 70. Number 1 Feedback for Learning Pages 30-34. September.
9 Wiliam, D. (2016). The secret of feedback.
10 Clark, İ. (2012). Formative Assessment: A systematic and artistic process of instuction for supporting school and lifelong learning. Canadian Journal of Education.
11 Black, P.J., Wiliam, D. (2009). Developing the theory of formative assessment. Educational Assessment Evaluation and Accountability.

# İNFORMASİYA-KOMMUNİKASİYA TEXNOLOGİYALARINDAN İSTİFADƏ VASİTƏSİLƏ TƏLİM PROSESİNİN İDARƏ OLUNMASI

**XƏDİCƏ ƏLİYEVA,** Astara şəhəri, M.Ə.Sabir adına 1 nömrəli tam orta məktəbin direktoru. e-mail: xedicealiyeva11@gmail.com
https://orcid.org/0000-0002-5785-7457

**ZABUL ƏHMƏDOV,** Bakı şəhəri, Fizika, riyaziyyat və informatika təmayüllü Respublika liseyinin müəllimi, əməkdar müəllim. e-mail: zabul22@mail.ru
https://orcid.org/0000-0001-5894-714X

**Məqaləyə istinad:**
Əliyeva X., Əhmədov Z. (2021). İnformasiya-kommunikasiya texnologiyalarından istifadə vasitəsilə təlim prosesinin idarə olunması. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 66–72

**ANNOTASİYA**

Azərbaycan təhsil sistemi cəmiyyətin elmi-texniki və sosial-iqtisadi inkişafının başlıca mənbəyi kimi gənc nəslin təlim-tərbiyəsində əsas rol oynayan informasiyalaşdırma prosesinə qoşulmuşdur. İnformasiyanın əldə olunması, saxlanılması, təkrar istifadəsi və qorunması məqsədilə informasiya texnologiyalarından tədris prosesində istifadə ilə əlaqədar əsas hədəflər müəyyənləşdirilmiş, nəzərdə tutulan tədbirlərin xeyli hissəsi həyata keçirilmişdir. Bununla belə, bu sahədə problemlər hələ də mövcuddur. Dünya təcrübəsindən də göründüyü kimi, kifayət qədər çətin bir proses olan təhsilin informasiyalaşdırılması, müəyyən vaxt tələb etdiyindən, bu proses mərhələlərlə həyata keçirilir. Ölkədə informasiya və kommunikasiya texnologiyalarının təhsil sisteminə inteqrasiyası və təhsil prosesinin məzmunca modernləşməsi sahəsində əməli işlərdən biri də Azərbaycan Respublikası Prezidentinin 2008-ci il tarixli sərəncamı ilə təsdiq edilmiş "2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı"dır. Ölkəmizin son illər zamanın tələbilə aktual olan distant təhsilin tətbiqi ilə əlaqədar bu təhsilalma formasının keyfiyyətinin artırılması, müasir informasiya mədəniyyətinin formalaşdırılması və milli təhsil sisteminin dünya təhsil sisteminə inteqrasiyasının təmin edilməsi məqsədilə məqalədə bəzi mühüm vəzifələr kompleksinin həyata keçirilməsi təklif edilir.

**Açar sözlər:** İnformasiya -kommunikasiya texnologiyaları, təlim, təhsil, distant təhsil.

**Məqalə tarixçəsi**
Göndərilib: 01.03.2021
Qəbul edilib: 27.04.2021

# TRAINING MANAGEMENT PROCESS THROUGH THE USE OF INFORMATION AND COMMUNICATION TECHNOLOGIES

**KHADIJA ALIYEVA,** Director of the secondary school No. 1 named after M.A.Sabir, Astara city, Azerbaijan. e-mail: xedicealiyeva11@gmail.com https://orcid.org/0000-0002-5785-7457

**ZABUL AHMADOV,** Teacher of the Republican lyceum on physics, mathematics and informatics, Baku, Azerbaijan. e-mail: zabul22@mail.ru https://orcid.org/0000-0001-5894-714X

**To cite this article:**
Aliyeva Kh., Ahmadov Z. (2021). Training management process through the use of information and communication technologies. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 66–72

**ABSTRACT**

The Azerbaijani education system has joined the process of informatization, which plays a key role in the education of the younger generation as the main source of scientific, technical and socio-economic development of society. In order to obtain, store, reuse and protect information, the main goals related to the use of information technology in the educational process have been identified, and many of the planned activities have been implemented. However, there are still problems in this area. As the world experience shows, the informatization of education, which is a rather difficult process, takes some time, so this process is carried out in stages. One of the practical works in the field of integration of information and communication technologies in the education system and modernization of the educational process in the country is the "State Program on informatization of the education system in the Republic of Azerbaijan in 2008-2012" approved by the President of the Republic of Azerbaijan in 2008. In connection with the introduction of distance education in the education system of our country, the article proposes to implement some important tasks in order to improve the quality of this form of education, the formation of a modern information culture and the integration of the national education system into the world education system.

**Keywords:** Information and communication technologies (ICT), training, education, distance education.

**Article history**
Received: 01.03.2021
Accepted: 27.04.2021

Azərbaycan təhsil sistemi cəmiyyətin elmi-texniki və sosial-iqtisadi inkişafının başlıca mənbəyi kimi gənc nəslin təlim-tərbiyəsində əsas rol oynayan informasiyalaşdırma prosesinə qoşulmuşdur. İnformasiyanın əldə olunması, saxlanılması, təkrar istifadəsi və qorunması məqsədilə informasiya texnologiyalarından tədris prosesində istifadə ilə əlaqədar əsas hədəflər müəyyənləşdirilmiş, nəzərdə tutulan tədbirlərin xeyli hissəsi həyata keçirilmişdir. Bununla belə, bu sahədə problemlər hələ də mövcuddur. Dünya təcrübəsindən də göründüyü kimi, kifayət qədər çətin bir proses olan təhsilin informasiyalaşdırılması, müəyyən vaxt tələb etdiyindən mərhələlərlə həyata keçirilir. Bu texnologiyaların köməyi ilə biliyin mənimsənilməsində kompüter siniflərinin yaradılmasının, telekommunikasiya vasitələrindən düzgün və sistemli istifadənin, operativ nəşrlərin, interaktiv təlim üsullarının, müəllim və şagirdlərin verilənlər bazasından və proqram vasitələrindən istifadə etmək səriştəsinin rolu böyükdür. İnformasiya texnologiyalarının əsasında “informasiya” və “texnologiya” anlayışları dayanır. Texnologiya işlənəcək obyektə keyfiyyət dəyişikliyinin aparılması üçün istehsal proseslərindəki vasitə və üsullarla əlaqədar biliklər toplusudur. “İzah etmək”, “xəbərdar olmaq” mənasını ifadə edən informasiya isə qeyri-müəyyənliyin alınması zamanı onu azaldan və yaxud tam aradan qaldıran məlumatlardan ibarətdir (Robert, 2018). İnformasiya təbiətdə siqnallar şəklində ötürülür və iki tipə ayrılır: analoq və rəqəmli. İnsanlar öz hiss üzvlərinə görə analoq, kompüterlər isə rəqəmli informasiyaların köməyi ilə fəaliyyət göstərir. Beləliklə, analoq informasiya deyildiyi kimi təsvir edilir və insanın duyğu üzvləri ilə qəbul olunur, rəqəmli informasiya isə kompüterin emal etdiyi informasiyadır və kodlarla ifadə edilir. İnformasiya həm də ifadə formasından asılı olmayaraq insanlar, canlılar, cansızlar, faktlar, hadisələr, proseslər və s. haqqında olan məlumat və biliklərdir. Biliklər isə müəyyən faktlar və onlar arasındakı asılılıqlar şəklində ifadə olunur. İnformasiyanı yaratmaq, ötürmək, saxlamaq, emal etmək mümkündür (Dershko, 2016).

Ölkədə informasiya və kommunikasiya texnologiyalarının təhsil sisteminə inteqrasiyası və təhsil prosesinin məzmunca modernləşməsi sahəsində əməli işlərdən biri də Azərbaycan Respublikası Prezidentinin 2008-ci il tarixli sərəncamı ilə təsdiq edilmiş “2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı”dır. Bu proqramda İnformasiya-Kommunikasiya Texnologiyalarından (İKT) istifadə etməklə ölkəmizdə beynəlxalq standartlara uyğun keyfiyyətcə yeni təhsil modelinin qurulması və vahid elektron təhsil məkanının yaradılması əsas məqsəd kimi qarşıya qoyulmuşdur.

Təhsildə informasiya-kommunikasiya texnologiyalarının tətbiqinin dünya standartları səviyyəsinə çatdırılması ölkəmiz üçün prioritet istiqamətlərdən biridir. Azərbaycan Respublikası Prezidentinin 2009-cu il tarixli sərəncamı ilə təsdiq edilmiş “2009-2013-cü illərdə Azərbaycan Respublikasının ali təhsil sistemində islahatlar üzrə Dövlət Proqramı”nın əsas məqsədi ölkənin ali təhsilinin Avropa təhsil məkanına inteqrasiyası, onun məzmununun Boloniya prosesinin prinsiplərinə uyğunlaşdırılması, cəlbediciliyin və rəqabət qabiliyyətliliyin təmin edilməsi, habelə informasiya cəmiyyətinin və biliklərə söykənən iqtisadiyyatın tələblərinə uyğun kadr potensialının formalaşdırılmasıdır (Sarafanov, və b., 2016).

Dövlət Proqramının icrası istiqamətində vahid təhsil məkanının formalaşdırılması, təhsil xidmətlərinin mobilliyinin təmin olunması, yeni təhsil standartları və təhsilin təşkilini reqlamentləşdirən normativ sənədlər hazırlanması kimi məsələlərə xüsusi diqqət yetirilmişdir. Lakin bununla belə bu gün İKT tətbiqi üzrə elmi-metodiki bazanın təkmilləşdirilməsi, elektron təhsil məkanının formalaşdırılması günün əsas tələbi olaraq qalır.

Elektron təhsil (E-Learning) informasiya-sənaye ölkələrində gələcəyin təhsili sayılır. İnformasiya-kommunikasiya texnologiyaları tədrisdə tədqiqat və ya əyani vasitə obyektləri olmaqla yanaşı, təhsilin keyfiyyətinin yüksəldilməsi vasitəsi kimi də ənənəvi kağız və kitabxana texnologiyalarının imkan vermədiyi

informasiyanın əldə edilməsinə, işlənməsinə şərait yaratmalıdır.

Təhsildə yeni tədris texnologiyaları açıq və distant təhsil üçün tədris vasitələrinin, elektron dərsliklərin, təhsil portallarının yaradılmasını, multiagentli-multimedia və hiper-media texnologiyalarından istifadəni, animasiya texnologiyaları vasitəsilə tədris materiallarının əyanilik dərəcəsinin artırılmasını, telekonfrans texnologiyaları vasitəsilə respublika və beynəlxalq miqyaslı telekonfranslarda iştirak etməyi və s. əhatə edir. İnformasiya-kommunikasiya texnologiyalarının ən son nailiyyətləri isə universitetlərin idarə olunmasının avtomatlaşdırılmış sistemi olan – "Elektron universitet" (EU) layihəsində öz əksini tapmışdır. "Elektron universitet" faktiki olaraq təhsilin distant və onlayn formalarının inkişafının yeni mərhələsini əhatə edir, təhsil müəssisəsinin potensial sifarişçisi olan tələbələrin təhsil problemlərinin iqtisadi əlverişli üsullarla həlli və təhsil xidmətlərini kiber üsullarla həyata keçirmək imkanları yaradır.

İnformasiyanın istifadəyə yararlı olması üçün aşağıdakı şərtlər təmin olunmalıdır:

- *tamlıq* – tam şəkildə təsvir olunmalıdır;
- *düzgünlük* – həqiqəti əks etdirməlidir;
- *dəyər* – maksimum az məsrəflə əldə edilməlidir;
- *əhəmiyyətlilik* – istifadəçi üçün vacib olmalıdır;
- *aktuallıq* – cari vaxtda tələb edilən olmalıdır;
- *anlamlılıq* – istifadəçinin başa düşdüyü tərzdə hazırlanmalıdır (Robert, 2018).

İnformasiya texnologiyaları aşağıdakı əsas əlamətləri ilə səciyyələnir: prosesin işlənməsi obyektin verdiyi məlumatlar ilə həyata keçirilir; prosesin məqsədi məlumatların alınmasını təmin etməkdir; prosesin həyata keçirilməsində əsas vasitələr proqram, qurğu və proqramlı qurğular hesab edilən hesablama kompleksləridir; verilənlərin işlənmə prosesləri verilmiş əşya və obyekt sahəsinə uyğun əməliyyatlara bölünür; prosesin optimallıq meyarı informasiyaların istifadəçiyə vaxtında təqdim edilməsi, onun etibarlılığı, doğruluğu və tamlığı hesab edilir. İnformasiya texnologiyalarının əsas komponentləri isə bunlardır: verilənlərin toplanması (ilkin informasiya), verilənlərin emalı, yekun informasiyaların əldə olunması və onun istifadəçiyə göndərilməsi.

Yeni informasiya texnologiyası (kompüterli informasiya texnologiyası) fərdi kompüterlərin və telekommunikasiya vasitələrinin istifadəsinə əsaslanan texnologiyadır. Onun üç əsas prinsipi var:

- kompüterlə interaktiv (dialoq) rejimdə işləmək;
- proqram məhsullarının inteqrasiyası (birləşdirilməsi, qarşılıqlı əlaqələndirilməsi);
- həm verilənlərin, həm də məsələnin qoyuluşunun dəyişdirilməsi prosesinin çevikliyi (Sarafanov, və b., 2016).

İnformasiya istehsalının texniki vasitələrinə onun aparat, proqram və riyazi təminatı daxildir. Bu vasitələrin köməyi ilə ilkin informasiya emal edilərək yeni keyfiyyətli informasiyaya çevrilir. Rəqəmsal tədris resurslarının müəllim tərəfindən istifadəsi, məktəb ucqar kənddə olsa belə, şagirdlərin keyfiyyətli və müasir tələblərə uyğun tədris almasını reallaşdırır. Məktəblərdəki praktik işlər göstərir ki, vizual üsulla informasiya qəbulu şagirdlər tərəfindən daha yaxşı yadda saxlanılır. İnformatlaşdırılmış sistemlərin təlim-tədris prosesində oynadığı mühüm rol nəzərə alınaraq dərsdə interaktiv lövhələrdən, multimedia vasitələrindən, internet resurslarından istifadə nəticəsində tədris iştirakçılarının təlim prosesindən maksimum yararlanması təmin olunur.

Azərbaycanda keyfiyyətli, səmərəli, gələcəyə istiqamətlənmiş, beynəlxalq standartlara uyğun təhsil sisteminin yaradılması ən böyük tələblərdəndir. Bu məqsədlə təhsil sistemində islahatların, yeni konsepsiyaların, standartların qəbulu və onların həyata keçirilməsi istiqamətində əhəmiyyətli işlər görülür. Ən son texnologiyaların ölkəmizə gətirilməsi, onlardan istifadənin təmin olunması üçün pedaqoji heyətin buna cəlb olunması və onlara təlimlərin keçirilməsini buna misal göstərmək olar. Bu təlimlərdə iştirak edən müəllimlər informasiya texnologiyalarının imkanlarından istifadə edərək dərsin səmərəli təşkil edilməsi sahəsində psixoloji hazırlığa, innovativ biliklərə yiyələnir və onları

tədris prosesində necə tətbiq etməyi öyrənirlər. Aparılan müşahidələr göstərir ki, texnologiyaların istifadəsi təlim prosesinin keyfiyyətini artırır, öyrənənlərə tədqiqataparma, çoxsaylı informasiya bazasından bəhrələnmə, gərəkli olanı seçmə və məqsədəuyğun olandan istifadəetmə imkanları verir.

Azərbaycan Respublikasında internet texnologiyalarının interfeys imkanlarının artırılması, təhsil müəssisələri arasında şəbəkə əlaqələrinin yenidən qurulması, təlimdə informasiya mübadiləsinin keyfiyyətinə müsbət təsir göstərmiş bütün elektron resurslar bir mənbədə cəmlənərək təhsil portalı yaradılmışdır. Burada videodərslər, multimedialı proqramlar, elektron dərsliklər və s. yerləşdirilmiş, müəllim və şagirdlərin istifadəsinə verilmişdir.

Ölkənin təhsil sistemində müasir informasiya və kommunikasiya texnologiyalarının tətbiqinin hazırkı səviyyəsi dünya təhsil məkanına inteqrasiya baxımından qənaətbəxş hesab edilmir. Belə ki ölkədə təhsil ocaqlarının kompüter avadanlığı ilə təminatında dinamika müşahidə olunsa da, bütövlükdə təhsil sisteminin informasiya infrastrukturunun təkmilləşdirilməsi istiqamətində problemlər hələ də qalmaqdadır. Ölkəmizdə yerləşən bütün təhsil müəssisələrinin internet şəbəkəsi ilə təmin olunmasına baxmayaraq, onun verdiyi imkanlardan hələ də tam şəkildə istifadə edilmir. Bununla yanaşı, multimedia xarakterli dərsliklərin və digər tədris vasitələrinin işlənilməsi, yayılması və təhsil prosesində tətbiq olunması sahəsində işlər sürətləndirilməlidir. Son dövrdə bu istiqamətdə bir sıra tədbirlər həyata keçirilmiş, elektron tədris sistemlərinin mükəmməlləşdirilməsi sahəsində müəyyən işlər görülmüşdür. Lakin informasiya texnologiyalarının tətbiqi üzrə elmi-metodiki bazanın təkmilləşdirilməsi, ümummilli səviyyədə vahid elektron təhsil məkanının təşəkkül tapması günün əsas tələbi olaraq qalmaqdadır.

COVID-19 pandemiyası dünya ölkələrinin əksəriyyətini əhatə etdiyindən, YUNESKO təhsildə yaranan fasilələri məhdudlaşdırmaq üçün distant təhsil proqramlarından istifadəni tövsiyə etdi. Bununla da koronavirus pandemiyasının yayılması nəticəsində əksər ölkələrin təhsil məkanında nisbətən arxa planda qalan onlayn/distant təhsil ön plana keçdi. Azərbaycan Respublikasının Təhsil Nazirliyi yaranmış vəziyyətlə əlaqədar onlayn tədris imkanlarını nəzərdən keçirərək ümumi təhsil müəssisələrində tədris prosesinin dayandırılması səbəbindən dərslərin onlayn öyrənilməsi üçün bir neçə tədris resursunu təqdim etdi. Hazırda Nazirlik “Mədəniyyət” və “ARB Günəş” televiziya kanallarında “Dərs vaxtı”, “Virtual məktəb” (virtual.edu.az), bütün dərsliklərin onlayn mövcud olduğu e-derslik layihələrini həyata keçirir. Təhsil Nazirliyinin yaranmış böhran vəziyyətindən çıxmaq üçün tətbiq etdiyi bütün layihələr təqdirəlayiqdir. Lakin bununla belə bir sıra çatışmazlıqlar da var. Məsələn, kiçik yaşlı məktəblilərin və məktəbəqədər yaşlı uşaqların distant təhsilə keçməsi səmərəli olmur. Ona görə də gələcəkdə bu cür hallardan daha çevik və nisbətən az zərərlə çıxmaq üçün bir sıra addımlar atılmalı, distant təhsilin işlək mexanizmi hazırlanmalı və müvafiq qərarlar qəbul edilməlidir. Qeyd edək ki, distant təhsilalma forması “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanununda (maddə 13) və Nazirlər Kabinetinin 2011-ci il 21 yanvar tarixli 9 nömrəli qərarı ilə təsdiq edilmiş “Ali təhsil müəssisəsinin Nümunəvi Nizamnaməsi”ndə öz əksini tapıb. Aparılan araşdırmalar isə göstərir ki, ölkəmizdə distant təhsilin tətbiq olunmamasının əsas səbəbi bu təhsilalma forması üzrə mexanizmin hazırlanmamasıdır.[1] Bu prosesin gecikməsi isə həm on minlərlə gənci distant təhsil almaq hüququndan məhrum edir, həm də universitetlərimizin xaricdən tələbə cəlb etmək imkanını məhdudlaşdırır.

Təhsil Nazirliyi tərəfindən “Microsoft Teams” platformasının tətbiqi də göstərdi ki, bütün ali təhsil müəssisələri üçün domenlər yaradılsa da, bəzi universitetlər distant təhsilə tam hazır deyil. Distant təhsil məsafədən təşkil olduğundan, bu təhsilalma formasının keyfiyyətli olması şərtdir. Bunun üçün isə ali məktəblər İKT

[1] http://edu.gov.az

baxımından tam hazır olmalı, həmçinin elektron dərsliklərlə də təmin olunmalıdırlar. Qeyd edək ki, hazırda ölkəmizin bir sıra ali təhsil müəssisələri, o cümlədən ADA Universiteti, Azərbaycan-Fransız Universiteti (UFAZ), Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC) və s. təlim-tədris prosesinin məsafədən təşkilini təmin ediblər. Məsələn, Azərbaycan Dövlət İqtisad Universitetində (UNEC) müasir texnologiyalarla təchiz edilmiş "UNEC Extern" mərkəzi yaradılıb. Ən müasir texnoloji avadanlıqlarla təchiz edilən, dünyanın aparıcı universitetlərinin təcrübəsi əsasında hazırlanan "UNEC Extern"in üstünlükləri sırasına onlayn dərsə istənilən yerdən qoşulmaq, tələbələrin mövzunu daha dərindən mənimsəmək üçün müəllimə sual vermək, müzakirələrdə iştirak etmək, dərslərin video – bazasına istənilən vaxt və istənilən yerdən yenidən baxmaq imkanları daxildir.[2]

"UNEC Extern" Mərkəzində cəmi 14 nəfərlik inzibati heyətlə il ərzində 20 mindən çox tələbəyə distant formada yüksək keyfiyyətli təhsil vermək mümkündür. Halbuki bu qədər tələbəyə əyani və qiyabi təhsilalma formasında təhsil vermək üçün ən azı 1200-1300 inzibati heyətə (müəllimlərdən əlavə) ehtiyac var.[3] Digər bir məqam təhsildə rəqəmsal texnologiyaların tətbiqi və ona yeni yanaşmaların formalaşdırılmasıdır. Bütün dünyada müəllimlər sinifdə rəqəmsal texnologiyaların olmamasının tədrisə maneə yaratdığını bildirirlər. Azərbaycanda tədrisin davamlılığını təmin etmək məqsədilə tətbiq edilən onlayn dərslər də göstərdi ki, bu sahədə bir çox problemlər qalmaqdadır. Məsələn, onlayn/distant tədris üçün rəqəmsal cihaz, internet və sakit mühit əsasdır. "Virtual məktəb" layihəsi şəhər və rayon məktəblərində nə qədər əlçatan olsa da, kənd məktəbləri üçün müəyyən problemlər yaradır. Çünki region məktəblərinin texniki cəhətdən təchizatı və internetlə təminatı aşağı səviyyədədir.

Təhsil Nazirliyi tərəfindən öyrədənlərin və öyrənənlərin informasiya texnologiyaları biliklərinin artırılması üçün layihələrin həyata keçirilməsi, müəllimlər üçün davamlı olaraq təlimlər, ixtisasartırma kursları və seminarların təşkil edilməsi də zəruridir. Çünki onlayn layihələr müəllimdən, ilk növbədə yeni təlim metodlarını, dərsin diferensiallaşdırılmasını mənimsəməyi tələb edir. Müəllim, hər şeydən öncə, başa düşməlidir ki, ənənəvi dərsi olduğu kimi onlayn formata keçirmək olmaz. Distant təhsilin tarixi inkişaf prosesinə nəzər yetirəndə görmək olur ki, Qərb ölkələrində bu sahədə xeyli təcrübə qazanılmışdır. Məsələn, Böyük Britaniyada "Açıq Universitet" (Open University) dərslərini distant şəkildə təşkil edir.[4] Fəaliyyətinin ilk illərində yalnız öz vətəndaşlarını qəbul edən bu universitet sonrakı illərdə xarici vətəndaşların da qəbulunu həyata keçirməyə başlamışdır. Hazırda bu universitet distant təhsil həyata keçirən universitetlər arasında liderlik etməyə davam edir. Hər il bu universitetin qəbul planı 200 mindən çox olur. Bundan başqa, hazırda Avropada tanınmış distant təhsil mərkəzlərindən sayılan İspaniya Milli Distant Təhsil Universitetinin ölkə daxilində 60, ölkə xaricində 9 filialı var. Bu sahədə tanınmış ali təhsil müəssisələri içərisində ABŞ-ın Pensilvaniya Universitetini də misal göstərmək olar. Bu universitetin təcrübəsi UNESCO tərəfindən qəbul edilərək digər universitetlərə tövsiyə edilir. Türkiyənin Anadolu Universitetində 1982-ci ildən məsafədən təhsil sistemi tətbiq olunur. Bu universitetdə hazırda 1,5 milyon tələbə distant təhsil alır. Düşünürük ki, bu universitetlərin təcrübəsindən yararlanmaq faydalı olar.[5]

Ölkəmizin təhsil sistemində distant təhsilin tətbiqi ilə əlaqədar aparılan araşdırmalardan da göründüyü kimi bu təhsilalma formasında keyfiyyətinin artırılması, müasir informasiya mədəniyyətinin formalaşdırılması və milli təhsil

[2] https://unec.edu.az/idareetme11/merkezler/unec-extern-merkezi/
[3] https://unec.edu.az/idareetme11/merkezler/unec-extern-merkezi/
[4] http://www.open.ac.uk/
[5] https://en.unesco.org/

sisteminin dünya təhsil sisteminə inteqrasiyasının təmin edilməsi məqsədilə aşağıdakı mühüm vəzifələr kompleks şəkildə həll olunmalıdır:[6]

- Vahid təhsil-informasiya sisteminin yaradılması;
- İnformasiya texnologiyalarının tədris prosesinə inteqrasiyasının təmin edilməsi məqsədilə elektron dərsliklərin hazırlanması və onların tədris prosesində tətbiqi;
- Təhsilin keyfiyyətinin artırılmasının təmin edilməsi üçün tədris məqsədli informasiya texnologiyaları vasitələrinin standartlaşdırılması və sertifikasiyası;
- Təhsil sisteminin idarə edilməsi üzrə informasiya texnologiyalarına əsaslanan təsirli və şəffaf monitorinq sisteminin və resurs mərkəzinin yaradılması;
- Tədris prosesinin bütün iştirakçılarına ən yeni informasiya texnologiyalarından istifadəetmə bacarıqlarının aşılanması;
- Bütün təhsil müəssisələrinin informasiya texnologiyaları avadanlığı və internetlə təmin olunması;
- İnformasiya texnologiyaları üzrə vahid terminologiyanın hazırlanması və onun standart kimi tətbiq olunması.

[6] http://edu.gov.az

### İstifadə edilmiş ədəbiyyat


1 Abbasov, N.Ə. (2011). Müasir informasiya kommunikasiya texnologiyalarının tədris prosesinə tətbiqi. Bakı, ADPU, 208 s.

2 Ağayev, Ə.A. (2016). Yeni təlim metod və texnologiyalarından istifadənin nəzəri və praktik məsələləri. Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun Elmi əsərləri. Bakı, №1.

3 Elm və təhsildə informasiya-kommunikasiya texnologiyalarının tətbiqi. (2018). II Beynəlxalq konfrans. Bakı, I kitab, Bakı Mühəndislik Universteti, 329 s.

4 Əliyev, H.Ə. (2009). İKT siyasəti müasir mərhələdə. Azərbaycan, 8 may, s.58.

5 İsmayılov, İ.N. (2018). Təlimdə yeni informasiya texnologiyaları vasitələrindən istifadənin didaktik əsasları. “Azərbaycan məktəbi” jurnalı. Bakı, № 2, s.44-52.

6 Qəndilov, R.T., Əliyev, A.F. (2013). Təhsildə yeni informasiya və kommunikasiya texnologiyaları: problemlər, prioritetlər. Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun elmi əsərləri. Bakı, № 1, s.59-61.

7 Robert, I.V. (2018). Theory and methodology of informatization of education (psychological, pedagogical and technological aspects): 2nd edition, revised. Moscow.

8 RAO, IIO., Dershko, B.Y. (2016). Classification of information and communication educational technologies and their use in the educational process of the university. B. Yu. Dereshko. Telecommunications and informatization of education. No 1. p.62-74.

9 Sarafanov, A.V., Sukovaty, A.G., Sukovataya, I.E., and others. (2016). Application of information and communication technologies in education: study guide. Allowance. Krasnoyarsk: IPC KSTU, 186 p.

# TƏHSİLDƏ ƏSAS KEYFİYYƏT FAKTORLARI

**SƏRCAN SADİQOVA**
Naxçıvan Dövlət Universiteti, İngilis dili və metodika kafedrasının müəllimi.
e-mail: sarjansadigova@gmail.com
https://orcid.org/0000-0003-4808-5982

**Məqaləyə istinad:**
Sadiqova S. (2021). Təhsildə əsas keyfiyyət faktorları. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 73–80

**ANNOTASİYA**

Məqalədə təhsilin keyfiyyətində əsas rol oynayan amillərdən, bu sahədə mövcud olan nöqsanlardan və onların aradan qaldırılmasından bəhs edilir. Qeyd olunur ki, təhsilin qarşısında duran əsas vəzifə müasir standartlara cavab verən yüksək səviyyəli mütəxəssis hazırlığını təmin etməkdir. Bu sahədə yeni imkanlar əldə etmək üçün informasiya-kommunikasiya texnologiyalarının, habelə müəllim və tələbə əməyinin stimullaşdırılmasının mühüm rolu vardır. Məqalədə respublikamızın beynəlxalq təşkilatlarla sıx əməkdaşlıq etdiyi və Azərbaycanda həyata keçirilən islahatlar nəticəsində təhsil sisteminin beynəlxalq standartlara uyğunlaşdırıldığı da vurğulanır. Qeyd olunur ki, müasir təhsil bütün detalları ilə innovativ təhsildir. Tətbiq olunan interaktiv təlim üsulları, müəllimin bələdçilik fəaliyyəti, müəllim-şagird münasibətlərində yeni yanaşmalar, konseptuallığı ilə səciyyələnən kurikulum islahatı, təhsil və tədris prosesinə yeni elmi-texniki avadanlıqların tətbiqi, qiymətləndirmə islahatı və bu sahədəki yeniliklər, təhsilalanların və təhsilverənlərin məzmunca dəyişməsi, İKT-dən istifadənin daha geniş vüsət alması bütövlükdə təhsilin innovasiyalaşdırılmasına xidmət edir. Belə nəticəyə gəlinir ki, təhsilin keyfiyyəti üçün hər kəs öz üzərinə düşəni yerinə yetirməli, müasir standartlara cavab verən tədris prosesindən istifadə edilməli, eləcə də təhsilin keyfiyyətinə təsir göstərən əsas amillər – müəllimlər, valideynlər, şagirdlər, motivasiya, liderlik, mühit, tədris qiymətləndirmə metodları və tədris planı – hər zaman diqqət mərkəzində olmalıdır.

**Açar sözlər:** Təhsil, təhsil sistemi, təhsilin keyfiyyəti, amil, tədris prosesi.

**Məqalə tarixçəsi**
Göndərilib: 07.05.2021
Qəbul edilib: 27.05.2021

# THE QUALITY FACTORS IN EDUCATION

**SARJAN SADIGOVA**
Nakhchivan State University, Department of English language and methodology, teacher. e-mail: sarjansadigova@gmail.com
https://orcid.org/0000-0003-4808-5982

**To cite this article:**
Sadigova S. (2021). The quality factors in education. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 73–80

**ABSTRACT**

The article discusses the key factors in the quality of education, current deficiencies in this field and their elimination. It is stated that the main task of education is to provide high-level education that meets modern standards. Information and communication technologies, as well as the stimulation of teachers and students have an important role to play in gaining new opportunities in this area. The article also emphasizes that our country closely cooperates with international organizations and as a result of reforms implemented in Azerbaijan, the education system has been brought into line with international standards. It is noted that modern education is an innovative education in all its details. Applied interactive teaching methods, teacher guidance, new approaches to teacher-student relations, curriculum reform characterized by conceptualization, application of new scientific and technical equipment in education and teaching process, assessment reform and innovations in this field, change of content of students and educators, wider use of ICT as a whole serves to innovate education. The author concludes that for the quality of education, everyone must do their part, use a teaching process that meets modern standards, as well as the main factors that affect the quality of education – teachers, parents, students, motivation, leadership, environment, teaching assessment methods and curriculum – should always be in the center of attention.

**Keywords:** Education, education system, quality of education, factor, teaching process.

**Article history**
Received: 07.05.2021
Accepted: 27.05.2021

## Giriş

“Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda təhsilin keyfiyyəti başlıca strateji prioritet elan olunub, ümumi təhsil müəssisələrinin şagird və məzunlarının keyfiyyət göstəricilərinin yaxşılaşdırılması aktual məsələ kimi irəli sürülüb. Aparılan tədqiqat işinin məqsədi müasir dövrdə ən aktual problemlərdən olan təhsildə keyfiyyətin əsas amillərini müəyyənləşdirmək və onlardan səmərəli şəkildə istifadəni təmin etməkdir.

Hazırda təhsildə əsas məqsədlərdən biri onun keyfiyyətinin yüksəldilməsidir. Təhsilin keyfiyyətinin yüksəldilməsi ona təsir edən amillərin məhsuldarlığını təmin edən tədris prosesinin kompleks xarakteristikası kimi müəyyənləşdirilir. Keyfiyyətə nail olunmasında müəllimin biliyinin və pedaqoji bacarıqlara yiyələnməsinin, habelə təhsilalanlarının akademik fəaliyyətinə müsbət təsir göstərən effektiv tədris metodlarının əhəmiyyəti böyükdür.

Təhsildə keyfiyyət hər zaman aparıcı amil olmuşdur. Bununla yanaşı, müvəffəqiyyət əldə etmək, təhsil prosesinin vəziyyətini və effektivliyini artırmaq üçün digər amillərdən də geniş istifadə olunmalıdır.

## Təhsilin keyfiyyəti anlayışı

Təhsilin başlıca məqsədlərindən biri olan keyfiyyətin yüksəldilməsi şagirdlərdə həyati bacarıqların inkişaf etdirilməsini, şəriştəliliyin səmərəli təşkilini təmin edən tədris prosesinin kompleks xarakteristikası kimi müəyyənləşdirilir. Con Dyuinin təbirincə desək, təhsil həyata hazırlıq deyil, həyatın özüdür. Elm inkişaf etdikcə, təcrübə artdıqca təhsil anlayışı geniş məna kəsb edir, həyatın onun qarşısında qoyduğu yeni tələblər nəticəsində vəzifələr optimallaşır (Məmmədzadə, 2010).

Təhsil sisteminin və onun məzmununun ölkənin gələcəyinə xidmət göstərməsi fikrini xüsusi dəlillərlə əsaslandırmağa ehtiyac yoxdur, çünki cəmiyyətin çoxəsrlik tarixi bunu sübut edir. Aristotel yazırdı ki, qanun verənlər gənclərin tərbiyəsinə xüsusi diqqətlə yanaşmalıdırlar, hansı dövlətlərdə bu problemlər diqqət mərkəzində deyil, həmin ölkədə dövlət quruluşu ziyanlarla üzləşir. Aydındır ki, dövlət quruluşu formasından asılı olmayaraq, tərbiyənin forma və məzmununa möhtacdır (Məmmədzadə, 2010).

Təlimdə müvəffəqiyyət əldə etmək üçün son zamanlar xüsusi metodlardan, məsələn təlim-tərbiyə prosesində tətbiq edilən proqramların və ümumiyyətlə, müxtəlif sahələrdə qazanılmış biliklərin qiymətləndirilməsində bəzi testlərdən geniş istifadə olunur. 2005-ci ildən etibarən keyfiyyət təminatında, eləcə də kvalifikasiya çərçivəsində, təlim nəticələrinin tanınması və təşviqi kimi həyata keçirilən digər Boloniya tədbirlərində əhəmiyyətli irəliləyişlər baş vermişdir.

Ölkəmizdə 15 mart 2021-ci ildən etibarən təhsilin keyfiyyətinə təsir edən amilləri müəyyən etmək üçün sorğu keçirilmiş və bu məqsədlə 10812 rəy qəbul edilmişdir. Sorğunun nəticəsinə əsasən demək olar ki, təhsilin keyfiyyətinə təsir edən amillər sırasında müəllimlərin peşəkarlıq səviyyəsi 33,3 faiz olmaqla üstünlük təşkil etmişdir. Bununla yanaşı, keyfiyyətə təsir edən başqa amillər arasında məktəbin maddi-texniki təchizatı (17,3 faiz), valideyn amili (15,2 faiz), məktəb rəhbərlərinin fəaliyyəti (10 faiz), məktəbdə psixoloji mühit (8,2 faiz) və dərsliklər də (5,5 faiz) var.

Beləliklə, sorğunun nəticələrindən də aydın olduğu kimi, səmərəli dərs deyə biləcək ixtisaslı və təcrübəli müəllimlərin olması təhsilin keyfiyyətinə təsir göstərə biləcək əsas amildir.

Təhsilin keyfiyyətinə təsir edən digər amil zəruri təlimat materiallarının olmamasıdır. Tədris prosesini səmərəli şəkildə həyata keçirmək üçün onu lazımi avadanlıq, dərslik və digər tədris materialları ilə təmin etmək lazımdır. Lockheed də dərsliklərin və digər tədris materiallarının təhsilin keyfiyyətini artırmaq üçün vacib olduğunu bildirmişdir (Tefera, 2019).

Təhsildə keyfiyyətin artırılmasında digər amillərlə yanaşı motivasiyanın tətbiq edilməsi və düzgün planlaşdırmanın aparılması da zəruridir. Çünki qarşıya qoyulmuş məqsədə nail olmaq üçün perspektiv planlaşdırma və motivasiyadan istifadə edilməsi uğurlu və

məhsuldar tədris prosesinə öz töhfəsini verə bilər. Dərsin keyfiyyətinin yüksəldilməsində və şagirdlərdə təfəkkürün inkişaf etdirilməsində motivasiyanın rolu inkaredilməzdir. Planlaşdırılma amilinin bu funksiyada mühüm əhəmiyyətə malik olması qeyd edilməlidir. Hər bir məqsədin əldə edilməsi onun həyata keçirilməsi üsullarının seçilməsindən, əldə etmək istəyinin müəyyənləşdirilməsindən, bu məqsədlə prosesin ardıcıllığının təmin edilməsi üsullarının düşünülmüş şəkildə həyata keçirilməsi tədbirlərinin təyin edilməsindən asılıdır. Plan layihədir, onu müzakirə etmək, mütəxəssislər tərəfindən qiymətləndirməyə vermək, düzəlişlər aparmaq və praktiki fəaliyyətdə səhvlərə yol verməmək üçün optimal səviyyəyə qaldırmaq lazımdır. Unutmaq olmaz ki, planlaşdırma zamanı buraxılmış səhvləri sonradan düzəltmək çox çətindir. Planlaşdırma, sözün əsl mənasında, proqnozlaşdırma, proqramlaşdırma və işçi planının hazırlanmasından ibarətdir (Məmmədzadə, 2010). Plan imkan yaradır ki, qarşıya qoyulmuş məqsəd uğrunda standartlar, göstəricilər müəyyənləşdirilsin. Planın göstəriciləri nəzarətin həyata keçirilməsinə imkan yaradır. Planlaşdırma düzgün həyata keçirilibsə, idarəetmə fəaliyyəti düzgün istiqamətlənir, yaxşı nəticələr əldə edilir və vaxta qənaət olunur. Son təcrübələr göstərir ki, təhsil müəssisələrinin bəzilərində təlim-tərbiyə işlərinin planlaşdırılması məktəbin fəaliyyəti, inkişafı proqramının hazırlanması və həyata keçirilməsi ilə əvəz olunur.

Yüksək motivasiya olunmuş öyrənənlərlə keyfiyyətli nəticə əldə etmək asan olduğu halda, zəif motivasiyalı öyrənənlərlə təlimin məqsədlərinə nail olmaq çətinləşir. Fəal təlim prosesində motivasiya açar rolunu oynayır və o ən güclü təhrikedici, təsiredici faktordur. Bütün öyrənənlər motivasiyalı ola bilər, lakin onların motivasiya mənbələrinin fərqli olması gözləniləndir. Bu fərqləri bilən müəllim öyrənənlərin öyrənmə həvəsini tənzimləmə bacarığına malik olur. Ona görə də təhsilalanlarla motivasiyanı yaradan səbəbləri bilmək pedaqoji prosesin təşkilatçıları üçün vacibdir.

Təhsilin keyfiyyətinə və tədris prosesinə təsir edən faktorlardan biri də, mühüm pedaqoji vasitə kimi qəbul edilən qiymətləndirmədir. Qiymətləndirmə təlim-tərbiyə prosesini təkmilləşdirməyə, təlim prosesinin səmərəliliyini yüksəltməyə, şagirdlərin nəyi mənimsədiklərini, nələri öyrəndiklərini, hansı bacarıqlara malik olduqlarını və onlarda hansı keyfiyyət dəyişikliklərinin formalaşdığını müəyyənləşdirməyə obyektiv şərait yaradır. Məhz qiymətləndirmə vasitəsilə təhsil müəssisəsi rəhbərləri müəssisədə təlim-tərbiyə işinin səviyyəsi, müəllim və şagirdlərin fəaliyyəti haqqında lazımi informasiya toplayır və bunun əsasında işin yaxşılaşdırılması üçün müvafiq qabaqlayıcı tədbirlər həyata keçirirlər. Göründüyü kimi, təhsildə qiymətləndirmə sistemi təhsil işçisinin səmərəli fəaliyyətinin müəyyənləşdirilməsi və pedaqoji prosesin təkmilləşdirilməsi üçün vaxtında tələb olunan tədbirlərin görülməsi məqsədini daşımalıdır. Çünki qiymətləndirmə pedaqoji prosesi tənzimləməyə, keyfiyyəti yüksəltməyə, həm də mövcud çatışmazlıqlar barədə təhsili idarə edənlərin və valideynlərin məlumatlandırılmasına xidmət edən yeganə pedaqoji vasitə olduğundan, onun düzgün təşkili mühüm rol oynayır. Ona görə də ümumtəhsil məktəblərində elmi, pedaqoji və psixoloji cəhətdən əsaslandırılmış monitorinq və qiymətləndirmənin aparılması təhsil prosesinin keyfiyyətinin yüksəldilməsində atılan ən mühüm addımlardan biridir (Hüseynova, 2020).

Müəllim-şagird və ya müəllim-tələbə arasındakı əlaqə yaxşı qurulmazsa, bu nüans uşaqların aldığı təhsilin keyfiyyətinə mənfi təsir göstərəcəkdir. Öyrənənlərin uğurlu fəaliyyətinə mane olan məqamlara tədris materialları və tədris metodlarının uyğun tətbiq edilməsində çətinliklər, müəllimlərin iş şəraitinin pis olması səbəbindən motivasiyanın alınmaması, öyrənənlərin tədris müəssisəsinə gəlməməsi kimi hallar da daxildir.

## Təhsilin müasir vəziyyəti, problemlər və onların aradan qaldırılması

Ə.Ə. Əlizadə və H.Ə. Əlizadə psixopedaqoji araşdırmalarında müasir təhsil konsepsiyasının özünəməxsus cəhətlərindən danışaraq qeyd

edirlər ki, müasir təhsil konsepsiyası şəxsiyyətin formalaşdırılmasını təhsil sisteminin başlıca vəzifəsi hesab edir (Əlizadə, 2008).

Müasir təhsil bütün detalları ilə innovativ təhsildir. Tətbiq olunan interaktiv təlim üsulları, müəllimin bələdçilik fəaliyyəti, müəllim-şagird münasibətlərində yeni yanaşmalar, konseptuallığı ilə səciyyələnən kurikulum islahatı, təhsil və tədris prosesinə yeni elmi-texniki avadanlıqların tətbiqi, qiymətləndirmə islahatı və bu sahədəki yeniliklər, təhsilalanların və təhsilverənlərin məzmunca dəyişməsi, İKT-dən istifadənin daha geniş vüsət alması bütövlükdə təhsilin innovasiyalaşdırılmasına xidmət edir.

Təhsilin keyfiyyətinə təsir edən amillərdən biri də pedaqoji təhlildir. Onun məqsədi pedaqoji prosesin vəziyyətini aşkara çıxarmaqla onu düzgün qiymətləndirməkdən və görüləcək işləri müəyyənləşdirməkdən ibarətdir. İdarəetmənin effektivliyi təhsili idarə edənlərin pedaqoji təhlilin metodikasına necə yiyələnməsindən asılıdır. Pedaqoji təhlil düzgün aparılmazsa, bu halda vəziyyəti düzgün qiymətləndirmək, gələcək addımları düzgün müəyyənləşdirmək və yaranmış problemin optimal həlli yollarını tapmaq çətin olar. Vaxtında və lazımi səviyyədə aparılmayan təhlil idarəetmənin sonrakı mərhələlərində yanlış hərəkət etməyə, fəaliyyətin məqsədini və planını düzgün müəyyənləşdirməməyə, əsassız qərar və ya proqram qəbul etməyə gətirib çıxara bilər. Bunu nəzərə alaraq, məktəb rəhbərləri pedaqoji təhlil qabiliyyətinə yiyələnməli, pedaqoji fakt və hadisələri hərtərəfli araşdırmalı, müqayisə və ümumiləşdirmələr aparmalı, pedaqoji prosesin səmərəli idarə olunmasına nail olmalıdırlar. Bunun üçün analitik təfəkkürə yiyələnmək lazım gəlir (İsmixanov, Bəxtiyarova, 2012).

Təhsil müəssisəsini idarəetmə nəzəriyyəsi həmin müəssisənin menecment nəzəriyyəsi ilə əhəmiyyətli şəkildə tamamlanır. Məktəbi idarə edənin fəaliyyəti öz əməkdaşlarına hörmət və etibar etməklə, işdə uğur qazanmaq üçün onlara şərait yaratmaqla qurulur. İdarəetmənin mahiyyətini aşağıdakı prinsiplər tam və hərtərəfli əks etdirir:

- kollegiallıqla vahid rəhbərliyin əlaqələndirilməsi;
- idarəetmədə dövlət və ictimai əsasların əlaqələndirilməsi;
- idarəetmədə elmilik, nəzəriyyə ilə praktikanın qırılmaz qarşılıqlı əlaqəsi;
- idarəetmədə planlılıq;
- idarəetmədə sistemlilik və kompleksilik;
- idarəetmədə səmərəliliyə, yekun nəticələrə nail olmaq meyli;
- idarəetmədə mərkəzləşdirmənin və desentralizasiyanın rasional əlaqələndirilməsi;
- idarəetmədə demokratikləşdirmə və humanistləşdirmə.

## Təhsildə informasiya texnologiyalarından istifadə

Təhsil sahəsində informasiya və kommunikasiya texnologiyalarından (İKT) düzgün istifadə etmək və bu bacarıqların təkmilləşdirilməsi yollarının araşdırılması olduqca əhəmiyyətli məsələdir. Qeyd edək ki, İKT ilə bağlı biliyə mükəmməl yiyələnməyin ən optimal yolu məhz ümumi təhsildən keçir. Məktəb illərində bu texnologiyalara yiyələnmək informasiya cəmiyyəti quruculuğunda məzunların fəal iştirakını təmin edir .

İKT müstəqil qavrama qabiliyyətini təmin etmək üçün də yeni imkanlar açır. Bununla əlaqədar olaraq müəllimin rolu dəyişir: o, təhsil prosesinin konsultantı (öz ixtisasına uyğun məsləhət verən mütəxəssis) və koordinatoru (əlaqələndirici) olur. Kompüterlə aparılan dərslər daha çox yadda qalır. Multimedia vasitələri, avtomatlaşdırılmış öyrədici sistemlər, kompüter tədris proqramları, animasiya qrafikası, rəngarəng illüstrasiyalar şagirdlərin idrak aktivliyinə müsbət təsir göstərir və olimpiadalarda, müxtəlif intellektual yarışlarda göstərdikləri nəticələrin keyfiyyətini artırır. Tədris prosesində interaktiv lövhə və virtual laborator proqramlarından istifadə edilməsi dərsin əsas prinsiplərindən birini, onun əyaniliyini təmin edir. Elektron lövhənin sensorlu, yəni hissiyyatlı səthinə xüsusi qələmlə və ya barmaqla yavaşca toxunmaqla onun üzərində kompüterdə mümkün olan bütün əməliyyatları interaktiv rejimdə aparmaq olar.

Keyfiyyətin əldə edilməsində tələbə və müəllim əməyinin stimullaşdırılması da vacib amillərdəndir. Ona görə ki, tədris prosesi hazır biliklərin müəllimdən şagirdə (tələbəyə) ötürülməsi deyil, öyrədənlərlə öyrənənlər arasında əlaqəli fəaliyyət olub, öyrənənlər tərəfindən elmi biliklərin fəaliyyət prosesində istifadə qaydalarını mənimsəməkdir. Bu proses insanlığın əldə etdiyi təcrübənin öyrənənlər tərəfindən mənimsənilməsini, onların xarici və daxili fəallığının stimullaşdırılmasını və idarə olunmasını tələb edir (Məmmədzadə, 2010). Ona görə də stimullardan istifadə etmək, onu müəyyən fəaliyyətə yönəltmək lazımdır. Məqsəd heç də öyrənənin hansısa tədbirlər vasitəsilə təlimə yönəldilməsi deyil, onun fəaliyyətinin lazım olan motivlərini stimullaşdırmaqdır. Dərketmə prosesinin stimullaşdırılması buna əsaslanmalıdır. Bu zaman müəllim uşaqların ehtiyacını, tələbatlarını müəyyənləşdirə bilmirsə, aydındır ki, onların fəaliyyətini də stimullaşdıra bilməz. Təlimin stimullaşdırılması üsullarını pedaqoji nöqteyi-nəzərdən hazırlamaq üçün məktəblilərin elmlərə marağını və onlar tərəfindən mənimsənilmiş biliklərin yadda saxlanılmasını, strateji vəzifə kimi müəyyənləşdirmək lazımdır. Onu da unutmaq olmaz ki, müasir dövrdə öyrənənin tədris prosesində aldığı biliklərin heç də hamısını yadda saxlamağa ehtiyac yoxdur (Məmmədzadə, 2010).

## Beynəlxalq təhsil məkanında keyfiyyət təminatı üzrə standartlar və onların ölkəmizin təhsil sisteminə tətbiqi

Azərbaycanda həyata keçirilən islahatların əsas məqsədi təhsil sisteminin beynəlxalq standartlara uyğunlaşdırılmasıdır. Bu baxımdan, ötən əsrin 90-cı illərindən bəri respublikamız beynəlxalq təşkilatlarla sıx əməkdaşlıq edir. Onlardan biri də təhsil islahatlarının həyata keçirilməsində Azərbaycan Respublikasının tərəfdaşı olan Dünya Bankıdır. İslahatların həyata keçirilməsi aşağıdakı 3 istiqamət üzrə planlaşdırılmışdır: 1) tədris planı və proqramları, tədris və metodik dəstək; 2) müəllimlərin ixtisaslaşması; 3) layihənin monitorinqi və qiymətləndirilməsi.

Dünya Bankı ilə Azərbaycan Respublikasının Təhsil Nazirliyi arasında imzalanmış kredit müqaviləsi əsasında "2004-2009-cu illərdə Təhsil Sektorunun İnkişafı Layihəsi" əməkdaşlığın ikinci mərhələsi kimi qəbul edilmişdir. Bu layihə əhatə edir: 1) təhsilin idarə edilməsinin təkmilləşdirilməsini; 2) məktəblərin maddi-texniki bazasının gücləndirilməsini; 3) müəllimlərin hazırlanması, tədris planı, dərslik strategiyası və digər sahələri.

Prezident İlham Əliyevin 19 yanvar 2015-ci il tarixli sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında Təhsilin İnkişafı üzrə Dövlət Strategiyasının həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı" dünya təhsilinə inteqrasiya yolunu seçmiş milli təhsilimizin metodoloji əsasını özündə birləşdirən konseptual sənəddir. Bu strategiyada göstərilmiş beş mühüm istiqamət və müvafiq prinsiplər əsasında hazırlanmış "Fəaliyyət Planı" təxminən 10 il ərzində mərhələli şəkildə təhsilin əksər pillələrində milli məzmun standartlarının və kurikulumların yaradılması, ekspertizası və həyata keçirilməsini əhatə edir.

## Təhsilin keyfiyyətinin artırılmasında iştirak edən əsas tərəflərin hüquq və vəzifələri

Planlaşdırılmış işləri reallaşdırmaq üçün kontinget seçilməli, subyektin həyata keçirəcəyi tədbirlər formalaşdırılmalı, onun funksional vəzifələri müəyyənləşdirilməlidir. Subyektin üzərinə düşən vəzifələrin həyata keçirilməsi üçün o, müəyyən səlahiyyətlərə malik olmalı, bununla yanaşı onun hüquqları da müəyyənləşdirilməlidir. Bu zaman məsuliyyətin predmeti də aydın olmalı, fəaliyyətin son məhsulu və ya subyekt tərəfindən görüləcək işin növü qeyd edilməlidir, çünki o bu işin keyfiyyətinə görə məsuliyyət daşıyır. Funksional hüquq və vəzifələrdən aydın olmalıdır ki, nəzərdə tutulmuş tədbirlərin yerinə yetirilməsi və ya keyfiyyətsiz yerinə yetirilməsi digər subyektlər – öyrənənlər üçün hansı nəticələrə gətirib çıxara bilər.

İdarəçilik fəaliyyətini təşkilati baxımdan həyata keçirmək üçün aşağıdakı cədvəl köməkçi rolunu oynaya bilər (Məmmədzadə, 2010):

| Vəzifələr | Hüquqlar | Məsuliyyət |
|---|---|---|
| 1. hazırlamaq... | 1. təklif vermək... | 1. proqramın hazırlanması üçün... |
| 2. həll etmək... | 2. müəyyənləşdirmək... | 2. nəzarətin ardıcıllığı... |
| 3. nəzarət etmək... | 3. qiymətləndirmək... | 3. vaxtında təqdim edilməsi... |
| 4. öyrənmək... | 4. düzəliş etmək... | 4. işə cəlb etmək üçün... |
| 5. həyata keçirmək... | 5. tələb etmək... | 5. kriteriyaların hazırlanması. |
| 6. diqqətdə saxlamaq... | 6. məsələ qaldırmaq... | 6. təmin olunması üçün... |
| 7. hazırlamaq... | 7.yoxlamadan keçirmək... | 7. diaqnostika üçün... |
| 8. təmin etmək... | 8. həyata keçirmək... | 8. həftəlik informasiya üçün... |
| 9. təhlil etmək... | 9. nəzarət etmək... | 9. monitorinq üçün... |
| 10. tələb etmək... | 10. məsləhətlər vermək... | 10. hazırlamaq üçün... |

## Nəticə

Ümumi təcrübə göstərir ki, arzuolunan nəticə əldə etmək üçün tədrisin keyfiyyətində qarşılıqlı vəhdət olmalıdır. Yəni tədris prosesində təhsilin məzmunu, pedaqoji texnologiya və təhsilin keyfiyyətinə nəzarət amilləri arasında harmoniya varsa, tələb olunan keyfiyyəti təmin etmək olar.

İndiki dövrdə keyfiyyətin qorunması və idarə olunması yalnız ali təhsil müəssisələrinin deyil, həm də kolleclərin və ümumi təhsil məktəblərinin qarşılaşdığı əsas problemdir. Bu nöqteyi-nəzərdən istər ali məktəblərdə, istər orta-ixtisas təhsil müəssisələrində, istərsə də ümumi təhsil məktəblərində təhsilin keyfiyyəti daim diqqət mərkəzində olmalı və mühüm məsələ kimi bu işdə məsul olan şəxslər tərəfindən nəzarətdə saxlanılmalıdır.

Ölkəmizdə təhsilin keyfiyyətinin yüksəldilməsi, inkişafının təmin olunması istiqamətində bir sıra ciddi addımlar atılır. Məktəbdə müasir təlim-tədris prosesinin qurulmasında həlledici faktorlardan biri olan keyfiyyətin idarə olunması məsələsinə xüsusi diqqət yetirilir. Son dövrlərdə təhsil qanunvericiliyinə edilən dəyişikliklərin əksəriyyəti cəmiyyəti düşündürən məsələlərdir. Təhsil müəssisələrində psixoloji xidmətin təşkili, fənn olimpiadalarının qaliblərinin ali təhsil müəssisələrinə müsabiqədənkənar qəbulu, təhsilverənlərin sertifikatlaşdırılması, təqvim ilinin sonunadək altı yaşı tamam olan uşaqların məktəbə müsabiqəsiz qəbulu, eləcə də birinci sinfə qəbulun sadələşdirilməsi və elektronlaşdırılması ilə bağlı Təhsil Qanununa dəyişikliklərin edilməsi, təhsilin keyfiyyətinin yaxşılaşdırılması təhsilin stimullaşdırılması və vətəndaş məmnunluğuna xidmət edən əsas göstəricilərdəndir. Ümumiyyətlə, bu sahədə aparılan bütün islahatlar əhalinin keyfiyyətli təhsilə əlçatanlığını artırır və sosial müdafiəsini gücləndirir.

***Qeyd:*** *Məqalə Təhsil İnstitutunun dəstəyi, Təhsil İdarəçiləri Assosiasiyası və T-Network təhsil işçilərinin təcrübə və kommunikasiya platformasının təşkilatçılığı ilə 22-25 aprel 2021-ci ildə keçirilən Təhsil İdarəçiliyi Beynəlxalq Konfransında təqdim edilib.*

### İstifadə edilmiş ədəbiyyat

[1] Avropa ali təhsil məkanında keyfiyyət təminatı üzrə standartlar və təlimatlar (ESG). (2015).

[2] Əlizadə, Ə.Ə. (2008). Yeni pedaqoji təfəkkür: psixopedaqogikaya giriş. Bakı.

[3] https://www.muallim.edu.az/news.php?id=6400

4 Hüseynova, N. (2020). Keyfiyyətin yüksəldilməsində qiymətləndirmənin rolu. Elm və İnnovativ Texnologiyalar Jurnalı (12). s.39-47.

[5] İsmixanov, M., Bəxtiyarova, R. (2012). Məktəbin idarə edilməsi. Bakı.

[6] Məmmədzadə, R. (2010). Təhsildə keyfiyyət aparıcı istiqamətlərdən biri kimi. “Müəllim” nəşriyyatı. 169 s.

[7] Təhsil Problemləri qəz. (2014). 16 fevral.
[8] Lockheed, M.E., & Verspoor, A. (1991). Improving primary education in developing countries. Washington D.C Oxford University press.
[9] MoE. (2002). Education Sector Development Program (ESDP-II). Addis Ababa.
[10] Tefera, G.N. (2019). Input factors affecting education quality in general secondary schools of East Wollega zone. Gida Ayana Woreda. 67p.
[11] Voronin, A.S. (2006). Ümumi və sosial pedaqogika terminlərinin lüğəti. Yekaterinburg: GOU VPO USTU-UPI.

# XARİCİ DİL TƏLİMİ ZAMANI TƏLƏBƏLƏRİN ŞİFAHİ NİTQ BACARIQLARINI KULTUROLOJİ ASPEKTDƏ FORMALAŞDIRAN AMİLLƏR

**NATƏVAN BABAYEVA**
Bakı Slavyan Universitetinin təlim və tərbiyənin nəzəriyyəsi üzrə dissertantı.
e-mail: nata_bsu@hotmail.com
https://orcid.org/0000-0003-4574-0056

**Məqaləyə istinad:**
Babayeva N. (2021). Xarici dil təlimi zamanı tələbələrin şifahi nitq bacarıqlarını kulturoloji aspektdə formalaşdıran amillər. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 81–88

**Məqalə tarixçəsi**
Göndərilib: 20.05.2021
Qəbul edilib: 01.06.2021

**ANNOTASİYA**

Məqalədə mədəniyyətlərarası kommunikativ səriştənin tətbiqi üzrə əsas hədəfi ümumiləşdirmək və xarici dillərin tədrisində mədəni şüurun və şifahi nitq bacarıqlarının əhəmiyyətini vurğulamaq nəzərdə tutulur. Tələbələrin dünyagörüşünü inkişaf etdirmək üçün mədəni səriştəyə sahib olmaq və onları tətbiq etmək lazımdır. Qlobollaşan dünyada xalqlar və millətlər arasında kommunikasiya durmadan genişlənir. Mədəniyyət və dil müxtəlifliyinə malik dünyada mədəniyyətlərarası dialoqda yeni yanaşmalar tətbiq etmək zərurəti yaranır. Mədəniyyətlərarası kommunikasiya konsepsiyasının xarici dil dərslərinə inteqrasiya olunması hazırda mühüm şərt hesab olunur. Şifahi nitqə şəxsiyyətin və cəmiyyətin mədəniyyətinin, dil daşıyıcılarının nitq davranışının, ifadələrin qavrayışında və ötürülməsində yer alan proseslərin, tələbələrin mövcud və potensial tələbatının, dil vasitələrinin və onların nitqlə realizə olunmasının aspektləri daxildir.

**Açar sözlər:** Xarici dil, şifahi nitq, kulturoloji kommunikasiya, rol oyunu, müzakirə, strateji səriştə.

# FACTORS FORMING STUDENTS' ORAL SPEECH SKILLS IN THE CULTURAL ASPECT DURING FOREIGN LANGUAGE TEACHING

**NATAVAN BABAYEVA**
Baku Slavic University, doctoral student on the theory of training and education. Azerbaijan. e-mail: nata_bsu@hotmail.com
https://orcid.org/0000-0003-4574-0056

**To cite this article:**
Babayeva N. (2021). Factors forming students' oral speech skills in the cultural aspect during foreign language teaching. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 81–88

**ABSTRACT**

The article is considered to summarize the main target on applying the intercultural communicative competence and emphasize the significance of cultural awareness and oral skills in teaching foreign languages. It is necessary to have cultural competence and practising them to develop students' world outlook. In a globalizing world, communication between peoples and nations is constantly expanding. In a world of cultural and linguistic diversity, there is a need to apply new approaches to intercultural dialogue. The integration of the concept of intercultural communication into foreign language classes is considered to be an important condition now. Oral speech includes aspects of the culture of the individual and society, the speech behavior of language speakers, the processes involved in the perception and transmission of expressions, the current and potential needs of students, language tools and their implementation in speech.

**Keywords:** Foreign language teaching, oral speech, cultural communication, role play, discussion, strategic competence.

**Article history**
Received: 20.05.2021
Accepted: 01.06.2021

## GİRİŞ

Kommunikativ təmayüllü şifahi nitq təlimi tələbələrin təlim prosesində xarici dili uğurla öyrənməsini təmin edən, xüsusi inam yaradan, didaktik münasibətləri meydana çıxaran aktiv qarşılıqlı əlaqəni nəzərdə tutur. Şifahi nitq, eyni zamanda məzmunun düzgün və dəqiq ötürülməsinə; müzakirə olunan mövzunun – problemin məzmunundan emosional həyəcan yaratmağa; xarici dil bilən şəxslərlə fərdi və kollektiv ünsiyyətə həvəsləndirməyə; şifahi nitq prosesinə cəlb olunmuş şəxslərin mənəvi və intellektual baxımından zənginləşməsinə; şəxsi, ictimai və kütləvi ünsiyyətin formalaşmasına; pauzalarla, mimika və əl hərəkətləri ilə bağlı paralinqvistik bilik və bacarıqların formalaşmasına kömək etməlidir (İsmayılova, 2011).

Nəzəri araşdırmaların təhlili kulturoloji kommunikasiyada şifahi nitqin aşağıdakı xüsusiyyətlərini sadalamağa imkan verir:

- ikitərəfli və çoxtərəfli dialoq formaları;
- mövzuların rəngarəngliyi və danışıq obyektinin sürətlə dəyişməsi;
- hər hansı praktik vəzifənin həllinə (bilet almaq, görüş təyin etmək, gediləcək yolu aydınlaşdırmaq və s.) yönəlməsi;
- bir mövzudan digərinə təbii keçid;
- nitq tərəfdaşları üçün ümumi sosial-mədəni obyektin mütləq olması;
- səciyyəvi üslub və dil xüsusiyyətlərinə malik olan qeyri-rəsmi nitq üslubu ilə müqayisə olunması.

Xarici dil təlimini təbii ünsiyyət prosesi olaraq qəbul edən kommunikativ metodikada təlimin məqsədi şifahi nitqin müxtəlif formalarından istifadə etməkdir. Bu formaların hər birinin təlim vasitəsi müəyyən çalışmalar sistemidir. N.İ.Gez, B.A.Lapidus, A.A.Mirolyubov, İ.V.Rahmanov, V.A.Salkin kimi metodist alimlərin əsərlərində çalışma tərtib olunması ilə bağlı ümumi didaktik, psixoloji və metodik tələblər işlənib hazırlanmışdır (Baryshnikov, 2014).

Şifahi nitq təlimi zamanı strateji səriştələrdən istifadə üçün uyğun olan, tədqiqatçılar tərəfindən elmi cəhətdən əsaslandırılmış və ətraflı şəkildə şərh olunmuş tələblərə diqqət yetirək:

- təhsilalanları qarşıya qoyulmuş məqsədə nail olmağa yönəltmək;
- tələbələri əcnəbidilli kommunikatorla ünsiyyət zamanı strateji səriştədən istifadə etməyə hazırlamaq;
- təhsilalanların intellektual aktivliyini artırmaq və onların təliminə müsbət təsir göstərmək məqsədilə xarici dildə müxtəlif formalarda, şəxsiyyət baxımından əhəmiyyətli olan ünsiyyət situasiyaları yaratmaq;
- tələbələrin aktiv əqli fəaliyyətini sürətləndirmək;
- strateji səriştənin hər bir inkişaf etdirilən və təkmilləşdirilən formasında məqbul olan məqsədyönlü istiqaməti müəyyənləşdirmək;
- tələbələrin az vaxt və qüvvə sərf etməklə metodik məqsədi realizə edə biləcəyi tapşırıq növlərindən istifadəsini təmin etmək;

Qeyd olunan tələblərin çox və ya az dərəcədə effektivliyi, ilk növbədə onun yerinə yetirilməsinin intellektual aktivlik dərəcəsi ilə müəyyən olunur. Bu, kommunikativ səriştənin formalaşması üçün ayrılmış vaxtın məhdud olduğu ali məktəb şəraitində xüsusilə əhəmiyyətlidir.

## METODLAR

Biz ali məktəb tələbələrinin şifahi nitq təlimi zamanı kulturoloji aspektlərdən istifadə etməsi üçün aşağıdakı mövzular üzrə bir sıra çalışma və tapşırıqlar işləyib hazırlamışıq:

1. Meeting and Greeting people;
2. Good Manners;
3. Table Manners;
4. Public Holidays;
5. Strategies for communication by telephone;
6. Gestures and Body Language;
7. Your host family;
8. Tips on Tipping;
9. The weather;
10. Money and paying;
11. Different Situations;
12. Customs.

Belə ki, tələbələr yuxarıda göstərilən mövzular üzərində işləyərkən auditoriyada müzakirə zamanı istifadə oluna biləcək kulturoloji informasiya əldə edirlər. Fikrimizcə, tələbələrin ana dili və xarici dildə eyni fikrin ifadəsində ümumi və fərqli cəhətləri tapması məqsədilə həmin ifadələrin müqayisə edilməsinə yönəlmiş çalışmalardan istifadəsi çox əhəmiyyətlidir. Bu

həmin dil daşıyıcılarının mentalitetini, dilin ifadəlilik dərəcəsini və özəlliyini əks etdirir. Həmçinin linqvokulturoloji biliklərin əldə olunmasını, müvafiq dil materialını şifahi nitqdə adekvat şəkildə istifadə etmək bacarıq və vərdişlərinin formalaşmasını təmin edir (Harmer, 2001). Tələbələri dili öyrənilən ölkənin mədəniyyəti ilə tanış edərkən, həmin xalqların gündəlik yaşamına, ənənələrinə, davranış normalarına və hətta digər əlamətlərinə diqqət yetiririk. Digər xalqların təcrübəsini və düşüncə tərzini əks etdirən əlamətlər çox vaxt bizim xalqa məxsus olan xüsusiyyətlərlə uyğun gəlmir. Belə olduqda yadda saxlama prosesi çətinləşir. Ona görə də, əlamətlərdə fərqlər varsa, onları təhlil etmək lazımdır. Məsələn, Böyük Britaniya, ABŞ və Azərbaycanda mövcud olan davranış normalarınındakı "yaxşı'' və "pis'' xüsusiyyətləri müqayisə etmək də tələbələr üçün maraqlı olur. Təhsilalanlar bu məqsədlə təqdim olunmuş siyahı ilə tanış olur və əxlaq prinsiplərinə uyğun olaraq onların hansının nəzakət, iltifat və heyrətləndirici davranış təzahürü olduğunu qiymətləndirir. Sonra işin nəticələri auditoriyada müzakirə olunur, zərurət olduqda isə müəllim öz şərhini verə bilər. İki ölkə mədəniyyətində fərqi müəyyənləşdirmək üçün, məsələn, müəllim tələbələrə restoran və ya kafe menyusu təqdim edir və menyuda öz ölkəsində mövcud olmayan yemək növünü tapmağı tapşırır. Digər bir misal, Böyük Britaniyada məktəb cədvəlinin Azərbaycanda olan məktəb cədvəli ilə müqayisəsi kulturoloji aspektdən tələbələrin şifahi nitqinin inkişafında effektlidir .

Məlumdur ki, xarici dil tədrisində kommunikativ, dərketmə və estetik motivlərilə yanaşı, oyun motivi də istifadə olunur. Tələbələrin şifahi nitqini inkişaf etdirən kulturoloji mövzularla bağlı informasiyanın çatdırılmasının bir çox maraqlı yolları da var. Onlara misal olaraq qəzet və internet materiallarını, video və radio materiallarını, müxtəlif layihələri və s. göstərmək olar. Əgər internetə çıxış imkanı yoxdursa, onda tələbələr kitabxanalarda, yaxud Birləşmiş Krallıqdan gəlmiş yerli sakinlərdən müsahibə götürməklə tədqiqat apara bilərlər. Aşağıda adları çəkilən mövzular da belə layihələr üçün təqdim oluna bilər:

- Urban music;
- Food and cooking;
- Shopping;
- School life in the UK;
- İmmigration in the UK;
- Fashion in the UK.

Oyunlarda və oyun situasiyalarında kommunikativ çalışmalardan istifadə nitq-təfəkkür tapşırıqlarının həllinə kömək edir. Əksər hallarda oyun inamsızlıq, sıxılma əngəlinin aradan qaldırılmasını təmin edir, nitq fəaliyyətini aktivləşdirir, tələbələrin görüş dairəsini genişləndirir. Bundan başqa, təhsilalanlar müəyyən ünsiyyət elementlərinə (söhbətə başlamaq, davam etdirmək və s. bacarığı) yiyələnir (Gazeyeva, Aghabayli, Mehdiyeva, 2015).

"Rol oyunu" termini, adətən, kommunikativ çalışmalar kompleksini ifadə edir. Məsələn, hazırlayıcı suallar, izahlı mikrodialoqlar, mövzu ilə bağlı məlumatlar rol oyunu üçün giriş sayıla bilər. Onlar tələbələri disputlar, dəyirmi masa ətrafında söhbətlər kimi daha çox hazırcavablıq və sürət tələb edən mürəkkəb situasiyalarda iştirak etməyə hazırlayır.

Rol oyunları həmsöhbətlərin özünü necə aparmasına və hansı dil materialından istifadə etməsinə nəzarətin dərəcəsindən asılı olaraq dəyişir. Onların dialoqu imitasiyaya əsaslana, yaxud da vəziyyəti və yerinə yetirilməsi tələb olunan tapşırığı təsvir etmək yolu ilə yönəldilə bilər. Tələbələrin dil hazırlığı, ümumi ssenari və əsas nitq intensiyaları (kommunikativ məqsədi) nəzərə alınınanda, oyun çox asan keçirilir və nəticəsi qabaqcadan məlum olur.

Rol oyunu tələbələrdən özlərinin və ya uydurulmuş hər hansı bir şəxsin iştirak etdiyi situasiyanı təsvir etməyi tələb edir. Bəzi hallarda bu, tapşırıqda ətraflı şəkildə göstərilir, bəzən isə tələbələr özləri həqiqi olmayan rol uydurur. Situasiya və ya ssenari həm realist (məsələn, universitetdə hər hansı problemin həlli), həm də uydurma (siz detektivsiniz, tədqiqatçısınız və s.) ola, yaxud da fantaziyaya müraciət edilə bilər (siz Yer kürəsinə "gəlməsiniz"...). Rol oyunlarının bütün növləri faydalıdır, çünki onlar müvafiq olaraq real və uydurma tapşırıqlar, yaxud motivasiyanı və auditoriyada nitq fəaliyyətinin nəticəsindən məmnunluğu təmin edən maraqlı situasiyalar arasında balansı saxlayır.

Beləliklə, rol oyunu sadəcə gələcək real həyatdan bəzi situasiyaları məşq etmək deyil, həm də qeyri-ixtiyari auditoriya ilə məhdudlaşan dəyərli ünsiyyət və sual-cavablı çalışmalar, testlər, tərcümələr və s. kimi tapşırıqlar çərçivəsindən kənaraçıxma vasitəsidir. Bu oyun tələbələrdə söz ehtiyatını genişləndirir, nitq formullarını və qrammatik strukturları möhkəmləndirməyə və müxtəlif kontekstlərdə istifadə etməyə imkan verir (Kramch, 2013).

Başqa bütün nitq çalışmaları kimi, rol oyununun da son məqsədi tələbələri sürətli və yaradıcı şəkildə özünü ifadə edə bilmək prosesinə cəlb etməkdir. Bunun üçün rol oyunu vasitəsilə tələbələrin auditoriyada özünü ifadə etməkdən çəkinmədiyi, xüsusilə də utancaq tələbələrə sərbəstlik hissi gətirən dəstək atmosferi və xoş mikroiqlim yaratmaq lazımdır.

Təcrübə göstərir ki, qısa, nəzarət və ya idarə olunan rol oyunlarından başlamaq və əvvəlcə dialoqun məzmununun tam təsvirini vermək daha yaxşı olar. Daha mürəkkəb oyunlar əlavə illüstrativ materiala, məsələn, jurnallardan götürülmüş insan şəkillərinə əsaslanır. Həmin şəkillərdəki şəxslərin xarakterik xüsusiyyətləri (adı, yaşı, cinsi, peşəsi, xasiyyəti, əhvalı və mövcud situasiyaya münasibəti) göstərilən sxemə istinad etməklə iki nəfərin işləməsi üçün hazırlanır. Tələbələr əvvəlcədən həmin personajların bu və ya digər vəziyyətdə nə deyə biləcəyini də müzakirə edə bilərlər. Rola başlamazdan əvvəl müzakirə aparmaq işgüzar oyunun keçirilməsində mühüm mərhələdir, çünki tələbələr bu oyun üçün vacib olan məsələlərlə, peşə baxımından əhəmiyyətli olan vəzifələrlə və oyunun iştirakçılarından biri kimi öz vəzifəsi ilə bağlı məsələlərlə əlaqədar məlumatlı olmalıdırlar. Çalışmaları uğurla yerinə yetirməkdən ötrü təkcə bu mərhələ üçün deyil, sonrakı bütün mərhələlər üçün də gərəkli olan dil materialı əvvəlcədən seçilməli və yaxşı təşkil olunmalıdır.

Rol oyunu ilə tanış olan tələbələr üçün daha çox hazırlıq və mütəşəkillik, yerinə yetirilməsi çox vaxt tələb edən daha mürəkkəb tapşırıq hazırlana, yəni uydurma situasiyalar modelləşdirilə bilər. Məsələn, “insan ayağı dəyməyən, təhlükələrlə və çətinliklərlə dolu bir adada necə qalmaq olar”, yaxud “qəzetin birinci səhifəsini”, “reklam kampaniyasını”, “radio-televiziya verilişini necə hazırlamaq olar” kimi daha realist olan bir iş və digər bu kimi situasiyalar təşkil oluna bilər. Dialoqda iştirak edəcək tələbələr konfliktli situasiyaya cəlb oluna bilər, bundan başqa, onlar ətraf mühitin müdafiəçisi olmaq, yaxud da atom elektrik stansiyası tikmək, gözəllik müsabiqələri təşkil etmək və s. kimi diskussiyaların iştirakçısı rolunda çıxış edə bilərlər. Lakin bununla belə, uydurma situasiyalar danışanların təşəbbüskarlığını müəyyən qədər boğur, rola uyğun davranmalarını tələb edir. Rol oyunlarına nisbətən, çevikliyi və rahatlığı az olduğuna görə, uydurma situasiyalara çox vaxt sərf olunsa da, onlar hazırlıqlı auditoriyada təlimin motivasiyasına yardım edir. Həm rol oyunlarında, həm də uydurma situasiyalarda diqqətli planlaşdırma tələb olunur (Baryshnikov, 2014).

Təlimin keyfiyyətinin artırılması məqsədilə keçirilən rol oyunlarının əksər mərhələləri faydalı olsa da, onların müddəti daha mürəkkəb tapşırıqlarla (bu tapşırıqları yerinə yetirərkən tələbələr öz dialoqunu inkişaf etdirə və xarakterini daha dolğun təsvir edə bilir) müqayisədə çox qısa olur. Tələbələrin öz dil ehtiyatlarından istifadə edərək vəziyyətdən çıxmalı olduqları improvizə olunmuş rol oyununda zərurət yaranarsa, eyni rolu almış təhsilalanlar daha rəvan danışığı təmin etmək üçün (faydalı dil ifadələrini bir-birinin yadına salmaqla və ideya məsələsində bir-birinə kömək etməklə) bir yerdə hazırlaşa bilərlər. Lakin bu zaman vaxtın çoxu dialoqun təqdim olunmasına və müşahidə edənlərin şərhinə əsaslanan təhlilə sərf olunacaqdır. Ona görə də aparılan oyunu və dialoqu qiymətləndirmək üçün təhlilə vaxt çox qalmalıdır.

Kommunikativ fəaliyyətin həyata keçirilməsində tətbiq olunan üsullardan biri də müzakirə üsuludur. Bu üsul:

- konkret dialoqla bağlı ümumi ideyalar (məsələn, asan/çətin, yaxşı keçdi/çox da yaxşı keçmədi, müzakirə olunan problemlər, fayda/məmnunluq və s.);
- oyunun bütün iştirakçılarının öz rollarını necə ifadə etməsi ilə bağlı təəssüratları;
- ünsiyyətin effektivliyi (yerində olması, dəqiqliyi, rəvanlıq, kommunikativ səriştədən istifadə və s.);

- verilmiş tapşırığın vacibliyi (yeni informasiya, onun tətbiq olunmasının mümkünlüyü, faktların doğruluğu və s.);
- tələbələrin əməkdaşlıq dərəcəsi;
- müəlliminin müdaxiləsi (When? Why? What? How?);
- sosial status münasibətləri (yaşıdları ilə, özündən böyüklərlə ünsiyyət) vasitəsilə aparılır.

Şifahi nitq prosesində ifadə obyektinin seçilməsi və onun başa düşülməsi dil təmaslarına koqnitiv yanaşmanın iki əsas problemini ortaya çıxarır: 1) "Normal" ünsiyyət üçün tələb olunan bilik həcminin öyrənilməsi, müxtəlif bilik tiplərini təşkil və təmsil edən strukturların təsviri; 2) Bu biliklərin toplanmasına, saxlanmasına, ortaya çıxarılmasına, yenidən qurulmasına kömək edən proseslərin müəyyən olunması, yəni şifahi nitq prosesində biliklərdən istifadə üsullarının öyrənilməsi (Marina, 2013).

Y.N.Karaulov şəxsiyyətin verbal-semantik səviyyəsini təbii dili normal bilmə səviyyəsi olaraq müəyyən edir (Karaulov, 2016). Bu, müəyyən ünsiyyət sahələrində kommunikasiyanı həyata keçirmək üçün normal və yetərli səviyyədir. Ünsiyyət sahələri ünsiyyət fəaliyyətini həyata keçirmə motivlərinə, məqsədinə, məzmununa, formasına və dil vasitələrinə görə bir-birindən xeyli fərqlənən, tarixən formalaşmış kommunikasiya sahələridir. Burada söhbət şəxsiyyətin konkret sosial-mədəni sahədə mövcudluğu üçün özünü ifadə səviyyəsində normal dil bilmək qabiliyyətindən gedə bilər (Karaulov, 2016). İfadələrin yaranması və interpretasiyası zamanı aktuallaşan biliklər sırasına ifadələrin sosial konteksti haqqında biliklər, diskursu planlaşdırmaq, idarə etmək və bir çox başqa məsələlər daxildir.

M.Bayrama görə, strateji səriştənin reallaşması gerçəkliyi dərk etməklə başlayır və "ümumdünya transmilli təcrübəsinin" dəyərini qəbul etməklə başa çatır (Byram, 2000). Ona görə də müəllim auditoriyada gündəlik həyati situasiyaların müzakirəsini sistem halına gətirməlidir. Nitq predmeti barədə yaradılan canlı və uzunmüddətli təəssürat dinləyicinin diqqətini bir yerə cəmləşdirəcək (Byram, Gribkova, Starkey, 2002).

Dilini öyrəndiyimiz ölkəni tanıma məqsədli mətn üzərində işi elə təşkil etmək lazımdır ki, tələbənin diqqəti mətnin qavranmasına yönəlsin. "Siz dili tədris edilən ölkə barədə mətndən nə öyrəndiniz?" sualı ilə müəllim mətni konkret tapşırığa çevirə bilər. Dinləyicinin ana dilinə və mədəniyyətinə əsaslanma tələbinə riayət edilməməsi ünsiyyətin real imkanlarını xeyli aşağı salır. Bununla əlaqədar olaraq, mətndən sonra verilən tapşırıqlarda ekstralinqvistika səviyyəsində sosial-mədəni reallıqların müqayisə olunmasına stimul olub-olmadığına diqqət yetirmək lazımdır. Bu zaman mütləq "Bəs sizin ölkənizdə bu necədir?" sualı ünvanlanmalıdır.

Situativ tapşırıqlar həm müəllimlik fəaliyyətinin, həm də təbii ünsiyyətin parametrlərini əlaqələndirmək üçün nəzərdə tutulmuşdur. Belə tapşırıqlar tələbənin situasiyanı anlayaraq bu və ya digər məsələ ilə bağlı öz nöqteyi-nəzərini ifadə etməsinə imkan verir. Deməli, təklif olunan situasiyada tələbəyə tanış olmayan elementlər empatiyalar yaradacaq stimulları təmin etməlidir (Byram, 2000).

Autentik (orijinal, həqiqi) situasiyada iştirak edən tələbə təkcə ünsiyyət formasını seçmir, həm də faktiki olaraq öz şəxsi vəzifəsini yerinə yetirir, şifahi nitqin həvəsləndirici və affektiv-qiymətləndirici funksiyalarını rasional şəkildə müqayisə etmək üçün yol açır (Karaulov, 2016). Belə tapşırıqlar tələbələrdə daha sağlam şifahi nitq bacarıq və vərdişinin yaranmasına yardım edir. Xaricdə yaşayan dostundan məktub almış (dili öyrənilən ölkə barədə məqalə oxumuş, yeni filmə baxmış və s.) tələbə öz təəssüratını bölüşür, onun üçün maraqlı olan fakt barədə danışır.

Şifahi nitq yazılı nitqdən bir neçə parametrinə görə fərqlənir: burada təkrar daha çoxdur, oxşar yazılı diskurs mətnində olduğuna nisbətən daha çox öyrədici məlumat olur (situasiya ilə qarşılıqlı əlaqəyə və münasibətə əsaslanan məzmun zənginliyinə malik olsa belə), diskurs daha az strukturlaşmış vəziyyətdədir (məsələn, bir-biri ilə əlaqəsi olmayan və fraqment şəkilli strukturlar, danışıq istiqamətinin dəyişməsi), birləşdirmə üsullarını müəyyən etmək daha çətindir və s. Qavrama və anlama çətinlikləri nitqin sürəti, tanış olmayan ritmik və aksentlə bağlı strukturlar, danışanların sayı, müxtəlif aksentlər, dialektlərə məxsus olan güclü regional

vurğular, pis artikulyasiya və nitqin emosionallıq dərəcəsi ilə əlaqəli ola bilər (Marina, 2013).

Şifahi nitqin gedişində irəli sürülən tələblər baxımından da səhvlərə qarşı dözümlülük nümayiş etdirmək olar. Şifahi nitq təlimi zamanı kommunikativ əsaslı təlim materialları yaratmaq və strateji səriştədən istifadə etmək üçün ingilis metodist alimi M.Bayramın təklif etdiyi model daha məqsədəmüvafiqdir. Model dörd elementdən: daxil edilən material, məzmun, dil və kommunikativ tapşırıqdan ibarətdir (Byram, 2000).

*Daxil edilən material* – mətn, dialoq, video, diaqram və yaxud istənilən başqa kommunikativ məlumat növü ola bilər. O, fəaliyyət stimulunu təmin edir, nitqdə dil materialından, ünsiyyət üçün tematikadan düzgün istifadə etmək nümunələrinə, tələbələrin həm dil sahəsində, həm də öz ixtisasları üzrə əldə etdikləri bilik, bacarıq və vərdişlərə istinad edərək informasiya işləmək nümunələrinə malikdir (Byram, 2000). *Məzmun* – kommunikativ səriştənin formalaşması və daxil edilən materialdan yeni informasiya əldə etmək üçün tapşırıqlardan ibarətdir. *Dil* – fonetik, leksik və qrammatik bacarıqların formalaşması və təkmilləşdirilməsi üçün tapşırıqlar təqdim edir. Məşğələlərin əsas məqsədi tələbələrə ünsiyyəti formalaşdıran, onlara lazımi dil bacarıqlarına aid olan kommunikativ tapşırıqlar verməkdir. *Kommunikativ tapşırıq* isə adından da göründüyü kimi, təhsilalanları kommunikativ tapşırığı həll etməyə hazırlamaq üçün istifadə olunur. Bunun üçün mövzunu keçərkən öyrənilmiş və formalaşmış bütün bilik, bacarıq və vərdişlərdən istifadə etmək lazım gələcək. Tapşırığın həcmi böyük deyilsə, yaxud bir neçə dərsi əhatə edirsə, hər mərhələni bir dərsdə tətbiq etmək olar. Beləliklə, tələbələrdə dili öyrənmək üçün müsbət motivlər yaranar və onlar həvəslə təlim fəaliyyətində iştirak edərək, bir-biri ilə qarşılıqlı əlaqədə olar. Bu, strateji səriştədən effektiv istifadə etməyə, habelə kommunikativ tapşırığı uğurla həll etməyə də yardım edir (Kramch, 2013).

Təlimin məzmunu onun mərhələsindən, təhsilalanların mövzunu qavramasından və yaşından asılıdır. Biz strateji səriştənin reallaşmasında tələbələrə təlim materiallarının üç əsas təsir sahəsini önə çəkirik: koqnitiv (idraki), sosial, emosional. Təlim materiallarından şifahi nitq təlimi vasitəsi kimi istifadə edərkən bütün bu təsir sahələri nəzərə alınmalıdır. Məsələn, koqnitiv sahədə maksimal inkişafetdirici effekt əldə etmək üçün tələbənin yaşı və diqqətlilik dərəcəsi mütləq nəzərə alınmalıdır. Sosial sahədə tələbənin sosial rollarla tanış olduğu, araşdırdığı və öyrəndiyi sosiallaşma amili çox mühümdür. Emosional təsir sahəsində isə bir faktı qeyd etmək lazımdır ki, bu təsirin intensivliyi əksər hallarda tələbənin fərdi-şəxsi xüsusiyyətlərindən, habelə materialın forma və məzmunundan asılıdır. İstənilən halda şifahi nitq təliminin uğurlu olması üçün intellektual gərginlikdən asılı olan emosional təsirin motivasiya aspekti xüsusi əhəmiyyət kəsb edir (Safonov, 2014).

Şifahi nitq bacarıq və vərdişlərinin formalaşması üçün auditoriya fəaliyyətinin təşkilində kooperativ metoddan istifadə edilməsi də məqsədəuyğundur. Kooperativ təlim qrup formasında iş əsasında aparılır və bu zaman ümumi məqsədə nail olmaq komanda halında işləyən tələbələrin müştərək səylərindən asılıdır. Təlimin bu cür təşkilində təhsilalanlar bütün komanda üçün ümumi məqsədin qarşıya qoyulması, vəzifələrin bölüşdürülməsi, materialın ümumiliyi, rolların paylanması, qoyulmuş tapşırıqların yerinə yetirilməsinə görə mükafatlandırma yolu ilə yaranan qarşılıqlı asılılığı dərk edir. Komanda halında çalışan hər bir tələbə materialın öyrənilməsinə və tətbiqetmə bacarığına görə fərdi məsuliyyət daşıyır. Bu zaman onun yaşından, sosial vəzifələrindən və fərdi xüsusiyyətlərindən asılı olan ünsiyyət bacarığının formalaşmasına xüsusi diqqət yetirilir. Kooperativ təlim ünsiyyət üzərində qurulduğuna görə ondan istifadə xarici dil dərslərində kifayət qədər effektli olur.

Daha çox müəllim-tələbə, frontal sual-cavab formasında keçirilən ənənəvi dərs zamanı təhsilalanların xarici dili aktiv tətbiq etmək üçün vaxtının az olduğunu nəzərə alaraq, kooperativ metoddan istifadə etməklə, tələbələrin vaxtın daha çox hissəsini xarici dildə danışmasına imkan yarada bilərik. Təhsilalanların bir çoxu qeyd edir ki, səhvə yol vermək qorxusu şifahi nitq zamanı xarici dil biliklərini düzgün tətbiq etməyə imkan verir. Komanda halında çalışanda tələbələr sıxıntı hiss etmir, çətinlik yarandıqda

isə komanda üzvləri kömək edir. Tələbə qrupu dörd nəfərlik komandalara bölünür, hər komandaya bir rəhbər təyin olunur. Müəllimin vəzifəsi isə ünsiyyətin təbii şəraitdə dəfələrlə təkrar olunması üçün aşağıdakı formada situasiya yaratmaqdır:

- təlim materialındakı çalışmaları iki nəfər birlikdə yerinə yetirir və tapşırığın hər bəndindən sonra komandasında öz variantının uğunluğunu yoxlayır ;
- verilmiş sual bütün komanda tərəfindən müzakirə olunur, cavabı isə müəllimin müəyyən etdiyi tələbə verir;
- tapşırığı yerinə yetirdikdən sonra tələbələr komandalarda oxşar tapşırıqlar (dialoqlar) hazırlayır və onları başqa komandalarla dəyişirlər;
- situasiyaları birlikdə müzakirə edirlər (bu zaman qrupdakı tələbələrdən hər biri növbə ilə cümləni səsləndirir, digəri bu cümləni yazır, ümumiləşdirici cavabı da həmin komandadan olan tələbə verir);
- verilmiş mövzu üzrə rolları tərtib edərkən hər bir tələbə "zəncir" boyu lazımi ifadə hazırlayır (rolların dil vasitələri ilə doldurulması bu yolla baş verir).

Təcrübə göstərir ki, tələbələr tapşırıqları yuxarıdakı ardıcıllıqla yerinə yetirərək şifahi nitq bacarıq və vərdişləri formalaşdıran kommunikativ səriştəni daha effektiv formada möhkəmləndirirlər.

## NƏTİCƏ

Biz yerli və xarici elmi-metodik ədəbiyyatlarda təklif olunan şifahi nitq situasiyalarının təhlili əsasında ümummədəni bacarıq və vərdişlərin inkişaf etdirilməsinə yönəlmiş nitq məqsədlərinin tipologiyasını təhlil etdik. Apardığımız təhlillərə və müşahidələrə əsasən demək olar ki, təlim-öyrənmə fəaliyyətinin spesifik növü olan şifahi nitq: 1) həm ümumi, həm də konkret fəaliyyət məqsədi ilə; 2) onun hər bir formasına xas fəaliyyəti yerinə yetirmə vasitələri ilə; 3) müəllim tərəfindən daimi nəzarətlə xarakterizə olunur. Deməli, şifahi nitq istənilən məqsədyönlü fəaliyyətin funksional cəhətdən bir-birindən asılı olan üç komponentini yerinə yetirir: istiqamətverici (məqsədə çatmaq üçün hərəkətin xarakterinin aşkara çıxarılması), icraedici (fəaliyyəti yerinə yetirmə üsulu), nəzarətedici və reflektiv (əks-əlaqə). Şifahi nitq bacarıq və vərdişlərini formalaşdıran strategiyanın əsas vəzifəsinə isə bunlar aid edilir: marağın artırılması, biliklərin dərinləşdirilməsi, praktik şifahi nitq bacarıq və vərdişlərini təkmilləşdirilməsi; tələbələrin intellektual və psixoemosional vəziyyətinin optimal idarə olunması; tələbələrin mədəniyyətlər dialoqunda şifahi ünsiyyətə hazırlığının optimallaşdırılması.

### İstifadə edilmiş ədəbiyyat


1 Gazeyeva, M.Y., Aghabayli, V.E., Mehdiyeva, S.M. (2015). "Culture and Communication". "Elm və təhsil", 252 s.

2 Ismailova, D.A. (2011) ."Teaching English as a Foreign Language". Bakı, Mütərcim, 319 s.

3 Baryshnikov, N.V. (2014). Obucheniye inostrannym yazykami kul'turam: Metodologiya, tsel'. Metod // inostran. Yazyki v shkole – №9, p 2-9.

4 Byram, M. (2000). Teaching and Assessing İntercultural Competence in Language Teaching Sprogforum. No 18– Vol 6.

5 Byram, M., Gribkova, B., Starkey, H. (2002). "Developing the İntercultural Dimension in Language Teaching" Council of Europe.

6 Harmer, J. (2001). "The Practice of English Language" Longman. vol 310.

7 Karaulov, Y.N. (2016). Metodika obucheniya studentov yazykovogo vuza interkul'turnomu rechevomu obshcheniyu na angliyskom yazyke: Baku, 46 s.

8 Kramch, C. (2013). "Context and Culture in Language Teaching". Oxford UK 1.

9 Marina, O.A. (2013). Aksiologicheskiye Osnovy Obucheniya nostrannykh yazykov v shkole. №3 p40-46.

10 Safonov, V.V. (2014). "Sotsiokul'turnyy podkhod: Osnovnyye sotsial'nyye pedagogicheskiye i metodicheskiye polozheniya // Inostr. Yazykiv shkole –№ 116.2 p2-13.

11 Sysoyev, P.V. (2015). Kommunikativnogo – etnograficheskiy podkhod k obucheniyu inostrannomu yazyku i kul'ture: Novyye zadachi i novyye vozmozhnosti v KHKHI veke // inostr. yazyki v shkole – №1, p9-21.

# XVI-XIX ƏSRLƏRDƏ QARABAĞIN ƏNƏNƏVİ TƏHSİL OCAQLARI

**ƏKBƏR N. NƏCƏF**
Orta əsrlər ümumi Türk tarixi tədqiqatçısı. Azərbaycan, Bakı.
e-mail: ekbernecef@gmail.com
https://orcid.org/0000-0003-4075-0300

**Məqaləyə istinad:**
Nəcəf Ə. (2021). XVI-XIX əsrlərdə Qarabağın ənənəvi təhsil ocaqları. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 89–95

**ANNOTASİYA**

XIX əsrdə Rusiyanın nəzarəti altındakı bütün müsəlman-türk ölkələrində olduğu kimi Qarabağ bölgəsində də mərhələli müasirləşmə prosesi başlandı. Bu özünü, ilk növbədə təhsil sahəsində göstərirdi. Çar Rusiyasının işğalından sonra Azərbaycanda açılan rus-tatar məktəbləri ilə başlayan müasirləşmə prosesi daha sonra *cədidçilərin* açdıqları milli xarakterli məktəblərlə davam etdirildi. Nəticədə, XX əsrin əvvəllərində Qarabağda kifayət qədər təsirli intellektual kütlə formalaşdı ki, onlar da Azərbaycanın mədəni-ictimai həyatında mühüm rol oynadılar. Tarix boyu Qarabağ bölgəsi təlim-tərbiyə mərkəzlərinə sahib olub. XVI-XIX əsrlərdə fəaliyyət göstərən bu mərkəzlər Qarabağın elmi-mədəni, sosial-ictimai inkişafında böyük rol oynayıblar. Rus işğalından sonra da mövcudluğunu davam etdirən həmin ənənəvi təhsil ocaqları Qarabağda elm adamları və ədiblərlə birlikdə çoxlu sayda sənətkar da yetişdirib.

**Açar sözlər:** Təhsil, vəqf, məktəb, mədrəsə, məscid.

**Məqalə tarixçəsi**
Göndərilib: 15.05.2021
Qəbul edilib: 31.05.2021

# TRADITIONAL EDUCATIONAL INSTITUTIONS OF GARABAGH IN THE XVI-XIX CENTURIES

**AKBAR N. NAJAF**
General Turkish historical researcher of the Middle Ages.
Azerbaijan, Baku. e-mail: ekbernecef@gmail.com
https://orcid.org/0000-0003-4075-0300

**To cite this article:**
Najaf A. (2021). Traditional educational institutions of Garabagh in the XVI-XIX centuries. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 89–95

**Article history**
Received: 15.05.2021
Accepted: 31.05.2021

**ABSTRACT**

In the 19th century, the Garabagh region, like all Muslim-Turkish countries under Russian control, underwent a gradual process of modernization. This process manifested itself primarily in the field of education This process, which began with the Russian-Tatar schools opened in Azerbaijan after the occupation of Tsarist Russia, was continued with the national schools opened by the Jadids. As a result, at the beginning of the twentieth century, a highly influential intellectual group was formed in Garabagh, which made its presence felt in the cultural and social life of Azerbaijan. Throughout history, there have been training centers in the Garabagh region. These centers, operating in the XVI-XIX centuries, played an important role in the scientific, cultural, social and public development of Garabagh. These traditional educational institutions, which continued to exist even after the Russian occupation, trained many artists in Garabagh along with scientists and writers.

**Keywords:** Education, foundation, school, madrasa, mosque.

## GİRİŞ

Qarabağ adı haqqında açıq məlumatlar XIV əsrdən sonra Elxanlı dövrü (1258-1359) haqqındakı mənbələrində yer alır. Tarixi Aran (Arran, ər-Ran) ərazisinin bir parçası olan, Elxanlı dövründə yaşamış tədqiqatçı Həmdullah Qəzviniyə istinad edən rus şərqşünas V. Bartolda görə, Aranın cənub hissəsini əhatə edən və karvan yollarının keçdiyi bu bölgə türkcə Qarabağ adı ilə qeyd edilməyə başlanmışdır (Kazvini, 1919; Bartold, 1965). IX əsr müsəlman müəlliflərindən Bəlazuri bu bölgə üçün "əl-Bağ" adını istifadə etsə də, ərazinin Qarabağ olaraq təsvir edilməsi monqollar dövrü ilə bağlıdır (Nesirov, 2017).

Bölgə haqqında əhatəli coğrafi təsvirlər "Qarabağnamə" müəlliflərinin əsərlərində yer alır. Mirzə Camal Cavanşir "Qarabağnamə"sində yazdığına görə, "Qarabağ vilayətinin sərhədi belədir: cənub tərəfdən Xudafərin körpüsündən Sınıq körpüyə qədər – Araz çayıdır. İndi (Sınıq körpü) Qazax, Şəmsəddin və Dəmirçi-Həsənli camaatı arasındadır. ...Şərq tərəfdən Kür çayıdır ki, Cavad kəndində Araz çayına qovuşaraq gedib Xəzər dənizinə tökülür. Şimal tərəfdən Qarabağın Yelizavetpolla sərhədi Kür çayına qədər – Goran çayıdır və Kür çayı çox yerdən keçib Araz çayına çatır. Qərb tərəfdən Kuşbək, Salvartı və Ərikli adlanan uca Qarabağ dağlarıdır" (Qarabaği, 1989). Mir Mehdi Xəzani də Qarabağ adını "türki istilahi" qəbul edir (Xəzani, 1991).

XVIII əsr Osmanlı sənədlərində bölgə "Gəncə-Qarabağ əyaləti" adı ilə qeyd edilir ki, bu da Səfəvilər dövründə Azərbaycanda aparılmış *bəylərbəyilik* adı altında bir inzibati vahid olduğuna işarədir (Bekadze, 2017). Nadir şahın ölümündən sonra Qarabağ xanlıq olaraq formalaşmış və varlığını rəsmi 1806-cı ilə qədər, qeyri-rəsmi isə 1822-ci ildə Mehdiqulu xanın Qarabağı tərk edib Qacar sarayına qaçmasına qədər davam etdirmişdir. Buna baxmayaraq, xanlıq mirası uzun müddət qorunmuş, Qarabağ xan ailəsinə mənsub olanlar öz ənənəvi titullarını daşımışlar.

Qarabağ 1813-cü il Gülüstan və 1828-ci ildə Türkmənçay sülh müqavilələrindən sonra Azərbaycanın digər xanlıqları ilə birlikdə Rusiyanın nəzarəti altına keçmişdir. Bu tarixi hadisə mərhələli olaraq bölgənin sonrakı gələcəyinin müəyyənləşməsində təsirli olmuşdur. Ən mühüm hadisə isə Rusiya tərəfindən Qarabağa erməni əhalisinin yerləşdirilməsi idi.

XIX əsrdə Qarabağ bir sıra siyasi, sosial dəyişikliklərlə bərabər mədəni-maarif sahəsində də yeniliklər yaşadı. Xüsusilə də ənənəvi təhsil müəssisələrinin yerini Qərb tipli təhsil məkanlarının alması Qarabağın ictimai-mədəni ab-havasını da dəyişdirdi. Şübhəsiz, bu dəyişikliklər özünü mərhələli olaraq büruzə verdi, bəzən də iki təhsil sistemi arasında qarşıdurmalar yaşanmasına səbəb oldu. Nəticədə, XX əsrin əvvəlində Qarabağda yetişən çox sayda ziyalı Azərbaycan mədəni mühitində təsirli olmağa başladı.

Müasir təhsil anlayışı ortaya çıxana qədər Qarabağın özünəməxsus təhsil anlayışı və məslək (sənət, peşə) öyrənmə sahələri mövcud idi. Müsəlman Şərqinə xas belə təlim-tərbiyə ocaqları bölgənin özünün sahib olduğu dini-ictimai, sosial, iqtisadi və mədəni ehtiyaclara görə formalaşmışdı.

## ŞEYX SİRACƏDDİN VƏQFİYYƏSİ

Qarabağ Gəncə-Qarabağ bəylərbəyiliyi tərkibində olduğu dövrlərdə içində bir sıra təhsil müəssisələri də olan vəqflərə sahib idi. Bu vəqflər mülk, bağışlanma, dini və icmai qaydalarda bəzən miras, bəzən də pay olaraq ortaya çıxmış ənənəvi müsəlman fond sistemini təşkil edirdi. Vəqflərin öz qeyd dəftərləri, hesabları, nəzarət və idarəetmə tərzi olurdu. İslam tarixində ilk vəqflər IX əsrdən etibarən ortaya çıxıb, sürətlə yayılmışdır.

XVI əsrdə Qarabağda fəaliyyət göstərən belə vəqflərdən biri Şeyx Siracəddin vəqfiyyəsi idi. Bu mötəbər şəxs Cabir Ənsari övladlarından Şeyx Kəmaləddinin oğlu idi. Şeyx Siracəddin Cəlayirli hökmdarı Şeyx Uveys Bahadır (1356-1374) dövründə yaşamış və vəqf haqqı həmin sultan tərəfindən təsdiq edilmişdir. Siracəddin vəqfiyyəsinin təmlikləri (mülk sənədləri) daha sonra Qaraqoyunlu Cahanşah, Ağqoyunlu Həsən

padişah, sonuncu dəfə isə Osmanlılar tərəfindən olduğu kimi qeydə alınıb. Osmanlı sənədlərində Dizak, Arasbar, Haqqari nahiyələrində 4 kənd və 4 məzra, yəni Dizak nahiyəsinə aid Şeyxli kəndi ilə yanaşı Sərsəbil, İlgöçür, Ərdək və Qulsəfak məzraları Şeyx Siracəddin vəqfinə məxsus göstərilib (Mehmedov, 1993).

Şeyx Siracəddin vəqfi "miras" vəqfi hesab edilirdi. Osmanlı tapu-təhrir sənədləri arasında 1593-cü ilə aid Şeyx Siracəddin vəqfiyyəsinə dair bir sənəd mövcuddur. Sənəddə dövrün osmanlı türkcəsi ilə belə yazılıb:

*"Evkafi-əmlak dər vilayəti Gəncə-Qarabağ.*

*Nahiyəi-Dizak dər vilaəti-məzbur*

*Əvkafi-mərhum Şeyx Siracəddin ibn Şeyx Kəmaləddin an övladi-həzrəti-Cabir Ənsari-rada Allahanhu.*

*Qariyəi-Şeyxü maa məzraa-i Sərsəbil və İlgöçür və Ərvak və məzraai-Qulsəfak tabii-məzbur. An əvkafi-mərhum Şeyx Siracəddin Ənsari-rahama Allah aleyhi. Əlbadi vəqfi-övladi əl-məzkur bər mucəbi-vakfnamei səlatin mazidən Akkoyunlu padişahlarından Hasan padişah və Cahanşah və Şeyx Üveys Bahadır handan əllərində təməssükləri olub vəqfi-övladiyyət üzərə tasarruf olunur. Haliya dəxi bər mucəbi-əmri-ali üslubi-sabıq üzərə vəqfi-övladiyyət üzərə tasarruf olunmaq üçün sıbti-dəftər olundu.*

*Qariyəi-Diri, tabii-Arasbar, an evkafi-mərhum Şeyx Siracəddin ibn Şeyx Kəmaləddin.*

*Hasil: iki yaşdan*

*Qariyəi-Kəvzir, an vəqfi-müşarünileyh əl-məzbur dər livai-Kaqqari,*

*Hasıl: iki yaşdan*

*Qariyəi-Xanadazor dər livai-Dizak, an evkafi-müşarünileyh el-məzbur*

*Hasıl: iki yaşdan"* (Büniyadov, Mamedov, 1990; Mehmedov, 1993).

Şeyx Siracəddin miras vəqfi olsa da, bir dərgah ətrafında toplanmış kənd və əraziləri əhatə edirdi. Bir təsəvvüf şeyxi olan Şeyx Siracəddin vəqfi ətrafında dərvişlərin və sufilərin cəmləşdiyi və onların Qarabağ bölgəsində irşadla məşğul olduqları Cəlayirlərdən Osmanlılara qədər uzun müddət etibar görmələrindən məlum olur.

Şeyx Siracəddin dərgahı daha sonra ailə mirasına çevrilmiş və vəqfləşmişdir. Təəssüflər olsun ki, bu vəqfin çalışma prinsipləri haqqında məlumatlar yoxdur. Ancaq dövrün digər vəqfiyyə modellərini diqqətə alsaq, vəqfin xanə və insanlara xidmət etdiyi məlumdur. Xanlıq dövründə də dərgah ətrafında seyidlər və dərvişlərin toplandığını ehtimal etmək mümkündür.

## ŞƏYİRDXANƏLƏR

Osmanlılara aid 1727-ci il tarixli rəsmi sənədlərdə Qarabağ bölgəsində çox sayda sənətkar emalatxanasının fəaliyyətindən bəhs edilir. Gəncə-Qarabağ əyalət dəftərlərinə görə bölgədə boyaq, sabun bişirmə, şam istehsalı və dəriçiliklə məşğul çox sayda belə emalatxana mövcud idi (Gence-Qarabağ, 2000).

| Emalatxanalar | Vergi forması | Gəliri |
|---|---|---|
| boyaxana | iltizam | 132 min ağça |
| sabunxana | iltizam | 36 min ağça |
| şamxana | iltizam | 36 min ağça |
| dabbaqxana | iltizam | 24 min ağça |
| qəhvəxanə | iltizam | 12 min ağça |

Bu müəssisələr ənənəvi şəyirdlik sisteminə görə çalışırdılar. Başında usta, çıraq və şəyirdlərinin olduğu belə emalatxanalar şərq üslubunda məslək öyrənmə məkanları hesab olunurdu. Onlardan boyaxanalarda boyaq hazırlayanlara *sabbağ* adı verilirdi. Boyağın hazırlandığı yer isə *masbağa* adlanırdı (Bekadze, 2017).

Məlum olduğu kimi, Qarabağ Azərbaycanın təbii gözəlliyi ilə diqqəti cəlb edən, zəngin fauna və floraya malik bölgəsidir. Bitki növlərinin fərqliliyi və bolluğu burada boyaq emalının inkişafına təkan vermişdir. Osmanlılar bölgəni ələ keçirdikdən sonra Qarabağ boyalarının keyfiyyətini yaxşı qavradıqları üçün buradakı boyaxanaların fəaliyyətinə imkan yaratmış, onların siyahısını və gəlirlərini hazırlamışdılar. O dövrdə saxta boyaqlara "qəlp", keyfiyyətli

boyaqlara isə “yaxşı boya” adı verilirdi. Sənədlərdə XVIII əsrdə Gəncə-Qarabağ bölgəsində 21 boyaxananın fəaliyyət göstərdiyi qeyd edilir. Həmin boyaxanalarda əldə edilən illik qazanc 6.300 ağça idi. Xüsusilə də Gəncə-Qarabağ *qızıl* boyağına böyük tələbat vardı. Həmin boyaxanalar aşağıdakı kəndlərdə yerləşirdi (Bekadze, 2017).

| **Boyaxana yerləri** | **sayı** | **Gəliri** (ağça) |
|---|---|---|
| Yuxarı Bayan | 2 | 600 |
| Quşçu | 1 | 300 |
| Korlar | 1 | 300 |
| Sərxoş | 1 | 300 |
| Daşkəsən | 1 | 300 |
| Dəstəyur | 2 | 600 |
| Zənzəhal | 4 | 1200 |
| Gedəmiş | 4 | 1200 |
| Qara bulaq | 2 | 600 |
| Qalakənd | 1 | 300 |
| Çanakçı | 1 | 300 |

Boyaqçılıq ailə məsləyi idi. Bəzən bir ailə bütün fərdləri, bəzən də sabbağın (boya ustasının) öz ətrafında çıraq və şəyirdləri toplaması ilə fəaliyyət göstərən bu emalatxanalar ənənəvi ixtisas ocaqları hesab olunurdu. Belə yerlərdə qadınların çalışması da labüd idi. Hansı bitkinin keyfiyyətli olması, boya maddəsi olaraq yararlılığı botanika elminə aid qazanılmış biliklər sayəsində əldə edilirdi. Buna görə də, bu ixtisasa yiyələnmək istəyənlərin hələ uşaq yaşlarından təcrübə toplaması vacib hesab olunurdu. Yəni boyaçılıq müəyyən təhsil tələb edirdi ki, Qarabağ bölgəsində bu məsləyi icra edənlər həmin emalatxanalarda müvafiq bilik əldə edirdilər.

Gəncə-Qarabağ bölgəsində geniş yayılmış peşələrdən biri də dəriçilik idi. Dabbaqxana adlandırılan bu yerlər müxtəlif heyvanların dərilərinin işlənilib hazırlandığı emalatxanalar idi. Qarabağ bölgəsi heyvandarlıq üçün ən əlverişli məkan olduğundan dəriçiliyin burada intensiv yayılan peşə olduğu aydındır. Bu emalatxanalarda, əsasən, qoyun, quzu, keçi, at və inək dərisindən dəri çəkmə, ayaqqabı, başmaq, müxtəlif tərzlərdə hazırlanan papaq və geyimlərin hazırlanmasında istifadə olunurdu.

Gəncə-Qarabağ bölgəsində fəaliyyət göstərən emalatxanalar arasında sabunxanaların olması diqqəti cəlb edir. Əsas təmizlik maddəsi olan sabun həmin dövrdə, əsasən, Gəncədə hazırlanırdı. İltizam üsulu ilə işlədilən sabunxanaların illik gəliri 36 min ağçaya bərabər idi (Bekadze, 2017).

## MƏKTƏBLƏR VƏ MƏDRƏSƏLƏR

Qarabağın daxil olduğu Aran coğrafiyasında çox sayda qədim şəhərlər mövcud olmuşdur. 1647-ci ildə bölgəni ziyarət edən məşhur türk səyyah Övliya Çələbi XVI-XVII əsrlərdə mövcud olmuş Kiçik Qarabağ şəhərindən bəhs edir. Onun verdiyi məlumatdan belə aydın olur ki, Qarabağ şəhəri Qarabağ Sultanlığı adlanan inzibati-idarəçiliyin mərkəzi olub:

Kiçik Qarabağ şəhəri “Azərbaycan şəhərlərindən olub ilk banisi ... şahdır. Qarabağ qalasını (1583-1586-cı il tarixində) Ərgənin fatehi Sultan Məhəmməd vəzirlərindən olan qüdrətli Qoca Fərhad paşa uçurmuşdur. Hazırda bu binanın qalıqları ara-ara görünməkdədir. O zamandan sonra bərpa olunub ... il tarixində Sultan IV Murad xan Vanı fəth edib bu diyara gəldikdə bu şəhəri yenə uçurub dağıdıb; hələ də tikilməkdədir. Qarabağ Təbir hüdudunda ayrıca bir sultanlıqdır. 1000 əsgərə malikdir. Kələntəri və daruğası, münşisi və minbaşısı, dizçökən ağası vardır. Qalanın şəhəri geniş düzənlikdə İrəm bağına bənzər 3000 evli, 7 məscidli, 7 hamamlı, 3 xanlı, 600 suqi-sultanili şirin bir şəhərdir ki, abad bir vilayətdir. Əkin yerlərinin torpağı münbitdir. Qadın və gəncləri məhbub və mətlubdur. Xeyir-bərəkətli, verimli zəmiləri olan abad bir şəhərdir. Lətif abu-havası və bol sulu, saf çayları, axar çeşmələri vardır. Ucsuz-bucaqsız çölləri və düzlərinə bağ və bostanlar zinət qurmuşdur. Ləziz, sulu şəhriban narına bənzər narı olur. Xüsusən adam kəlləsi böyüklükdə heyvası məşhurdur. Hər yerdə suları yerin altından kəhrizlər ilə axır. İyul ayında buz kimi saf suları vardır.

Qədim üsulla tikilmiş cameləri, məscidlərinin qübbələri sivri-sivri inşa olunub sünbül, silu, nilgün kaşılar ilə örtülüdür. Cəmi 11 minarə görünürdü. Amma şəhər sakinləri "70 mehrabdır" deyə cavab veriblər. Əhalisi şəhəri təmir etmələri səbəbilə bütün təkalifi-örfiyyədən (vergidən) azaddırlar. Ancaq İran torpağının şahına (Səfəvilərə) hər il 100 dəvə yükü ordubarı, mələçə, abbası armudu qurusu, alunçara, zərdalu, qaysalu, əncalu, üzüm qurusu və neçə dadlı məhsullar göndərirmişlər. Nəhayət, Azərbaycan vilayətində üç ədəd Qarabağlar var ki, hər biri cənnət bağçası olan rövzəyi-rizvandan nişan verir" (Çelebi, 2012).

Övliya Çələbinin verdiyi bu məlumat Qarabağda şəhər tipli qalaların mövcudlğunu təsdiq edir. Qeyd edilən şəhərdə came və məscidlərin olması burada klassik müsəlman təhsil ocaqlarına da işarədir.

Qarabağ xanlığı formalaşdığı dövrdə xanlığın əsas əhalisini qarasuvaylar, taxtaqapı, cavanşir, otuzikili və kəbirli el və oymaqları təşkil edirdi. Ayrıca, bölgədə kolanlı, çinli, kəngərli kimi köklü tayfalar da məskunlaşmışdır (Qarabaği, 1991).

Qarabağ xanlığı formalaşdıqdan sonra onun inzibati mərkəzi bir neçə dəfə dəyişdirilmiş, Bayat və Şahbulaqdan sonra mərkəz Şuşa seçilmişdir. Şuşa şəhəri, əsasən, Mehirli, Qazançılı, Əylisli, Çiləbörd Dərə, Aşağı məhəllə, Qurdlar, Culfa, Quyuluq, Çuxur məhlə, Hacı Yusifli, Mərdinli, Cuhudlar, Saatlı, Mamayı, Xoca Mərcanlı, Çölqala və Hamamarası məhəllələrindən ibarət idi (Qarabaği, 1991). Əvvəllər Pənahabad adlanan şəhərdə məscidlər və mədrəsələr fəaliyyət göstərirdi. Ehtimal ki, mədrəsələr məscidlərin tərkibində yer alırdı. Qarabağda mədrəsə və məktəblər öz fəaliyyətlərini rus işğalından sonrakı illərdə də davam etdiriblər. XIX əsrin 30-cu illərinə aid məlumatlara görə, Şuşada və Qarabağ əyalətlərində 9 məktəb və 1 mədrəsə mövcud idi. Onlardan 6 məktəb və 1 mədrəsə, sadəcə Şuşa şəhərinin payına düşürdü. Həmin məktəb və mədrəsələrdə 143 şagirdin oxuduğu qeyd edilir. Geri qalan 3 məktəb isə Əlidərə, Nuadı və Boyəhmədli kəndlərində yerləşirdi (Əhmədov, 2006). Şuşanın hər məhəlləsində ayrı-ayrı evlərdə birotaqlı məhəllə məktəbləri və mollaxanalar da fəaliyyət göstərirdi. Həmin məktəblərdə türk, ərəb və bəzən də fars dillərində oxu və yazı öyrədilirdi. Şəriət qaydaları, kəlam, Quran, əsasən, ərəbcə tədris olunarkən, hesab, astrologiya və tibb türk və ərəb dillərində, şeir isə fars dilində keçilirdi.

XIX əsrdə Azərbaycanda müasir tipli məktəblərin çoxalmasına baxmayaraq, ənənəvi təhsil üsuluna maraq azalmamış, əksinə, XIX əsrin axırlarında belə məktəblərin sayının daha da artdığı müşahidə edilmişdir. 1859-cu ildə Şuşada 10 məscid məktəbi mövcud idi. Həmin məktəblərdə oxuyan şagird sayı 280-ə çatırdı. Məktəblərdə oxuyan şagirdlərin sayı isə 16-51 arasında dəyişirdi. Tədris əvvəlki qaydada ərəb, türk və fars dilində aparılırdı (Əhmədov, 2006). Qeyd edilən dövrdə Şuşa qəzasının kəndlərində də məktəb sayında artım müşahidə olunmuş, onların sayı 18-ə çatmışdı. Maraqlıdır ki, kənd məktəblərindəki tədris, əsasən, türk və fars dillərini əhatə edərkən, ərəbcə şəriət dərsləri haqqında məlumat verilmir. Kənd məktəblərində oxuyan şagirdlərin sayı da az deyildi. Rus rəsmi sənədlərində Şuşa qəzasının kənd məscidlərində 474 şagirdin oxuduğu qeyd edilib. Məktəblərdəki şagirdlərin sayı isə 11-53 arasında dəyişirdi.

Qarabağın çox güclü musiqi və şeir ənənəsi olduğunu nəzərə alsaq, şagirdlərin ədəbiyyata həvəsli olduqlarını, Şərq klassiklərini məktəblərdə oxuyub öyrəndiklərini təbii qəbul etmək olar. İ.Şopenin 1837-ci ildə etdiyi qeydlərin Qarabağ üçün əlamətdar olduğu da məlumdur: "Gənclər bədii ədəbiyyatla daha çox maraqlanırlar, bəziləri Rudəki, Firdovsi, Ənvəri, Nizami, Cami, Hafiz, Sədi və digər məşhur söz ustadlarının əsərlərini əzbərləyirlər" (Əhmədov, 2006).

Şübhə yoxdur ki, bu məktəb və mədrəsələrin hamısının eyni qaydada və eyni elmi səviyyədə tədris vermədikləri məlumdur. Xüsusilə də XIX əsrdə ənənəvi təhsilə ciddi nəzarət olmadığından tədris metodikası köhnəlmiş və əhəmiyyətini itirmişdi. Lakin bunu bütün məktəblərə şamil etmək sovet dövrünün tarix anlayışından çıxış etmək kimi olardı. Buna görə də Qarabağda ənənəvi təhsil və tərbiyə üsullarının XX əsrin əvvəllərinə qədər öz varlığını qoruduğu məlumdur.

### İstifadə edilmiş ədəbiyyat


1 Buniyadov, Z.M., Mamedov, Q.M. (1990). "Prostrannıy defter sandjaka Naxiçevan. 1727 qoda", Srednevekovıy Vostok, istoriya u kultura. Baku.

2 Əhmədov, H. (2006). XIX əsr Azərbaycan məktəbi, Bakı, Təhsil.

3 Gəncə-Qarabağ Əyalətinin müfəssəl dəftəri. (2000). Ön söz, tərcümə, qeyd və şərhlərin müəllifi Hüsaməddin Məmmədov (Qaramanlı). Bakı: Şuşa nəşriyyatı.

4 Xəzani, M. (1991). Kitabi-tarixi-Qarabağ, Qarabağnamələr II. Tərtib edəni və çapa hazırlayanı Nazim Axundov. Bakı, Yazıçı.

5 Qarabaği, M.C.C. (1989). Qarabağ tarixi, Qarabağnamələr I. Tərtib edəni və çapa hazırlayanı Afik Fərzəliyev, Bakı, Yazıçı.

6 Qarabaği, M.Y. (1991). Tarixi-Safi, Qarabağnameler II. Tərtib edən və çapa hazırlayan Nazim Axundov. Bakı, Yazıçı.

7 Nesirov, E. (2017). "Abbasiler`den Sefeviler`e Karabağ`ın Askeri-Siyasi Tarihine Bakış", SUTAD, Güz, No: 42, ss. 409-436.

8 Bartold, V.V. (1965). Sochineniya. Moskva, Nauk. Tom III.

9 Bekadze, İ. (2017). "XVIII. Yüzyılın İlk Yarısında Gence-Karabağ Eyaleti`nde Sanayi İşletmeleri ve Sosyal Tesisler", Karadeniz, No: 33, ss. 105-144.

10 Evliya Çələbi Səyahətnaməsində Azərbaycan. (2012). Nəşrə hazırlayan Mehmet Rıhtım. Bakı: Qafqaz Üniversitesi Nəşriyyatı.

11 Kazvini, H. (1919). Nuzhetul-kulub, transl. G. le Strange, London.

12 Mehmedov, H. (Karamanlı). (1993). "Osmanlı Dönemi Gence-Karabağ Eyaletinde Vakflar (16. Yüzyılın Sonları)", http://dergiler.ankara.edu.tr/dergiler/19/821/10436.pdf. s.638-639.

# NİZAMİ GƏNCƏVİ VƏ AZƏRBAYCAN DİLİ

**TEYYUB QULİYEV**
Filologiya üzrə fəlsəfə doktoru, dosent, AMEA Nəsimi adına Dilçilik İnstitutunun Azərbaycan dilinin tarixi şöbəsinin müdiri.
e-mail: teyyubq@mail.ru
https://orcid.org/0000-0002-3239-4919

**Məqaləyə istinad:**
Quliyev T. (2021). Nizami Gəncəvi və Azərbaycan dili. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 96–101

**ANNOTASİYA**

Dahi Azərbaycan şairi Nizami Gəncəvi əsərlərini fars dilində yazsa da, milli mənsubiyyətini heç vaxt unutmamışdır. O bunu əsərlərində dönə-dönə vurğulamış, mənsub olduğu xalqdan, onun mənəvi, mədəni dünyasından, tarixi qəhrəmanlığından söz açmışdır. Xüsusilə epik əsərlərində işlətdiyi türk-Azərbaycan sözləri, o cümlədən xalqımızın bədii düşüncəsini təcəssüm etdirən və yalnız bizə aid olan atalar sözləri, hikmətli sözlər və məsəllər onun azərbaycanlı olduğunun ən bariz sübutudur. Müşahidələr göstərir ki, çox böyük ehtimalla şairin əsərlərində canlı danışıq dilindən götürülmüş yüzdən artıq kəlmənin işlədilməsi təsadüfi hadisə, yaxud söz ustadının sadəcə sinonimlik yaratmaq istəyi olmamışdır. Nizami dövrünün "gərək fars dilində yazsın sənətkar" stereotipini sındırmaq, türk-Azərbaycan sözləri ilə də mükəmməl əsərlər yazmağın mümkünlüyünü göstərmək istəmişdir. Bu həm bir ilk, həm də böyük missiya idi. Təsadüfi deyil ki, Nizamidən az sonra yaranan türkdilli bədii ədəbiyyat məhz onun təsiri ilə formalaşmış və inkişaf etmişdir. Nizami düşüncəsi, Nizami sözü bu ədəbiyyatın əsas leytmotivi olmuşdur. Buna görə də Nizaminin həyatını və yaşadığı tarixi dövrü dərindən öyrənmək, poetikasını təhlil etmək, dünyagörüşünün hüdudlarını müəyyənləşdirmək, onun haqqında müfəssəl təsəvvür yaratmaq baxımından şairin əsərlərindəki milli sözlərin öyrənilməsinin böyük əhəmiyyəti vardır.

**Açar sözlər:** Nizami Gəncəvi, Azərbaycan dili, türk-Azərbaycan sözləri, türk dilləri, dialektlər.

**Məqalə tarixçəsi**
Göndərilib: 21.05.2021
Qəbul edilib: 02.06.2021

# NIZAMI GANJAVI AND THE AZERBAIJANI LANGUAGE

**TEYYUB GULIYEV**
PhD in Philology, Associate professor, Head of the department of history of the Azerbaijani language of the Institute of Linguistics named after Nasimi of ANAS. e-mail: teyyubq@mail.ru
https://orcid.org/0000-0002-3239-4919

**To cite this article:**
Guliyev T. (2021). Nizami Ganjavi and the Azerbaijani language. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 96–101

**ABSTRACT**

Although the great Azerbaijani poet Nizami Ganjavi wrote his works in Persian, he never forgot his nationality. He repeatedly emphasized this in his works, spoke about the people to which he belonged, its spiritual, cultural world, and his historical heroism. Especially the Turkish-Azerbaijani words used in his epic works, as well as proverbs, and sayings that embody the artistic thinking of our people and belong only to us, are the most obvious proof that he is Azerbaijani. Observations show that it is probably not a coincidence or the master's desire to create synonyms that more than a hundred words from the living language are used in the poet's works. We think that Nizami wanted to break the stereotype of the period "an artist should write in Persian" and show the possibility of writing excellent works with Turkish-Azerbaijani words. This was both a first and a great mission. It is not a coincidence that the Turkish language fiction, which emerged shortly after Nizami, was formed and developed under his influence. Nizami's thought and word were the main leitmotif of this literature. The study of national words in the works of the poet has great importance in terms of in-depth study of Nizami's life and historical period, analysis of his poetics, defining the boundaries of his worldview, creating a detailed impression of him.

**Keywords:** Nizami Ganjavi, Azerbaijani language, Turkish-Azerbaijani words, Turkish languages, dialects.

**Article history**
Received: 21.05.2021
Accepted: 02.06.2021

Nizami Gəncəvinin Azərbaycan ədəbiyyatına təsirindən bəhs edən təbib Cavad Heyət yazırdı: "Həqiqi bir müsəlman olan Nizaminin ana yurdu Azərbaycana, xüsusilə Gəncəyə və öz xalqına sevgisi, bağlılığı onun öz yurdunun gözəl təbiəti və mühitindən ilham alıb xalqının folkloru ilə bərabər, dilindən türkcə sözlər işlətməsinə və atalar sözlərinin farsca tərcümələrindən faydalanmasına səbəb olmuşdur" (Heyət, 2011).

Nizami Gəncəvinin əsərlərində işlətdiyi türk-Azərbaycan sözləri haqqında o qədər də əhatəli tədqiqat işləri aparılmamışdır. Bu barədə ilk yazıya M.Ə.Rəsulzadənin 1952-ci ildə Ankarada çap etdirdiyi "Azərbaycan şairi Nizami" kitabında rast gəlirik (Rəsulzadə, 2011). Daha sonra Ə.Şükürlü (Şükürlü, 2002), C.Heyət (Heyət, 2011), C.Ağamirov (Ağamirov, 2005), N.Xudiyev (Xudiyev, 2014), M.Yusifli (Yusifli, 2012) və başqa müəlliflər bu və ya digər dərəcədə bu məsələyə toxunmuşlar. N.Gəncəvinin ədəbi dilində işlənən türk-Azərbaycan sözlərinin tədqiqi onun yaradıcılığının və şəxsiyyətinin öyrənilməsi, XII əsr Azərbaycan dili haqqında təsəvvürün formalaşması, dilimizin fars dilinə əhəmiyyətli təsirinin izlənilməsi baxımından çox önəmlidir. Məhz bu önəmi nəzərə alaraq yuxarıda adlarını çəkdiyimiz tədqiqatçıların əsərlərinə əsaslanıb şairin poetik dilində, xüsusilə "Xəmsə"də işlənən milli sözlərimizin bəzilərinin işlənmə məqamlarına diqqət edək.

***Aba***

Kera yarəgi kəz sər-i qoft o quy
Ze mən cay *aba* konəd cost o cuy.
(Kimdə cəsarət var (ki) dedi-qoduçuluqla
Məndən babalarının yerini söyləməyi sora?)

(Şükürlü, 2002).

Bu sözə qədim türk yazılı abidələrinin dilində *apa* şəklində rast gəlinsə də (Malov, 1951), o, orta əsr türk mətnlərinə nisbətən müasir türk dillərində daha geniş yayılmışdır.

Müasir ədəbi dilimizdə işlənməyən *aba* sözü "əcdad", "ata", "ana", "böyük bacı" mənalarında dialektlərimizdə geniş yayılmışdır: *aba* şəklində "ana" (Təbriz, Qax), "ata" (Quba, Ordubad, Zəngilan), "böyük bacı" (Çənbərək), abay şəklində "xala" (Qax) mənalarında işlənir.

Dialektlərdə aba sözünün a>ə fonetik dəyişikliyinə uğramış formasına da rast gəlinir: *əbə* "ana" (Lənkəran), "nənə" (Böyük Qarakilsə), "ata" (Zəngilan) (Əzizov, 2016).

***Alaçıq***

Besaraye-zərbe-hemmət beçə razeyn çe lafem
Çe konəd be pa-ye pilan *alaçuq*-e torkmani
(Himmət zərbi sarayında qəlp pula nə deyim, Türkmən alaçığı fillərin ayağı altında dayanarmı?) (Heyət, 2011).

*Alaçıq* sözü qədim türk mətnlərində *alaçu* formasında işlənmişdir (Kaşğarlı, 1985; Caferoğlu, 1968). "Çubuqdan qurulub üstü keçə ilə örtülən köçəri mənzili; çadır" (ADİL, 2006) mənasını verən bu söz dilimizdə indi də işlənir. H.Zərinəzadə sözü "آله چوق (āləçūq̇) /ala+cıq/" kimi qeydə almışdır. *El yaylaqdan enib, çayların üstlərinə düşüb, alaçıqlar tikib və qız-gəlin suya tökülüb aparırdılar ("Şəhriyar" dastanı)* (Zərinəzadə, 1962). Ə.Şükürlünün fikrincə, bu kəlmə keçədən düzəldilmiş böyük mənasını ifadə edən *ala* və ev, ailə mənasını bildirən *açuk/laçık/açak* sözlərinin birləşməsindən törəmişdir (Şükürlü, 2002). B.Əhmədov isə alaçıq sözünün etimoloji izahını belə verir: "Sözün *al* hissəsi *alın* sözü ilə qohumdur. Mənası "qabaq", "ön tərəf" deməkdir. *Açıq* isə elə indi də işlətdiyimiz kəlmədir, "bağlı olmayan" deməkdir. Alaçıqların qapısı olmurdu, ona görə də ona "alı (qabağı, qapısı) açıq" demişlər" (Əhmədov, 2015).

***Amac***

Maraqlıdır ki, bu söz "Azərbaycan dilinin izahlı lüğəti"ndə fars sözü olaraq "nişanə, hədəf, nişangah" mənalarında qeyd olunmuşdur (ADİL, 2006). Lakin istinad etdiyimiz tədqiqatçıların hamısı bu sözü türk sözü kimi qeyd edirlər. Orta əsr Azərbaycan klassiklərinin ədəbi dilində bu kəlməyə rast gəlinməsə də, M.Kaşğari *amac* sözünün iki mənasını göstərir:

1. Öküz və kənd təsərrüfatı aləti;
2. Hədəf, nişangah.

İkinci mənadakı söz *-nı, -ığ, -ka, -lık* şəkilçiləri ilə birgə işlənir: *çak amaçnı urğıl* "ta nişangahı vur "; *ok amaçığ kurşattı* "ox hədəfi, amacı dəldi keçdi; *okamaçka yastaldı* "ox amacın bir yanına ildi"; *amaçlık yer* "atış üçün nişangah olaraq ayrıla yer" (Kaşğari, I c., 1985; Kaşğari, II c., 1985; Kaşğari, III c., 1985).

Nizami Gəncəvi *amac* sözünü aşağıdakı mənalarda işlətmişdir:

1. Atılan oxun, nizənin hədəf, nişan yeri mənasında:

Ze hər su ke costi yek *amacqah*
Zəmin qəşti əz zurməndiş-i çah.
(Harada bir hədəf seçib tapırdısa.
Güclü zərbəsi ilə (o) yerdə çuxur açırdı).

2. Hədəflə nişan alan şəxs arasındakı məsafə mənasında:

Gərd bər gərdan-i do şir-i əzim,
Kəs yek *amacqah* nəgoşt əz bim.
(O əzəmətli aslanların yaxınlığına
Heç kim qorxudan bir ox uçuşu (qədər) yaxınlaşa bilmirdi) (Şükürlü, 2002).

***Beyrəq // baydaq-bayraq***

Zəminra ərz-i nize təng dade,
Həvara mois-i *bəyrəq* rəng dade.
(Nizələr yer üzünü daraltmışdı,
Bayraqların dalğalanması havaya rəng vermişdi (Şükürlü, 2002).

Pərvin ze hərir-e zərd-o-əzrəq
Bər səncəq-e zər keşide *beyrəq.*
(Pərvin ulduzu sarı ipəkdən bayrağı altın bir sancağa çəkmişdi) (Rəsulazdə, 2011).

Məra pili sezəd kura konəm bənd,
To şahi bər to nətvan *bəydəq* əfkənd.
(Mən bir fili tutub bağlaya bilərəm,
Sən şahsan (şahmatda) sənə qarşı bayraq qaldıra bilmərəm) (Şükürlü, 2002).

*Bayraq* sözünün mənşəyi ilə bağlı türkologiyada müxtəlif fikirlər var. Buna səbəb kəlmənin türk olmayan bəzi Avropa və Asiya xalqlarının da dilində işlənməsidir: alb. *bayrak/bayak* (bayraktar – bayraq gəzdirən); bolq. *bayrak/baryak* (bayraqdar); serb. *bayrak* (bayraktar); rum. *bayrak* (bayrakdar), ər. *beyrek/bayrak,* far. *bayraq* (Şükürlü, 2002).

B.Əhmədov yazır ki, M.Fasmerin fikrincə, qədim türk dillərində "hündür", "dağ" anlamlarını əks etdirən bayır sözü mövcud olub. Bayraq da həmin sözlə bağlıdır, "yuxarı qaldırılan" deməkdir (Əhmədov, 2015).

L.Budaqov *bayraq* sözünü fars-türk, M.Qaffarov fars-ərəb, İ.Yaqello, F.Mikloşiç, İ.Vullers fars, F.Steynqass isə ərəb mənşəli hesab etmişdir. M.Rəsənen, G.Dörfer və C.Klousonun fikrincə, *bayrak* sözü sanskrit mənşəlidir və soqdi dili vasitəsilə qədim türk dillərinə keçmişdir (ESTY, 1978).

M. Kaşğari "Divan"ında *bayraq* sözünün *batrak* və *bayraq* fonovariantlarını qeyd etmişdir (Kaşğari, I c., 1985; Kaşğari, II c., 1985; Kaşğari, III c., 1985), qədim uyğur dilində isə daha əski variant olan *badruk* kəlməsi işlənmişdir (Caferoğlu, 1968).

G.İ.Ramstedt *bayrak* sözünün kökünü Ural-Altay dilləri nəzəriyyəsinə əsaslanaraq izah etmək istəmişdir. E.Sevortyan bu sözün qədim türk dilinə aid olduğunu və öncə *batrak* şəklində işlədilmiş olduğunu qeyd etmişdir (ESTY, 1978).

***Bitiq-bitik***

Qədim türk sözü hesab edilən *bitik* kəlməsi Nizami Gəncəvinin dilində, əsasən, məktub və namə sözlərinin sinonimi kimi işlədilmişdir.

Penhan vərəgi bexun sereşti,
Van *bitigra* bəru neveşti.
(Gizlicə olaraq varağı göz yaşı ilə isladır
Və məktubu yazırdı).

Türkologiyada əsaslı şəkildə qəbul olunmuş fikrə görə, *bitik* kəlməsi *yazmaq* mənalı *biti* feilindən yaranmışdır. Qədim türk yazılı abidələrinin dili bunu sübut edir.

*Biti//bitig* kəlmələri orta əsr türk yazılı abidələrində də geniş yayılmışdır. M.Kaşğari *biti* sözünün "göydən gələn kitablardan hər biri" (Kaşğari, III c., 1985), *bitigü* sözünün "kitab, məktub, yazışmaq, yazılı şey" (Kaşğari, I c., 1985; Kaşğari, II c., 1985; Kaşğari, III c., 1985) mənalarını qeydə almışdır.

H.Zərinəzadə *bitik* kəlməsinin fars dilinə *betek/petik/pəte* formalarında "sənəd, yazı" mənalarında keçdiyini göstərmişdir. Bu sözlərlə yanaşı, tədqiqatçı "yazıçı" mənasında *betekçi/pətekçi* sözlərinin də Səfəvilər dövründə və sonralar ədəbi dilimizdə işləndiyini qeyd edir (Zərinəzadə, 1962). Məktub mənasında *bitig/pitig* sözünün Şah İsmayıl Xətainin "Dəhnamə"-sində işlənməsi bu fikrin əyani sübutudur:

Yazdım *pitigi* qamu sərasər,
Dutdum anı qarşuma bərabər
(Öz halımı ərzu faş qıldım,

Yaşımla *bitigni* yaş qıldım) (Cavadova, 1977; Şükürlü, 2002).

Müasir Azərbaycan dilində *bitik* kəlməsi yalnız *dua-piti, cadu-piti* birləşmələrində qalmışdır.

***Ekdəş***

Bu kəlmə milliyyətcə fərqli ata və anadan dünyaya gələn övlad mənasını ifadə edir. Tədqiqatçıların fikrincə, iki sayının sonuna *-daş* şəkilçisinin artırılması yolu ilə meydana çıxmışdır.

Neqari *ekdişəst* in nəqş-e dəmsaz,
Pədər hendu vo madər torktənnaz,
((Bu) zövqlü naxış bənzərli *ekdişdir,*
Atası hindli, anası Türk gözəlidir) (Şükürlü, 2002).

Maraqlı bir məqamı da qeyd edək ki, Nizami Gəncəvinin dilində (məsələn, "Xosrov və Şirin" məsnəvisində) *ikdiş* variantına da rast gəlinir və bu kəlmə farsca *durəq* sözünün sinonimi kimi işlənmişdir:

Nezami *ikdişi* xəlvət neşinəst,
Ke nimi serkə, nimi onqəbudəst.
(Nizami xəlvətdə oturan bir ekdiş olduğuna görə Yarısı sirkə, yarısı baldır) (Şükürlü, 2002).

Diqqətə çatdırmaq istəyirik ki, *ekdəş/yekdəş* sözlərini "iki irqdən olan" mənasında H.Zərinəzadə də qeydə almışdır. O yazır: "اکدش (ekdəş)… ümumiyyətlə, iki irqdən və cinsdən olan insana, heyvana deyilir. İki şeyin qarışması və birləşməsinə də deyilir." (Zərinəzadə, 1962). Bu sitat göstərir ki, son dövr (Səfəvilər dövründən sonra) yazılı abidələrdə yayılmasa da, ən azından Nizaminin dövründən Səfəvilərə qədər *ekdəş* sözü ara-sıra işlənmişdir.

***Moncuq (muncuq)***

Bu kəlmə nəinki Azərbaycan dilində, demək olar ki, bütün türk dil arealında geniş yayılmışdır. Türkoloqların fikrincə, bu kəlmənin əsli *boncuk* sözüdür və həmin söz *boy//boyun* leksik vahidindən yaranmışdır: *boy-un-cuk/bon-cuk.* b~m əvəzlənməsi ilə (*bən~mən* əvəzliklərində olduğu kimi) Azərbaycan dilində *muncuq* variantında işlənir.

Nizami Gəncəvi moncuq sözünü aşağıdakı mənalarda işlətmişdir:

1. Günəşin yer üzərinə yaydığı şüalar mənasında:

Ço əz rayət-i şir-i peykər sepehr,
Bər avərd moncuq tabənde mehr.
(Aslan kimi gözəl göyün bayrağından
Günəş parlaq muncuğunu çıxartdı).

2. Bayrağın ağacı, əlcəyi mənasında:

Bəsi bər əz Kaviyani derəfş
Bemoncuq bər zəd pərəndi benəfş.
(Gavəlilərinkindən uca bir bayraq olaraq
Dəstəyinə mavi ipək çəkdi).

3. Döyüşçü papağını bəzəyən əşya (muncuq) mənasında:

Ze mouç-e xun ke bər mişod beəyyuq
Por əz xun qəşte taşeqhayi moncuq.
(Əyyuqa qədər gedib çatan qan dolçasından
Muncuqlu tas yeri qanla dolmuşdu).

Ze hər su deyləmi kərde beəyyuq
Fəru həşte qole çun çə'd-i moncuq.
(Hər tərəfdə deyləmli (qul) Əyyuqa qarşı baş qaldırmış Başlarına muncuqlu papaq qoymuşdular) (Şükürlü, 2002).

***Ouc (ovuc)***

Bu söz ayrı-ayrı türk dillərində *ovuc, ouc, uvuç, us, oş, ivas, havuç* və s. formalarda yayılmışdır. Nizami Gəncəvi bu sözü farsca *kəf* kəlməsinə, yaxud *kəfe dəst* izafət birləşməsinə paralel olaraq işlətmişdir.

Afıtabi dər ouc-i xiş bolənd,
Dər qeran ba Utaridəş peyvənd.
(Günəşi öz ovucunda ucaldaraq
Onu Ütaridlə birləşdirmişdi).

Əz təbi'eyi o həndəsi yo necum,
Həme dər dəst-i oucu monhəre mum.
(Təbiət, həndəsə və nücum (elmlərin)dən
Hamısı onun ovucunda mum topu (kimi)).

***Tutmac***

Bu kəlmə yarpaq-yarpaq kəsilən xəmir, lobya, qatıq (ayran) və sarımsaq qatışığından bişirilən ən qədim türk yeməklərindən birinin adını bildirir (Şükürlü, 2002). Azərbaycan ədəbi dilində qeydə alınmasa da, dialektlərimizdə

xörək adı kimi iki fonovariantda bu gün də yaşayır: 1) *tutmac* (Ağcabədi, Göyçay, İmişli, Quba, Oğuz, Şamaxı, Ucar); 2) *tutmaş* (Ağdam, Basarkeçər, Mingəçevir, Şuşa) (ADDL, 2007).

*Tutmac* sözü qədim türk dili lüğətlərində də (M.Kaşğarinin "Divan"ı, V.Radlovun lüğəti və s. ) xəmirdən hazırlanmış xörək adı kim qeyd olunmuşdur.

Nizami bu kəlməni yalnız "Yeddi gözəl" məsnəvisində işlətmişdir:

Xar kəz nəxl dur şod tacəş,
Bəh ke sazənd six-e tutmacəş.
(Xurma ağacının başından düşən tikandan
Tutmac bişirmək üçün odun düzəltmək daha yaxşı olar).

Ari, anra ke dər şekom-e duhələst,
Bərq-e tutmac bəh ze bərq-e qoləst.
(Bəli, o adam ki qamı dümbəy (kimidir, ona)
Tutmac yarpağı gül yarpağından daha yaxşıdır).

***Təngə (dəngi)***

Kərde girət bəhəm lebanqi çənd,
Əz həram o həlal dənqi çənd.
(Böyük bir bağır-çığırla halaldan, haramdan
Bir çox dəngi (altın) toplayarsan) (Şükürlü, 2002).

Bu söz qədim türkcədə qızıl pul, sikkə mənasında işlənmişdir. Ə.Şükürlü doğru olaraq qeyd edir ki, söz bərabər, bənzər, tən anlamı ifadə edən *təngə* sözündən törəmişdir (Şükürlü, 2002). Kəlmə *deng* variantında Türkiyə türkcəsində də işlənir və pul mənasında *(деньги)* rus dilinə də keçmişdir.

*Təngə* sözü dialektlərimizdə bu gün də yaşayır: *tanqax* (Salyan); *tanqah* (Cəbrayıl, Cəlilabad, Füzuli, İmişli, Qarakilsə) – pul, sərmayə, var-dövlət (ADDL, 2007).

Nizami Gəncəvinin dilində işlənən türk-Azərbaycan mənşəli sözlər bunlarla bitmir. Təkcə mərhum professor Əlisa Şükürlü "Gəncəli Nizamidə türkçülük" əsərində Nizaminin məsnəvilərində işlənən yüz sözün izahını vermişdir. Əminik ki, sözlərin sayı bununla məhdudlaşmır. Ümid edirik ki, gələcək tədqiqatlar şairin poeziya dilində işlənmiş yeni-yeni milli sözlərin tapılıb araşdırılmasına böyük töhfələr verəcək.

**İstifadə edilmiş ədəbiyyat**


1. ADDL. (2007). Azərbaycan dilinin dialektoloji lüğəti. A-Z, Bakı, "Şərq-Qərb", 568 s.
2. ADİL. (2006). Azərbaycan dilinin izahlı lüğəti. 4 cilddə, I cild, Bakı, "Şərq-Qərb", 744 s.
3. Ağamirov, C. (2005). Nizami Gəncəvinin yaradıcılığında işlədilən türk sözləri və Azərbaycan zərb-məsəlləri. Gəncə, 66 s.
4. Cavadova, M. (1977). Şah İsmayıl Xətainin leksikası. Bakı, Elm, 235 s.
5. Əhmədov, B. (2015). Etimologiya lüğəti. Araşdırmalar, mülahizələr. Bakı, Altun Kitab. 288 s.
6. Əzizov, E. (2016). Azərbaycan dilinin tarixi dialektologiyası. Bakı, "Elm və təhsil", 348 s.
7. Heyət, C. (2011). "Xəmsə"də türkcə sözlər. Dilimiz, ədəbiyyatımız və kimliyimiz uğrunda (məqalələr toplusu). Bakı, "Elm və təhsil", 704 s.
8. Xudiyev, N. (2014). Seçilimiş əsərləri. VIII cild, Bakı, "Elm və təhsil", 572 s.
9. Rəsulzadə, M.Ə. (2011). Azərbaycan şairi Nizami. Bakı, "Təknur", 520 s.
10. Şükürlü, Ə. (2002). Gəncəli Nizamidə türkçülük. Bakı, "Kitab aləmi", 247 s.
11. Yusifov, M. (2012). Nizamidə azərbaycançılıq. Bakı, "Elm və təhsil", 168 s.
12. Zərinəzadə, H. (1962). Fars dilində Azərbaycan sözləri. Bakı, 435 s.
13. Caferoğlu, A. (1968). Eski Uygur Türkçesi Sözlüğü. Türk Dil Kurumu Yayınları, Sayı: 260, 320 s.
14. ESTY. (1978). Etimologicheskiy slovar' tyurkskikh yazykov: Obshchetyurkskiye i mezhtyurkskiye osnovy na bukvu «B» / AN SSSR.In-t yazykoznaniya.-M.: Nauka, 349 s.
15. Kaşğari, M. (1985). Divanü Lugati't Türk Tercümesi (Besim Atalay). Türk Tarih Kurumu Basımevi, I c., Ankara, 530 s.
16. Kaşğari, M. (1985). Divanü Lugati't Türk Tercümesi (Besim Atalay). Türk Tarih Kurumu Basımevi, II c., Ankara, 366 s.
17. Kaşğari, M. (1985). Divanü Lugati't Türk Tercümesi (Besim Atalay). Türk Tarih Kurumu Basımevi, III c., Ankara, 462 s.
18. Malov, S.E. (1961). Pamyatniki drevnetyurkskoy pis'mennosti. Teksty i issledovaniya, M.–L.: İzd-vo AN SSSR, 451 s.

# NİZAMİ GƏNCƏVİ İRSİNDƏN TƏDRİS PROSESİNDƏ İSTİFADƏ İMKANLARI

**AKİF XALIQOV**
Pedaqoji elmlər üzrə fəlsəfə doktoru, Lənkəran şəhər S. Kazımbəyov adına 6 nömrəli tam orta məktəb-liseyin direktoru, əməkdar müəllim.
e-mail: akif-1955@mail.ru
https://orcid.org/0000-0002-2933-347X

**Məqaləyə istinad:**
Xalıqov A. (2021). Nizami Gəncəvi irsindən tədris prosesində istifadə imkanları. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 102–108

**ANNOTASİYA**

Məqalədə milli təhsil quruculuğu sahəsində görülən işlərdən, dünya şöhrətli şair Nizami Gəncəvi irsinin gənc nəslə öyrədilməsində fənlərarası inteqrasiyanın imkanlarından bəhs olunur. Fizikanın tədrisi prosesində N.Gəncəvi irsinin əvəzsiz mənbə olduğu konkret nümunələrlə əsaslandırılır. Mütəfəkkir şairin ədəbi yaradıcılığında, əsərlərinin toplusu olan "Xəmsə"də irəli sürülən, öz dövrü üçün yenilik sayıla biləcək elmi mühakimə və hökmlərinin bugünkü əhəmiyyəti qeyd olunur. Məqalədə, həmçinin tədris prosesində fənlərin inteqrasiyası zamanı Nizami Gəncəvi irsinin imkanları araşdırılır, elmlə şeirin vəhdətindən yaranan poeziyanın uzun zamandan bəri tədqiqat obyektinə çevrilməsinə baxmayaraq, hələ də şagirdlərin Nizami irsindən bəhrələnməsinə ehtiyacın olması öz əksini tapır.

**Açar sözlər:** Nizami Gəncəvi, təbiətşünaslıq, hərəkət, Günəş, səma, planet.

**Məqalə tarixçəsi**
Göndərilib: 28.03.2021
Qəbul edilib: 13.04.2021

# POSSIBILITIES OF USING THE HERITAGE OF NIZAMI GANJAVI IN THE EDUCATIONAL PROCESS

**AKİF KHALIGOV**
PhD in Pedagogical Sciences, Director of Lankaran City Secondary School No. 6. Azerbaijan. e-mail: akif-1955@mail.ru
https://orcid.org/0000-0002-2933-347X

**To cite this article:**
Khaligov A. (2021). Possibilities of using the heritage of Nizami Ganjavi in the educational process. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 102–108

**Article history**
Received: 28.03.2021
Accepted: 13.04.2021

**ABSTRACT**

The article discusses the work done in the field of national education, the possibilities of interdisciplinary integration in teaching the legacy of the world-famous poet Nizami Ganjavi to the young generation. In the process of teaching physics, Nizami Ganjavi's legacy is based on concrete examples that are an invaluable source. The importance of scientific judgments which can be regarded as an innovation for his period, is stated in the literary work of the thinker poet, as well as in "Khamsa". The article also explores the possibilities of Nizami Ganjavi's legacy in the integration of subjects into the educational process. Despite the fact that poetry, arising from the union of science and poem has long been the subject of research, there is still a need for students to benefit from Nizami's legacy.

**Keywords:** Nizami Ganjavi, natural sciences, motion, Sun, sky, planet.

## GİRİŞ

Milli təhsil quruculuğu sahəsində, təhsil sistemi güclü olan dünya ölkələrinin təcrübəsinin öyrənilməsi istiqamətində görülən işlər ölkəmizin daxili və xarici siyasətinin uğurlu nəticələri kimi əhəmiyyətlidir. Artıq təşəkkül tapmaqda olan yeni təhsil sistemi ilə bağlı müasir pedaqoji təfəkkür formalaşır, yaradıcı və təşəbbüskar fəaliyyətə meyil güclənir. Həyata keçirilən tədbirlər bu sahədə yeni ideyaların yaranmasına, təhsilimizin forma və məzmunca yenilənməsinə, dünya təhsil sisteminə inteqrasiya olunmasına geniş imkanlar yaradır. Əsas məqsəd savadlı, müstəqil və yaradıcı düşünmə qabiliyyətinə malik vətəndaş və şəxsiyyət yetişdirmək, müasir təfəkkürlü və rəqabət qabiliyyətli mütəxəssis formalaşdırmaq, təhsilalanları ictimai həyata və səmərəli əmək fəaliyyətinə hazırlamaqdan ibarətdir. Bu vəzifənin layiqincə yerinə yetirilməsində fizika elminin nəzəri əsaslarının öyrədilməsi ilə bərabər fənnin tədrisinin tarixi nümunələrlə üzvi şəkildə əlaqələndirilməsi və milli zəmində təşkili xüsusi əhəmiyyət kəsb edir. Tarixi məqamlara diqqət yetirdikdə müəyyən etmək olur ki, xalqımızın dərin təfəkküründən xəbər verən zəngin fəlsəfi irsinin elmi təfəkkürə çevrilməsinin aşkara çıxarılmasında fizika elmi mühüm rol oynayır. Zehni fəaliyyətin bir vasitəsi olan bu fənn elmi-texnoloji təkamülün əsasıdır. Fizika şagirdlərdə müşahidələrə düzgün qiymət vermək, fərziyyə və nəzəriyyələri eksperimentdə yoxlamaq, məntiqi təfəkkürü inkişaf etdirmək bacarıqları formalaşdırır. Təhsilalanlarda təbiət və texnikanın mühüm qanunauyğunluqlarına aid elmi dünyagörüşü inkişaf etdirməklə onlarda təfəkkür, kommunikativ bacarıqlar, müasir texnologiyalarla işləmək qabiliyyəti yaradır.

Öz məzmununa, böyük həcminə görə bu elm qədim fəlsəfi fikrin əvəzolunmaz xəzinəsi kimi qalmaqdadır. Lakin buna baxmayaraq, son vaxtlaradək elmin bu sahəsi Şərq fəlsəfi fikri ilə kifayət qədər əlaqələndirilməmiş, bu məsələyə az diqqət yetirilmişdir. Halbuki, Şərq mütəfəkkirlərinin əsərlərində fiziki ideyaların verilməsi bu elm sahəsində cahanşümul kəşf və ixtiralardan daha əvvəl mövcud olmuşdur. Nizami Gəncəvi, Xaqani Şirvani, Fələki Şirvani, Nəsirəddin Tusi, İmadəddin Nəsimi və Məhəmməd Füzuli kimi tanınmış şair, alim və filosoflar kainatdakı fiziki hadisələr, təbiətdəki qanunauyğunluqlar haqqında mühüm əhəmiyyətli fikirlər söyləmişlər. Bu mütəfəkkirlər arasında Nizami Gəncəvinin bədii-fəlsəfi irsi təbiət qanunları ilə daha əlaqəlidir.

## NİZAMİ ELMŞÜNAS ALİM KİMİ

Yaxın və Orta Şərq fəlsəfi-ictimai və bədii-estetik düşüncə tərzinin formalaşması və inkişafında müstəsna xidmətləri olan mütəfəkkirin irsinin öyrənilməsi və təbliği ötən əsrin 70-ci illərindən diqqət mərkəzində olub. Hələ 1979-cu ildə ulu öndər Heydər Əliyevin təşəbbüsü ilə qəbul olunmuş “Azərbaycanın böyük şairi və mütəfəkkiri Nizami Gəncəvinin irsinin öyrənilməsini, nəşrini və təbliğini daha da yaxşılaşdırmaq tədbirləri haqqında” qərar şairin yaradıcılığının tədqiqi və təbliği üçün yeni perspektivlər açmışdır.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə 2021-ci ilin “Nizami Gəncəvi ili” elan edilməsi bu ənənənin davamıdır. Azərbaycan xalqının iftixarı olan dahi şair, təbiətşünas və filosof N.Gəncəvinin elmi görüşlərinin təhlili göstərir ki, görkəmli mütəfəkkir astronomiyanı, riyaziyyatı, fəlsəfəni, tarixi, coğrafiyanı, fizikanı və digər elmləri kamil bilmişdir. O, təbiət haqqında elmi ideyaları aşkara çıxarmış, onları ustalıqla cəmiyyət hadisələri ilə əlaqələndirmiş, analogiyalar yaratmış və heç bir təhrifə yol verməmişdir.

N.Gəncəvi “Xəmsə”də fizikanın, eləcə də təbiətşünaslığın elə problemlərinə toxunmuşdur ki, onlar o dövrün elmlərində həllini tapmamışdı. Bu elmin sonrakı inkişafında, şübhəsiz, Nizaminin irəli sürdüyü müddəaların da müstəsna rolu olmuşdur. Məsələn, o, kainatın sonsuzluğu və əbədiliyi fikrinin tərəfdarı kimi çıxış edərək yazırdı:

Bəs bu kainatdan, de görüm, kənar
Başqa bir aləmə gedən bir yol var?
Var isə nə üçün bilməyir heç kəs,
Yox isə yoxluğa heç bir yol getməz
(Gəncəvi, 2004).

O, araşdırmalarında hərəkətin toplanması, toplananlara ayrılması, sürət və onun dəyişməsinin mövcudluğunu vacib hesab etmişdir:

Əvvəl mövcud oldu tək bir hərəkət,
Onu iki yerə ayırdı sürət,
Hər iki hərəkət gəlib bir yerə,
Yeni bir hərəkət doğurdu hərə.
Əvvəlki hərəkət ayrıldı yenə,
Bu üçü qoşuldu biri-birinə.
Üç xətt zahir oldu üç hərəkətdən,
Üç dövrə yarandı ondakı xətdən
(Gəncəvi, 2004).

Bu fikirlərdən görünür ki, Nizami özündən əsrlər sonra kəşf edilmiş mexaniki hərəkətin iki növünü: bərabərsürətli hərəkəti və dəyişənsürətli hərəkəti nəinki elmi nöqteyi-nəzərdən düzgün fərqləndirmiş, həm də öz dövrü üçün sürətlərin toplanması qaydasını vermişdir.

Ümumtəhsil məktəblərində fizika fənninin tədrisi prosesində Nizaminin mexanika, istilik, optika, elektrik, elektromaqnit hadisələri haqqında fikirlərindən tam istifadə etmək üçün böyük imkanlar vardır. O, "Xəmsə"də, xüsusilə "Leyli və Məcnun", "Xosrov və Şirin" əsərlərində fiziki hadisə və qanunauyğunluqları başqalarından xeyli qabaq nəzmə çəkmişdir. Onun əsərlərində şərh olunan fiziki hadisə və anlayışların mütəfəkkir alimdən bir neçə əsr sonra qanun halına salındığını şagirdlərə öyrətməklə fənlərarası inteqrasiyanın şairin dövründə də aktual olduğunu əsaslandırmaq olar.

Tədris prosesində və müstəqil işlərdə, o cümlədən dərnəklərdə, fizika gecələrində və sinifdənkənar tədbirlərdə də Nizami irsindən istifadənin əhəmiyyəti böyükdür. Bu məqsədlə "Nizami Gəncəvinin elm dünyası" kitabında (Abdullayev, Vəliyev, 1991) Nizaminin fiziki ideyalarının öyrənilməsi sahəsindəki işlərdən nəzəri vasitə kimi istifadə etmək olar. Dahi şairin fizikanın mexanika bölməsi ilə əlaqəli fikirləri "İqbalnamə" əsərində daha aydın müşahidə edilir:

Mərkəzdən ayrıldı həmin dövrələr,
Yaradıb ortaya çıxdı bir cövhər.
Cövhər keşməkeşdən doğub parladı,
"Hərəkət eyləyən cism" oldu adı.
Həmin cism qərar tutmayıb bir an,
Dönür, hərlənirdi, əsla durmadan.
Bu cismin parlayan saf parçaları,
Həmişə qaçırdı mərkəzə sarı
(Gəncəvi, 2004).

"Mexanika" bəhsindən məlum olduğu kimi fırlanma hərəkətinə səbəb, fırlanan cismə tətbiq olunub, fırlanma mərkəzinə doğru yönələn mərkəzəqaçma qüvvəsidir. Nizami poetik şərtlərlə bu qüvvənin mövcudluğunu yuxarıda göstərildiyi kimi qeyd etmişdir.

## NİZAMİ SƏMAŞÜNAS ALİM KİMİ

Fizikadan "Planetlərin hərəkəti" və "Günəş sisteminin tərkibi" mövzularının tədrisi zamanı görkəmli filosofun belə bir kəlamını xatırlamaq olar.

Bir günəş qəndilidir göyün doqquz qatında,
Son nəbidir, nəbilər üzüyü barmağında
(Gəncəvi, 2008).

Elmə Günəş sistemində yeddi planetin olması fikrinin məlum olmadığı dövrdə Nizami düşüncələrini bu poetik misralarla ifadə edərək öz zəmanəsini çox-çox qabaqlamışdır. Belə ki, XV əsrə qədər 7 planet: Günəş, Ay, Merkuri, Venera, Mars, Yupiter və Saturn olduğu fərz edilirdi. Hesab olunurdu ki, onlar Yer ətrafında fırlanır. XVI əsrdə isə Nikolay Kopernik sübut etdi ki, bütün planetlər Günəş ətrafında, Ay isə digər planetlərin peykləri kimi Yerin ətrafında fırlanır. Yer planet, Günəş isə özü şüalandığı üçün ulduzdur. 1781-ci ildə Uran və 1846-cı ildə Neptun, 1930-cu ildə isə Pluton kəşf edildi.

Günəş işığının planetlərdən əks olunması prosesinin işığın qayıtma qanunu ilə əlaqəli olduğunu Nizami şeir dilində belə ifadə etmişdir:

İsgəndər günəşdir bu kainatda,
Misli-bərabəri yoxdur həyatda,
İşıq saçdığından böyük İsgəndər,
Dolmuşdur yanına işıq sevənlər
(Gəncəvi, 2004).

IX sinif fizikasında optika bölməsinin tədrisi zamanı bu fikirlər mövzunun əsas motivi kimi

təqdim olunmalıdır. Görkəmli fiziklər – Robert Mayer, Ceyms Coul, Herman Helmholts və başqalarının səyi ilə kəşf olunmuş "Enerjinin saxlanması qanunu"nun tədrisi zamanı Nizaminin hələ bu qanun kəşf olunmadan yeddi əsr əvvəl söylədiyi fikrin şagirdlərə çatdırılması mövzunun mənimsənilməsinə əhəmiyyətli təsir göstərir. O, şaquli istiqamətdə yuxarı atılan daşın hərəkəti zamanı enerjinin dəyişməsini belə izah edir:

Göyə atılan daş yerə tez düşər,
Bu qısa müddətdə işlər dəyişər
(Gəncəvi, 2004).

Nizami Gəncəvi eşqi qüvvətli cazibəsi olan maqnitə bənzədir. Eramızdan əvvəl VII əsrdə yaşamış yunan filosofu, astronomu və fiziki Miletli Falesə toxucuların müşahidəsindən kəhrəbanı yun parçaya sürtdükdə yüngül şeyləri özünə çəkmək qabiliyyəti məlum idi. Falesdən iki min il sonra yaşamış ingilis həkimi Hilbert göstərmişdir ki, şüşə çubuğu ipəyə sürtdükdə onda belə bir qabiliyyət yaranır. Nizami isə maqnit və kəhrəbaya xas olan xassələri, onların cazibə qabiliyyətini dərindən bilmiş və özünün mühakiməsi ilə bunu şeir dilində "Xosrov və Şirin" əsərində çox sərrast ifadə etmişdir:

Maqnit olmasaydı, eşqin əsiri,
Çəkməzdi özünə dəmir zənciri.
Kəhrəbanın eşqə düşməsə canı,
Elə cəzb etməzdi quru samanı.
Dünyada gövhər var, daş var nə qədər,
Onlar nə bir saman, nə dəmir çəkər
(Gəncəvi, 2004).

Kainatın əmələ gəlməsini və təkamülünü təsəvvür edərkən Aristotel, Sokrat, Platon, Fales kimi mütəfəkkirlərin fikirlərinə əsaslanan Nizami bir çox təbiət qanunlarının və fiziki hadisələrin öz dövrü üçün daha doğru olan izahını verə bilmişdir. Əsərlərindən məlum olur ki, o, fizika, həndəsə, astronomiya, fəlsəfə və digər elmlər haqqında dərin biliyə malik olmuşdur. Dünyanın yaranması haqqında öz mülahizələrini şərh edən Nizami "İqbalnamə"də belə bir fikir yürüdür: "Kainatda heç bir şey itmir, yalnız bir keyfiyyətdən digərinə keçir". Həmin əsərdə göstərir ki, təbiətdə hərəkətsiz heç nə yoxdur, cisimlərin istənilən hərəkəti və sükunəti nisbidir.

Ümumtəhsil müəssisələrində hərəkətin nisbiliyi, elektrik, maqnit sahələrinin və istilik hadisələrinin tədrisi zamanı Nizami irsindən istifadənin əhəmiyyəti böyükdür. Məsələn, şair istiliyin yaranma səbəbini "İqbalnamə" də belə ifadə edir:

Göyün gərdişindən od oldu aşkar,
Od hərəkət edən qüvvədən doğar
(Gəncəvi, 2004).

Göründüyü kimi, N. Gəncəvi istiliyin yaranma səbəbini bilavasitə hərəkətin intensivliyi ilə bağlamaqla istilik haqqında elmi fikirləri beş-altı əsr qabaqlamışdır.

Yaradıcılığından aydın olur ki, o, fizikanın bir çox qanunları haqqında tam elmi təfəkkürə malik olmuşdur. Məsələn, Danil Bernulli tənliyi XVIII əsrin birinci yarısında kəşf olunmuş, Nizami isə ondan bir neçə yüz il əvvəl bu qanun haqqında öz fikirlərini belə ifadə etmişdir:

Heyətşünas alim öz biliyilə
Dəlillər gətirib, şərh etdi belə:
"Gəmi burulğana çatdığı zaman
Heybətli bir balıq suyun altından
Bir dairə üzrə daim dövr edir,
Ağır gəmiləri suda hərlədir.
Gəmilər hərlənir dağılanadək,
Qərq olub batanı udur o nəhəng.
Gurlayanda təbil – o qurd dərisi,
Yetişir balığa sehirli səsi.
Balığı sarsıdır bu müdhiş nərə,
Baş vurub o qaçır dərinliklərə.
O balıq qaçanda suları yarır,
Ardınca gəmini çəkib aparır.
Çıxır burulğandan gəmi bu sayaq,
Allah özü bilir düzünü ancaq!"
(Gəncəvi, 2008).

Fizikadan "İşığın dispersiyası" mövzusunun tədrisi zamanı səmanın mavi rəngdə olmasının səbəbi Nizaminin "Sirlər Xəzinəsi" əsərində aşağıdakı misralarla öz izahını tapır:

Zərrə qədər boyası, rəngi varmı havanın?
Tutqunluğu könüllər oxşayırmı havanın?

... Hər kim ki, əyninə göy paltar geyər,
Günəşi özünə çörək eyləyər
(Gəncəvi, 2008).

Doğrudan da, Günəş işığı yerə çatana qədər fəzada səpilir və spektral tərkibi dəyişir. Onda mavi və sarımtıl rəng üstünlük təşkil edir. Qısa dalğalar uzun dalğalara nisbətən çox səpildiyi üçün sarımtıl rəngli Günəş işığı atmosferdə səpilərək onun rəngini maviləşdirir. Fizikadan məlum olduğu kimi işığın mahiyyəti, təbiəti çox sonralar, yəni XVII əsrin ikinci yarısından sonra müəyyən edilib. Elm aləmində ilk dəfə ağ işığın yeddi təbii rəngdən ibarət olduğunu sübut edən dahi ingilis fiziki İsaak Nyuton olmuşdur. Ümumiyyətlə, N.Gəncəvinin bütün poemalarında bu və ya digər şəkildə fiziki qanunlardan bəhs etməsi, müxtəlif planetlər və onların xassələri haqqında xatırlatmaları deməyə əsas verir ki, o, təbiət elmlərinin bilicisi olmuş, təbiətdəki hadisə və qanunauyğunluqlar haqqında məntiqi analiz verməyi bacarmışdır.

Humanitar fənlərlə təbiət elmlərinin tədris prosesində inteqrasiyasına ən bariz nümunələr N.Gəncəvinin yaradıcılığında daha çoxdur. Şairin əsərlərinin təhlili onu deməyə əsas verir ki, o öz dövründə və ondan əvvəl qanun şəklinə salınmış və salınmamış, fiziki hadisələr barədə mükəmməl biliyə malik olmuşdur. O, elmi biliklərin cəmiyyətdə, insan həyatında aparıcı, hərəkətverici qüvvə olduğunu dərk etmiş, o səbəbdən də elm adamlarına, yəni alimlərə yüksək qiymət vermişdir:

Qüvvət elmdədir, başqa cür heç kəs,
Heç kəsə üstünlük eyləyə bilməz!
Rütbələr içində seçilir biri,
Hamıdan ucadır alimin yeri...
Bağlı bir qapıya açar axtarsan
Ancaq alimlərdə axtar, taparsan...
Alim insanlarla dost olsan əgər,
Elmi, mərifəti sənə də keçər...
(Gəncəvi, 2011).

Fizikada dispersiya mövzusunun tədrisi zamanı gəldiyimiz nəticənin bədii inikasını Nizami Gəncəvinin "Leyli və Məcnun" əsərindən götürülmüş parçada aydın görürük. Nizami aşağıda verilmiş parçada ağ işığı, ağ rəngi antik dünya alimlərinin fikrinə uyğun olaraq onların dili ilə saf, bircinsli təsvir etmişdir:

Səma saflığında, gümüş qədər ağ,
Günəş kimi təmiz, gün kimi parlaq.
Gündüzün işığı ağlığındadır,
Ayın yaraşığı ağlığındadır.
Rənglər sünidir, dünyada bir ağ
Bilməyir sünilik, bilməyir boyaq
(Gəncəvi, 2004).

## NİZAMİ ALƏMŞÜNAS ALİM KİMİ

İngilis alimi Maksvell (1831-1879 ) elektrik və maqnit sahələri nəzəriyyəsini yaradaraq göstərdi ki, məkanın, yəni fəzanın hər hansı hissəsində dəyişən elektrik sahəsi yaranarsa, o sahəni əhatə edən fəzada qapalı maqnit sahəsi də yaranar. Bu hadisəni isə Nizami Gəncəvi XII əsrdə bədii dillə təsvir etmiş, dəyişən elektrik və maqnit sahələrinin fəzada yayılmasının elektromaqnit dalğaları olduğunu nəzmə çəkmişdir.

Elektromaqnit dalğalarının kvant təbiətini izah edərkən qeyd edilir ki, dalğaların şüalanma və udulmasını tədqiq edən alman alimi Qustav Kirxov 1859-cu ildə göstərdi ki, mütləq qara cisim, yəni tam qara rəng bütün elektromaqnit dalğalarını, o cümlədən 7 təbii rəngi uda və şüalandıra bilir. Ümumtəhsil məktəblərinin fizika kursunda tədris olunan elektromaqnit dalğalarının təbiətini N. Gəncəvi belə ifadə etmişdir:

Daxmada gecənin hörüklərindən
Yeddi rəng ipəklər toxuyuram mən....
Zülmət gecə ayı çıraqban eylər,
Soltanlar çətrini qaradan eylər.
Rənglərin yaxşısı qaradır, qara,
Balıq beli hara, sümüyü hara?
Qara tükdür verən gənclikdən nişan,
Qaranlıq göstərər ağ üzü cavan.
Göz, qarası ilə görər cahanı.
Kim görmüş ləkələr örtsün qaranı?
Gecə örtməsəydi qara ipəklər,
Ayın beşiyinə yarardı məgər?
Yeddi rəng tanıyır geniş asiman,
Qaradır rənglərə üstün hər zaman
(Gəncəvi, 2004).

Göründüyü kimi, Nizami Gəncəvi kainatda yeddi təbii rəngin mövcudluğunu, qara rəngin isə bu rənglərdən üstün xüsusiyyətə malik olduğunu görmüş və onu bədii dillə təsvir etmişdir. Əsərlərinin təhlili göstərir ki, o, təbiətdə mövcud olan, fundamental xarakter daşıyan saxlanma qanunlarının varlığını hələ XII əsrdə dərk etmiş və "İqbalnamə"də bədii surətdə göstərmişdir.

Su dönsə, torpaqda çiçək ətrinə,
Qayıdar əslinə o, bir gün yenə....
Torpaqda çürüyən bədənlərimiz,
Dağılır, dəyişir, yox olmur təmiz.
Yerində qalarsa, o dağıntılar,
Bir yerə yığanda yenə canlanar.
Torpağa tökülən şeylər tamamən,
Torpaqda dirçəlib qalxır yenidən
(Gəncəvi, 2004).

Nizami burada, ilk növbədə materiyanın saxlanma qanunlarını təsvir edir və göstərir ki, kainat və təbiətdə heç bir şey itmir, yox olmur, yenidən yaranmır, bir keyfiyyətdən başqa keyfiyyətə, bir haldan başqa hala keçir. Bunlar o dövr üçün mühüm olan elmi nəticə, elmi fikir idi.

Fizikada fotoeffekt hadisəsinin tədrisi zamanı işıq enerjisinin porsiyalarla şüalanmasını, hər bir porsiyanın zərrəciklərdən, yəni fotonlardan ibarət olmasını qeyd edərkən şairin yazdığı misralara nəzər salırıq:

Bir iki rind ilə get müsahib ol,
Axtar bu dünyada qüsursuz bir yol.
Zərrəylə dur, otur gün işığı tək,
Cəmşid sarayının fikrindən əl çək
(Gəncəvi, 2004).

Şairin "Leyli və Məcnun" əsərində olan bu misralar günəş şüalarının zərrəciklər selindən ibarət olduğuna işarədir. Bu da öz növbəsində Nizami Gəncəvinin fizika elminin bu sahəsi haqqında kifayət qədər bilik və məlumatlı olmasını deməyə zəmin yaradır. Bu bir həqiqətdir ki, Azərbaycanda elmin ayrı-ayrı sahələrinin tədricən dinamik inkişafı çox-çox əvvəllərdən başlanmışdır. Odur ki, məktəb fizika kursunun tədrisində yeri gəldikcə fizika elminin müxtəlif təcrübi və nəzəri sahələrinin inkişafında böyük xidmətləri olmuş, Şərqin, xüsusən azərbaycanlı alimlərin və mütəfəkkirlərin irsinə də müraciət etmək zəruridir. Azərbaycanın ümumtəhsil müəssisələrində fizikanın müqayisə metodu və inteqrativ üsullarla tədrisi haqqında tarixi həqiqətlərin açıqlanması şagirdlərin bu elmə marağının artmasına və onlarda milli mənlik şüurunun formalaşmasına böyük təsir göstərə bilər. Belə materialların seçilməsi, təhlili və sistemləşdirilməsinə diqqətin artırılması ilə xalqımızın dərin məzmunlu elmi-mənəvi irsinə rəğbət və hörmət etmiş olarıq.

### İstifadə edilmiş ədəbiyyat


1 Abbaszadə, A. (1998). "Məktəb fizika kursunun tədrisində tarixilik". Azərbaycan məktəbi, Bakı, №3, s.107-114.
2 Abdullayev, S.B., Vəliyev, L.M. (1991). "Nizami Gəncəvinin elm dünyası". Azərbaycan Dövlət Nəşriyyatı, Bakı, s.83.
3 Əliyarova, Z. (1980). "N.Gəncəvinin elmi irsindən fizika tədrisində istifadə". "Fizika və riyaziyyat tədrisi", №3 s.468.
4 Gəncəvi, N. (2004). "Xosrov və Şirin". "Yazıçı" nəşriyyatı, Bakı, 399 s.
5 Gəncəvi, N. (2004). "İqbalnamə". "Lider" nəşriyyatı, Bakı , s.494-689.
6 Gəncəvi, N. (2004). "Leyli və Məcnun". "Lider" nəşriyyatı, Bakı, 288 s.
7 Gəncəvi, N. (2008). "Sirlər xəzinəsi". "Yazıçı" nəşriyyatı, Bakı, 180 s.
8 Gəncəvi, N. (2011). "İsgəndərnamə". "Adiloğlu" nəşriyyatı, Bakı, 662 s.
9 Xalıqov, A.S. (2001). "Fizikanın tədrisi prosesində N.Gəncəvinin irsindən istifadə imkanları". Fizika, riyaziyyat və informatika tədrisi jurnalı, №4, s.20-26.
10 Qubatoğlu, B. (1993). "İpə-sapa düzülməmiş incilər". Azərbaycan Dövlət Nəşriyyatı, Bakı, 269 s.
11 Qurbanov, K. (2000). "Nizami Gəncəvi və Sokrat". "Azərbaycan müəllimi" qəzeti, 15-19 mart.
12 Qurbanov, K. (2000). "Nizami Gəncəvi yaradıcılığında etikanın kateqoriyaları". "Azərbaycan müəllimi" qəzeti, 29 dekabr.

# ŞƏXSİYYƏTYÖNLÜLÜK İDEYALARININ TARİXİ ƏHƏMİYYƏTİ VƏ GƏNC NƏSLƏ AŞILANMASI YOLLARI

**VİDADİ BƏŞİROV**
Pedaqogika üzrə fəlsəfə doktoru, Azərbaycan Dillər Universitetinin pedaqogika kafedrasının dosenti. e-mail: vidadi.besirov@mail.ru
https://orcid.org/0000-0003-1202-255X

**Məqaləyə istinad:**
Bəşirov V. (2021). Şəxsiyyətyönlülük ideyalarının tarixi əhəmiyyəti və gənc nəslə aşılanması yolları. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 109–113

**Məqalə tarixçəsi**
Göndərilib: 20.04.2021
Qəbul edilib: 05.05.2021

**ANNOTASİYA**

Məqalədə sosial-iqtisadi həyatın tərkib hissəsi olan təhsil prosesində cərəyan edən şəxsiyyətyönlülüyün təmin olunmasına verilən ənənəvi və müasir tələblər sisteminin qoyuluşundan, onun tarixi-müqayisəli təhlil məsələlərindən bəhs edilir. Xüsusən, ənənəvi paradiqmalarla yanaşı, müasir tendensiyalara əsaslanan, vətəndaş-cəmiyyət vəhdətindən irəli gələn milli və ümumbəşəri dəyərlər nümunəsindən faydalanmağın didaktik səciyyə daşıyan prioritet istiqamətləri haqqında mühakimələr yürüdülür. Araşdırılan problemin ən ümdə məqsədi keçmiş tarixi irsimizdə və bu gün təhsildə şəxsiyyətyönlülüyün təmin olunmasının böyüyən nəslin milli ruhuna, inkişaf dinamikasına, humanist və xəlqi keyfiyyətlərinə olan təsir imkanlarının müəyyənləşdirilməsidir. Məqalədə həm də Azərbaycan maarifpərvərlərinin şəxsiyyət tərbiyəsi ilə bağlı mütərəqqi ideyalarından bəhrələnməyin səmərəli yolları da açıqlanmışdır.

**Açar sözlər:** Təhsilin humanistləşdirilməsi, şəxsiyyətyönlülük tərbiyəsi, kamil şəxsiyyət, humanist pedaqogika.

# HISTORICAL SIGNIFICANCE OF THE IDEAS OF PERSONALITY-ORIENTATION AND WAYS OF INCULCATING THEM IN THE YOUNGER GENERATION

**VIDADI BASHIROV**
PhD in pedagogical sciences, Asso. Prof. of the department of Pedagogy in Azerbaijan University of Languages. e-mail: vidadi.besirov@mail.ru
https://orcid.org/0000-0003-1202-255X

**To cite this article:**
Bashirov V. (2021). Historical significance of the ideas of personality-orientation and ways of inculcating them in the younger generation. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 109–113

**ABSTRACT**

The article discusses the system of traditional and modern requirements for personality-orientation in the educational process, which is an integral part of socio-economic life, and the issues of its historical-comparative analysis. In addition to traditional paradigms, judgments are made on the didactic priorities of using the example of national and universal values based on modern trends and arising from the unity of civil society. The most important purpose of the problem investigated is to determine the possibilities of ensuring the orientation of personality in education in our past historical heritage and today in the national spirit of the growing generation, the dynamics of development, humanistic and popular qualities. For this reason, the article also reveals effective ways to benefit from the progressive ideas of Azerbaijani educators on personality education.

**Keywords:** Humanization of education, education of personality-orientation, perfect personality, humanistic pedagogy.

**Article history**
Received: 20.04.2021
Accepted: 05.05.2021

Bu gün yeniləşən cəmiyyətin bütün sferalarında Azərbaycanın müstəqilliyini qoruyub saxlamaq, onun milli-mənəvi dəyərlər sistemindən yüksək vətənpərvərlik nümunəsi kimi istifadə etmək zamanın tələbidir. İndiki dövrdə cəmiyyətin artan tələbatına uyğun nəsil formalaşdırmağın təsir imkanlarını gənclərə aşılamaq, işi aktual problem olaraq yeni əqidə və şüurlu münasibət əsasında, milli təhsil quruculuğu proqramları zəminində tənzimləməyi zəruri edir. Bu cəhətdən sosial-iqtisadi həyatın tərkib hissəsi olan təhsil prosesində şəxsiyyətyönlülüyün təmin olunmasına verilən innovativ tələblər sistemindən maksimum səviyyədə istifadə olunmalıdır. Bu məqsədlə böyüyən nəslin faydalanmasına aid bilikləri təlqin edən didaktik materiallar, yaradıcı iş nümunələri hazırlamaq, bu işə vətəndaş-cəmiyyət vəhdətindən irəli gələn prioritet istiqamət kimi baxmaq təqdirli sayıla bilər.

Təhsildə şəxsiyyətyönlülüyün təminatı problematikası ənənəvi və müasir pedaqoji fəaliyyət üçün həmişə önəmli olmuşdur. Milli maarifçiliyin və bəşəri keyfiyyətlərin gənc nəslin formalaşmasındakı rolu məhz bu baxımdan bütün zamanlarda aktual olmuşdur. Təlqin olunan fikirlərdən də tam yəqinliklə aydın olur ki, gənc nəslin milli-mənəvi, əxlaqi, ideya-siyasi, hüquqi vərdiş və bacarıqlara sahib olmasında şəxsiyyətyönlü təhsilin böyük təsir imkanları vardır. Bütünlüklə həm milli, həm də bəşəri məzmun daşıyan bu məsələ ümumxalq və ümumdövlət səviyyəli bir iş olub, zamanın sınaqlarından uğurla çıxan tarixi bir missiya olmuşdur. Təhsildə şəxsiyyətyönlülüyün təmin olunmasının gənclərin milli ruhunun formalaşmasına olan təsir imkanları həmişə aktual mahiyyət kəsb etmişdir. Bu gün də həmin problemlər ətrafında düşünüb, elmi-pedaqoji səpkidə tədqiqatların aparılmasına ciddi ehtiyac vardır.

"Şəxsiyyət", "şəxsiyyətyönlülük", "şəxsiyyət tərbiyəsi" məfhumları həm sosial-fəlsəfi, həm də ictimai-pedaqoji fikir tarixində başlıca milli və bəşəri dəyərlənmə məzmunu kəsb etmişdir. Xüsusən "şəxsiyyət" kateqoriyası öz dərin məndəricəsi ilə təhsilin inkişafında yüksək həyati status qazanmış, əxlaqi normaya, mənəvi yetkinliyə xidmət sferası yaratmışdır.

Ümumi halda şəxsiyyət probleminin pedaqoji və fəlsəfi məzmunda dərk olunması məsələsi ənənəvi və müasir təhsil proqramlarında, elmi-metodik, nəzəri-pedaqoji mənbələrdə birmənalı olaraq şəxsiyyətin mənəvi kamillik imkanlarının təkmilləşdirilməsinə xidmət edən konseptual dəyərlərlə səciyyələndirilmişdir. Şəxsiyyət problematikasının pedaqoji mahiyyətinə gəldikdə isə, bu barədə ilkin nəzəri-konseptual yanaşmalar haqqında bəhs olunan bitkin fikirlər qədim zamanlardan bu günümüzə qədər gəlib çatmışdır. Bu problem daim Azərbaycan maarifpərvərlərinin də diqqətini cəlb etmişdir.

Şəxsiyyətyönlülük paradiqmalarına münasibət bildirməyin didaktik əsasları pedaqogikanın da aktual problemi olmuş, hər tarixi dövrün pedaqoji cərəyanlarında, ideya-siyasi məfkurəsində, milli-mənəvi dəyərlər sistemində bu işin tarixi-müqayisəli təhlilini əks etdirən baxışlar sisteminə çevrilmişdir. Xüsusən mütərəqqi pedaqoji fikir tarixində "şəxsiyyət", "şəxsiyyətyönlülük" tendensiyalarına sosial-fəlsəfi mündəricədən yanaşma prosesində pedaqogika təlim və tərbiyənin əldə olunmuş dəyərlərinin nəzəri-praktik mənbəyini mənimsətmək vəzifəsini öhdəsinə götürmüşdür. Lakin tarix yenilənir, yeni məzmun və keyfiyyət kəsb edir. Bu isə təbii şəkildə elmlərə, təlim və tərbiyə işinə, o cümlədən pedaqogikaya öz təsirini göstərir.

"... Müasir yenilənmə və sivilizasiya dövründə təhsil sistemi dəyişməkdədir, milli təhsil konsepsiyası meydana gəlmişdir. Bu, imkan verir ki, istər müəllimlər, istərsə də tələbələr pedaqogika fənninə yaradıcı, bir qədər də polemik nəzərlə yanaşsınlar. Belə halda ənənəvi, mühafizəkar baxışlardan azad olmaq mümkündür" (Talıbov, Ağayev, İsayev, Eminov, 1993). Bu mənada şəxsiyyətyönlü təhsil ideyasının təməl platformasına, onun tarixi və müasir inkişaf dinamikasına diqqət yetirdikdə məlum olur ki, "şəxsiyyət" məfhumu pedaqoji ədəbiyyatda iki cür yanaşma məzmunu ehtiva edir: şəxsiyyət və şəxsiyyət pedaqogikası. Şəxsiyyət anlamının özü də həm pedaqoji mənada, yəni həyatda hər kəsin qazanmış olduğu mənəvi

keyfiyyətlərin daşıyıcısı olaraq, həm də “filankəs şəxsiyyətdir” qənaəti ilə, fəlsəfi aspektdən səciyyələndirilən şəxsiyyət anlamında başa düşülür.

Ümumiyyətlə, pedaqoji ədəbiyyatda müasir anlamda vətəndaşlıq statusu qazanmış şəxsiyyətyönlü təhsil nəzəriyyəsi metodoloji prinsip kimi “şəxsiyyət pedaqogikası” haqqında olan pedaqoji düşüncələrdən, hər tarixi dövrə məxsus pedaqoji cərəyanlardan nəşət almışdır. Bu yöndən tam yəqinliklə söyləmək olar ki, “şəxsiyyət pedaqogikası” nəzəriyyəsinin yaradıcısı alman pedaqoqu Hüqo Qandiq olmuşdur. Qandiqə görə, şəxsiyyət anadangəlmə fərdi xüsusiyyətlərlə mədəni mühit arasındakı qarşılıqlı təsirlərin nəticəsidir (Rüstəmov, Rocers, 2019). Bu fikir pedaqogika tarixində irəli sürülmüş mütərəqqi fikirlərdən biri kimi qiymətləndirilməlidir. Şəxsiyyətin mahiyyəti barədə Qandiqin həmin fikri Leypsiq qadın müəllimlər seminariyasında təlim-tərbiyə işinin, habelə onun yaratdığı “Pedaqoji hərəkat”ın nəzəri əsasını təşkil etmişdir.

“İnsan xarakterini anadangəlmə fərdi xüsusiyyətlərlə ətraf mühit arasında qarşılıqlı əlaqələrin məhsulu hesab edən və təlim-tərbiyə işini bu əsasda qurmağı məsləhət görən pedagogika şəxsiyyət pedaqogikasıdır” (Kazımov, 2011). Göründüyü kimi, pedaqogikada şəxsiyyət zəminində insan yetişdirməyin pedaqoji prinsipləri haqqında müəyyən qədər idealizə olunmuş fakt və hadisələrə yanaşma tərzi diqqəti həmişə cəlb etmişdir.

Məlumdur ki, XIX əsrin sonu, XX əsrin əvvəllərində milli təəssübkeşlərimiz Azərbaycanın təhsil, elm və mədəniyyəti ilə bağlı öz əhəmiyyətini bu gün də itirməyən qiymətli elmi-nəzəri mülahizələr irəli sürmüşlər. Onlar elmi-pedaqoji ideyalarında insan xarakterinin formalaşmasında milli vətənpərvərlik təliminin başlıca cəhətlərini tutarlı faktlarla əsaslandırmış, bu işin konkret icra fəaliyyətini göstərmişlər. Bu mənada dövrünün görkəmli simalarının xalqın milli intibahında, mədəni tərəqqisində oynadığı rol misilsizdir. “Onların kamil şəxsiyyət kimi yetişməsində vətənpərvər ruh aşılayan ideyaları ilə bağlı ədəbi-tarixi və elmi-nəzəri fikirləri qabaqcıl meyillərlə bağlı olmuş, gənc nəslin bu ruhda təhsillənməsinə rəvac vermişdir” (Bəşirov, 2016).

Şəxsiyyət problemi, onun inkişafı, tərbiyəsi və qarşılıqlı əlaqələri Şərq fəlsəfəsinin pedaqoji, psixoloji fikrinin də həmişə hədəfi olmuşdur. Bu istiqamətdə Nizami Gəncəvinin, Məhəmməd Füzulinin, İmadəddin Nəsiminin, Nəsirəddin Tusinin, Marağalı Əvhədinin, habelə Sədi Şirazinin, İmam Qəzzalinin, Cəlaləddin Ruminin və başqalarının dəyərli fikirləri, şəxsiyyətin tərbiyəsinə dair qiymətli öyüd-nəsihətləri məlumdur.

Şəxsiyyətin inkişafı, təlimi, təhsili, yaş xüsusiyyətləri Azərbaycan xalq pedaqoji fikrində də özünə möhkəm yer tutmuş, bu barədə xalqın düşüncələri, mülahizələri bütün dövrlərdə yüksək dəyərə malik olmuşdur. Belə ki, şəxsiyyət və şəxsiyyətyönlü təhsillə bağlı ötən əsrdən başlayaraq istər Azərbaycanda, istərsə də xarici ölkələrdə alimlər, xüsusilə pedaqoq və psixoloqlar daha ciddi və sistemli tədqiqat işləri aparmış, çoxsaylı məqalələr, elmi əsərlər yazmışlar. Bu sahədə aparılan tədqiqat işləri çox geniş sahəni əhatə etdiyindən müəlliflər şəxsiyyətin çoxyönlü sahələrini, müxtəlif cəhətlərini diqqətlə araşdırmışlar. Məsələyə başqa prizmadan yanaşsaq, şəxsiyyət problemi ilə təkcə pedaqoq və psixoloqlar məşğul olmamış, onun tədqiqi ilə həmçinin filosoflar, sosioloqlar, bioloqlar, fizioloqlar da maraqlanmış və bu problem bir çox humanitar elm sahələrinin – etika, estetika, hüquq elminin tədqiqat sahəsi olmuşdur. Bu səbəblərə görə də şəxsiyyət və şəxsiyyətyönlülük probleminə müxtəlif mövqelərdən yanaşılmış, xeyli ciddi əsərlər yazılmışdır.

Şəxsiyyətin həyatda fəal mövqe tutması, ictimai borca şüurlu münasibət bəsləməsi, sözü ilə əməlinin vəhdət təşkil etməsi onu yüksək mənəviyyat zirvəsinə qaldırır, həyatda ona əxlaqi davranış və zəka, mədəniyyət, ağıl fəzilətləri bəxş edir. “Şəxsiyyət” dedikdə, şüurlu fəaliyyət göstərən, sosial münasibətlərdə iştirak edən, yaxşı əməllər sahibi olan, ətraf aləmi yaxşılaşdıran və bu barədə düşünən xeyirxah, humanist insan nəzərdə tutulur (İbrahimova, Hüseynzadə, 2013). 1970-1980-ci illərdə şəxsiyyətin inkişafına sırf tərbiyə funksiyalarını

yerinə yetirən bir sistem kimi baxılırdısa, 1990-cı illərdə həmin tendensiya dəyişdi və tərbiyəvi işlərdə də təlim komponentlərinin olduğu müəyyən edildi. Burada da insanın davranışı üçün zəruri olan şəxsiyyətyönlü bilik, bacarıq, vərdiş və mənəvi keyfiyyətlər sistemi öyrədilir. Son illərdə yazılan dərslik nümunəsində də (Pedaqogika, 2019) aydın hiss olunur ki, biliklər sisteminə əsaslanmayan tərbiyə sistemi və prosesi yoxdur. Bu o deməkdir ki, gənc nəslin şəxsiyyətyönlü təhsil proqramında sinif-dərs sistemindəki bütün fəaliyyət növləri təhsilləndirici, tərbiyəedici və inkişafetdirici funksiyaları yerinə yetirdiyi kimi, sinifdənxaric və məktəbdənkənar şəraitdə həyata keçirilən bütün proseslərdə də şəxsiyyətyönlülüyün inkişafı üçün mühüm işlər həyata keçirilməlidir. Bu hansı zərurətdən irəli gəlir? İlk olaraq onu deməliyik ki, müasir dövrdə yeni pedaqoji, psixoloji konsepsiyalara görə, şagirdin, tələbənin bir şəxsiyyət kimi formalaşdırılması, kamil şəxsiyyət səviyyəsinə çatdırılması və inkişaf etdirilməsi üçün bütün öyrədici sferalarda təhsil humanistləşdirilməli, demokratikləşdirilməli, humanitarlaşdırılmalıdır. Şəxsiyyət təlimi təhsilləndirici, inkişafetdirici və tərbiyəedici olmalı, fərdiləşdirilməli və diferensiallaşdırılmalıdır. Çünki yeni pedaqoji təfəkkürdə şagirdin, tələbənin bir şəxsiyyət kimi formalaşdırılması təhsil sisteminin başlıca vəzifəsi hesab olunur. Bu vəzifənin reallaşdırılması üçün təhsil şəxsiyyətyönlü olmalı, humanist və demokratik prinsiplər əsasında qurulmalıdır.

Əməkdar elm xadimi Fərrux Rüstəmov problemin didaktik qanunauyğunluqlarını müəyyənləşdirən nəzəri ideyalarını “Karl Rocers və şəxsiyyətyönlü təhsil” adlı tədqiqatında şərh etməklə, problemin mahiyyəti ilə bağlı fikirlərini tanınmış Amerika psixoterapevti, pedaqoqu və psixoloqu Karl Rocersin (1902-1987) təhsil nəzəriyyələri əsasında davam etdirərək maraqlı müddəalar irəli sürür. O yazır: “Müasir pedaqoji yanaşmaya görə, təhsil-tərbiyə problemlərinin həlli prosesində şagirdin şəxsiyyəti ön planda durmalı, müəllim-fasilitator üçün şagirdin mövcud durumu onun keçmişindən və gələcəyindən daha önəmli olmalıdır... Müəllimlərin fərdiliyinin və ülviliyinin təzahürü, mənəvi kamilliyi və mənəvi-əxlaqi keyfiyyətləri şagird şəxsiyyətinin formalaşmasında mühüm əhəmiyyət kəsb edir” (Rüstəmov, Rocers, 2019). Bunun zəruriliyini şərtləndirən amil isə təhsilin demokratikləşdirilməsidir.

Şəxsiyyətyönlü təhsil ideyası müasir pedaqogikanın ən aktual mahiyyət və məzmun kəsb edən, müvafiq konsepsiyalar əsasında araşdırılan köklü problemlərindən biridir. Problemin müasir pedaqoji fikir tarixində yeni bir tendensiya olaraq ictimai dəyərliliyi böyükdür. Şəxsiyyətyönlü təhsilin inkişafı üçün xarakterik olan xəlqilik, demokratizm, humanizm, millilik, bəşərilik kimi ideyaların ənənəvi və müasir konsepsiyalarını araşdırmaq böyük maraq doğurur, bu sahədə dəyərli nümunələrdən istifadə təcrübəsinin faydalı bir mənbə olduğunu sübut edir.

Gəldiyimiz nəticə belədir ki, şəxsiyyət-yönlülük, əsasən, humanist keyfiyyətlər sistemini özündə ehtiva edən, milli və ümumbəşəri xüsusiyyətlərin məcmusu kimi gənc nəslin milli qüruru və zəngin dünyagörüşü əsasında formalaşan sistemli bir məsələdir. Ona görə də məqalədə irəli sürülən təkliflərdən faydalanmaq, pedaqoji prosesdə bir mənbə kimi istifadə etmək müəllim əməyini stimullaşdırar, təhsilalanların bir şəxsiyyət olaraq formalaşmasını təmin edər.

## İstifadə edilmiş ədəbiyyat


1. Bəşirov, V.P. (2016). Humanist pedaqogikanın hədəfləri. “Azərbaycan müəllimi” qəzeti. №38, Bakı.
2. “Əkinçi” qəzeti. (1877). №8. Bakı.
3. İbrahimova, F.N., Hüseynzadə, R.L. (2011). Pedaqogika. Bakı, “Mütərcim”.
4. Kazımov, N.M. (2011). Ali məktəb pedaqogikası. Bakı, “Çıraq”.
5. Rüstəmov, F.A., Rocers, K. (2019). Şəxsiyyətyönlü təhsil. Bakı, “Elm və təhsil”.
6. Talıbov, Y.R., Ağayev, Ə.A., İsayev, İ.N., Eminov, A.İ. (1993). Pedaqogika. Bakı, “Maarif”.
7. “Tərcüman” qəzeti. (1906). №2. Krım (Bağçasaray).

# BƏDƏN TƏRBİYƏSİ VƏ İDMANIN TƏDRİSİNDƏ HƏRƏKİ ADƏT VƏ VƏRDİŞLƏRİN ROLU

**GÜLNARƏ ƏLİXANOVA**
Psixologiya üzrə fəlsəfə doktoru, Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi. e-mail: gulnare.alixanova@mail.ru
https://orcid.org/0000-0002-5241-0250

**Məqaləyə istinad:**
Əlixanova G. (2021). Bədən tərbiyəsi və idmanın tədrisində hərəki adət və vərdişlərin rolu. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 114–120

**ANNOTASİYA**

Məqalədə bədən tərbiyəsi və idman fənninin tədrisinin orqanizmin harmonik inkişafında, təhsilalanların sağlamlığının qorunmasında, güclü şəxsiyyət kimi formalaşmasında mühüm əhəmiyyətə malik olmasından bəhs edilir. Qeyd olunur ki, son dövrlərdə beynəlxalq miqyasda əldə olunan nailiyyətlər aparılan təhsil islahatlarının qlobal xarakterinin milli zəmin üzərində formalaşmış bəşəri mahiyyətini göstərir. Bütün bunlar müasir Azərbaycan təhsilinin simasının dəyişdiyini ifadə edir. Aparılan ilkin araşdırmalar bu dəyişikliklərin məhz müəllimin, şagirdin, valideynin, ümumiyyətlə, təhsildə marağı olan bütün iştirakçıların psixoloji fəaliyyətində özünü göstərdiyini təsdiq edir. Şəxsiyyətin maraq və ehtiyaclarını, arzu və istəklərini əsas götürməklə təhsilalanların psixoloji mənafeyinə xidmət göstərmək Azərbaycan təhsilinin qarşısında mühüm vəzifə kimi dayanır.

**Açar sözlər:** Fiziki inkişaf, psixi sağlamlıq, bədən tərbiyəsi, motiv, məqsəd.

**Məqalə tarixçəsi**
Göndərilib: 05.04.2021
Qəbul edilib: 03.05.2021

# THE ROLE OF MOTOR HABITS IN THE TEACHING OF PHYSICAL EDUCATION AND SPORTS

**GULNARA ALIKHANOVA**
PhD in psychology, Senior lecturer of Azerbaijan State Pedagogical University. e-mail: gulnare.alixanova@mail.ru
https://orcid.org/0000-0002-5241-0250

**To cite this article:**
Alikhanova G. (2021). The role of motor habits in the teaching of physical education and sports. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 114–120

**Article history**
Received: 05.04.2021
Accepted: 03.05.2021

**ABSTRACT**

The article discusses the importance of teaching physical education and sports in the harmonious development of the body, protecting the health of students, the formation of a strong personality. It is noted that the recent achievements at the international level reflect the human nature of the global nature of educational reforms, formed on a national basis. All this means that the image of modern Azerbaijani education has changed. Preliminary research confirms that these changes are reflected in the psychological activity of teachers, students, parents, and all participants interested in education in general. Serving the psychological interests of students based on the interests and needs, desires and aspirations of the individual is an important task for Azerbaijani education.

**Keywords:** Physical development, mental health, physical education, motive, purpose.

## Giriş

Dünyanın təhsil məkanında sadəcə bilik, bacarıqlar deyil, dəyərlər, səriştələr, vərdişlər şəxsiyyətin psixoloji inkişafında mühüm amillər kimi qiymətləndirilir və bugünkü təhsilin keyfiyyət göstəriciləri kimi qəbul edilir. Hazırda Azərbaycan özünün təhsil sistemini dünyanın ən mütərəqqi ölkələrinin təhsil prinsiplərindən istifadə etməklə təkmilləşdirir, məzmun və struktur dəyişiklikləri mərhələlərlə aparılır.

Cəmiyyətimizin ehtiyac və tələbatlarına uyğun təhsil sisteminin qurulmasında demokratiklik, inteqrasiya, diferensiallaşma, fərdiləşmə, humanistləşmə və humanitarlaşma mühüm pedaqoji-psixoloji prinsiplər kimi nəzərə alınır. Əlbəttə, bunlar təhsil müəssisələrində keçirilən bədən tərbiyəsi və idman dərslərinə də öz təsirini göstərir. Çünki idman insanları həm fiziki, həm psixoloji, həm də mənəvi cəhətdən yüksəldən bir vasitədir. İdmanla məşğul olan hər bir şəxs həm özünün fiziki sağlamlığını təmin edir, həm də cəmiyyətdə idmanın, bədən tərbiyəsinin insan üçün psixoloji cəhətdən nə qədər lazımlı olduğunu sübut edir. Bədən tərbiyəsi, hər bir sivil xalqda olduğu kimi, Azərbaycan vətəndaşlarının da həyat tərzinin mühüm bir hissəsidir (Quliyev, 2009).

İdmanla məşğul olmaq uşaqların fizioloji və psixoloji sağlamlığı üçün çox faydalıdır. Uşaq və yeniyetmələrin idmana istiqamətləndirilməsini zəruri edən amilləri aşağıdakı kimi qruplaşdırmaq olar:

- özünəgüvənin, mənlik dəyərinin artmasına təsir edir;
- liderlik bacarığını formalaşdırır;
- xarakterdə müsbət xüsusiyyətlərin formalaşmasına təsir göstərir;
- yaşıdlarla dostluq münasibətləri qurmaq bacarığı formalaşdırır;
- fiziki görünüşə müsbət təsir göstərir.

Bədən tərbiyəsi və idman orqanizmin harmonik inkişafında, möhkəmləndirilməsində, məktəblilərin psixoloji tərbiyəsinin və sağlamlığının qorunmasında, mənəviyyatın və əzmkarlığın formalaşmasında da çox mühüm əhəmiyyətə malikdir. Bu xüsusiyyətləri aşılamaq, vacib olan tədbirləri düzgün icra etmək isə müəllimlərin üzərinə düşür. Məsələn, məktəbdə ibtidai sinfin ilk illərindən şagirdlərə düzgün yerimək, tullanmaq, dırmanmaq öyrədilməli, habelə digər fiziki bacarıq və vərdişlərin təkmilləşdirilməsi üçün zəruri metodlar tətbiq edilməli, təbii şəraitdə müxtəlif növ hərəkətlərin, oyunların, əyləncələrin öyrədilməsi üçün bacarıq və vərdişlər aşılanmalıdır.

Fiziki tərbiyə müəllimləri və məşqçilər uşaqların, yeniyetmələrin fiziki və psixi inkişafında, sağlamlığının qorunmasında, orqanizmin fizioloji tamlığının saxlanılmasında, idman nailiyyətlərinin qazanılmasında məşqlərin səmərəli aparılmasına və fiziki yükün məşqlərarası psixoloji cəhətdən düzgün bölüşdürülməsinə xüsusi diqqət yetirməlidirlər. Buna nail olmaq üçün müəllim və məşqçilərdən insan orqanizminin psixoloji xüsusiyyətləri və inkişaf istiqamətləri haqqında geniş informasiya bazasına malik olmaq, innovativliyi qorumaq və psixoloji inkişafa zəmin yaratmaq tələb olunur.

Fiziki tərbiyə dərslərini proqram əsasında, müasir tələblərə uyğun və düzgün metodoloji və psixoloji yanaşma ilə təşkil etmək, şagirdyönlülüyə xidmət edən stimullaşdırıcı, səmərəli və inkişafetdirici oyunlar qurmaqla daha maraqlı etmək, keyfiyyətli tədrisin əldə olunmasına zəmin yaratmaq mümkündür. Bunları həyata keçirmək üçün fənn müəllimlərindən yüksək səviyyədə işgüzarlıq, zəhmətkeşlik, əzmkarlıq, psixoloji cəhətdən özünəinam, şəxsiyyətyönlü yanaşma təfəkkürü və əsl pedaqoji-psixoloji qabiliyyətlər tələb olunur (Qoqunov, 2005).

Fiziki tərbiyə kurikulumu ümumtəhsil məktəblərində şagirdlərin hərəki bacarıq və vərdişlərinin formalaşması, hərəki qabiliyyətlərin inkişaf etdirilməsi, sağlamlığın qorunması və reabilitasiyası üzrə fəaliyyətləri istiqamətləndirən konseptual sənəddir.

Fiziki tərbiyə kurikulumu nəticəyönlü xarakterə malikdir. Bu sənəddə məzmun materialları bacarıqlar formasında ifadə edilmişdir. Bu zaman fiziki tərbiyə fənninin təlimi prosesində şagirdlərin idraki, emosional, xüsusən də psixomotor fəaliyyələrinin nəzərə alınması diqqət mərkəzində saxlanılmışdır.

Kurikulumun hazırlanmasında başlıca istiqamət şagirdlərə yönəldilmişdir. İlk növbədə ümumi təlim nəticələrinin, sinif standartlarının hazırlanmasında şagird fəaliyyətinin izlənməsi, inkişaf etdirilməsi əsas götürülmüşdür. Eləcə də təlim strategiyasında, nailiyyətlərin qiymətləndirilməsində şagirdlərin bir subyekt kimi bütün fəaliyyətlərin mərkəzində dayanması zəruri tələb kimi nəzərə alınmışdır.

**1. Fiziki tərbiyənin əhəmiyyəti.** Fiziki tərbiyənin insanın harmonik fiziki və psixi inkişafını təmin etməklə, mənəvi-iradi dayanıqlılığını formalaşdırmaqla cəmiyyətdə müstəsna əhəmiyyətə malik olması, ilk növbədə onun xarakterik xüsusiyyətləri ilə əlaqədardır.

**2. Fiziki tərbiyənin yüksək fərdi xüsusiyyətlərin formalaşmasında əhəmiyyəti.** Ümumtəhsil müəssisələrində fiziki tərbiyənin tədrisi qarşısında qoyulan əsas məqsədlərdən ən əhəmiyyətlisi vətənini, xalqını, millətini sevən, fiziki və psixoloji cəhətdən hazırlıqlı, nümunəvi əxlaqi davranışa və qarşılıqlı münasibətlərə malik, mübariz və tolerant insan tərbiyə etməkdir. Kollektivin, komandanın mənafeyi uğrunda mübarizə, vətənpərvərlik, rəqibə hörmət, tolerantlıq, mübarizlik və çevik qərar qəbul edərək onu reallaşdırmaq kimi fərdi xüsusiyyətləri formalaşdırır.

**3. Fiziki tərbiyənin sağlamlaşdırıcı və inkişafetdirici əhəmiyyəti.** Optimal hərəkət, fiziki yük insanın psixomotor fəaliyyətinin formalaşmasında mühüm rol oynayır. Ayrı-ayrı hərəki qabiliyyətlərin inkişafına yönəlmiş fiziki yükün dərs prosesində tətbiqi qan dövranının intensivləşdirilməsi ilə orqanizmin inkişafını təmin edən maddələr mübadiləsini və müxtəlif funksional sistemlərin işini xeyli yaxşılaşdırır. Bu cəhətdən də müntəzəm fiziki yük inkişafda olan orqanizmin sağlamlığı və möhkəmləndirilməsi üçün olduqca zəruri psixoloji əhəmiyyət daşıyır.

**4. Fiziki tərbiyənin maarifləndirici əhəmiyyəti.** Fiziki tərbiyə prosesində insan sağlamlığı və ona təsir edən amillər haqqında geniş informasiyanın əldə edilməsi, sağlamlığın qorunması, möhkəmləndirilməsi və reabilitasiyası üçün psixoloji vasitələrdən istifadəyə dair biliklərə, metodlara yiyələnmə özünün "sağlam olmaq məsuliyyəti"ni dərk edən, "psixoloji sağlamlıq mədəniyyəti"nə malik olan gənclərin cəmiyyətə psixoloji inteqrasiyası üçün mümkün şərait yaradır.

**5. Fiziki tərbiyənin tətbiqi əhəmiyyəti.** Hazırda yüksək fiziki və psixoloji hazırlıq tələb edən peşə sahələri mövcuddur. Orduda, ölkənin müdafiəsində, güc strukturlarında, fövqəladə hallarda xilasetmə xidmətləri və s. belə fəaliyyət sahələrinə aiddir. Qeyd olunan fiziki hazırlığın əsası isə insanın fiziki və psixi inkişafının daha intensiv dövrünə təsadüf edən ümumtəhsil məktəblərində, fiziki tərbiyə prosesində qoyulur. Həyati əhəmiyyət kəsb edən bacarıqların formalaşdırılması fiziki və psixoloji hazırlığın artırılması həyatda rast gəlinməsi mümkün olan ekstremal şəraitlərdə insanın uğurlu fəaliyyətinə önəm yaradır.

**6. Fiziki tərbiyənin mahiyyəti, məqsədi və vəzifələri.** Ümumtəhsil məktəblərində şagirdlərin fiziki və psixoloji tərbiyəsi böyüyən nəslin sağlamlığını, fiziki hazırlığını özündə birləşdirən psixoloji-strateji əhəmiyyətə malik sahələrdən biridir. Fiziki tərbiyənin əsas məqsədi şagirdlərin hərtərəfli fiziki və psixi inkişafının, hərəki mədəniyyət və mənəvi, emosional-iradi xüsusiyyətlərinin formalaşdırılmasının təmin edilməsidir. Bu fənnin tədrisi ayrı-ayrı təhsil səviyyələrində şagirdin fiziki və psixi inkişafı ilə əlaqədar aşağıdakı fərqli səciyyəvi xüsusiyyətlərə malikdir:

- tam orta təhsil səviyyəsində idman növlərində texniki, taktiki, psixi fəaliyyətlərin və hərəki qabiliyyətlərin yaş qrupunun fərdi psixoloji tələblərinə müvafiq təkmilləşdirilməsi nəzərdə tutulur. Bu mərhələdə fənnin tədrisinin səciyyəvi psixoloji xüsusiyyətləri də diqqətə alınmalıdır;
- sağlamlığın möhkəmləndirilməsi, hərəki qabiliyyətlər, onların psixoloji inkişafı metodları, müstəqil məşğələlərin təşkili biliklərinin təkmilləşdirilməsi;
- fiziki, psixoloji hazırlığın təkmilləşdirilməsi və düzgün qamətin formalaşdırılması metodikasından istifadə etmək bacarığına yiyələnməsi;

- fiziki yükün icrası zamanı orqanizmin funksional vəziyyətinə nəzarət və sadə psixoloji bərpa vasitələrindən istifadəetmə bacarığının formalaşdırılması;
- ilk tibbi yardım üsullarından istifadənin təkmilləşdirilməsi;
- komandalı fəaliyyət zamanı qarşılıqlı əməkdaşlıq formasından istifadə bacarığına yiyələnilməsi;
- psixoloji hərəki mədəniyyət fəaliyyətinin təkmilləşdirilməsi;
- ekstremal şəraitlərdə fiziki və mənəvi, emosional-iradi potensialı reallaşdırmaq bacarığının formalaşdırılması.

Bu təhsil səviyyəsində psixoloji hərəki bacarıq və vərdişlər təkmilləşdirilir, hərəki qabiliyyətlərin dinamik inkişafı təmin edilir. Hərəkətlərin təyinatı və məqsədyönlü istifadəsi haqqında biliklər mənimsənilir. Bu və ya digər idman növünə psixoloji uyğunluq, meyil və maraq müəyyənləşdirilir. Eyni zamanda şagirdlərin potensial imkanlarının reallaşdırılması üçün lazımi şərait yaradılır, seçmə və idman orientasiyası təmin edilir. Fənnin tədrisi şagirdlərdə mübarizlik ruhu, mənəvi, emosional-iradi keyfiyyətlər, şəraiti təhlil etmək və çevik qərar qəbul etmək bacarığı, məsuliyyət hissi, rəqibə hörmət, vətənə sevgi və məhəbbət hisləri oyadır.

**7. Fiziki tərbiyənin reabilitasiya əhəmiyyəti.** Ümumtəhsil müəssisələrində müəyyən fiziki qüsuru olan və ya zədələnmələrə məruz qalmış insanlarda dayaq-hərəkət aparatındakı problemlər, müəyyən xəstəlikdən sonrakı zəruri hərəki reabilitasiya fiziki və psixoloji tərbiyə vasitəsi ilə aradan qaldırılır.

"Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)" çərçivə sənədində müəyyən edilmişdir ki, ümumi təhsil məktəblərində fiziki tərbiyənin tədrisi vasitəsilə:

- İbtidai təhsil pilləsində sağlamlığın möhkəmləndirilməsi və qorunmasında fiziki tərbiyənin mühüm amil olduğunun dərk edilməsi təmin olunur.
- Əsas təhsil pilləsində fiziki tərbiyənin hərəki bacarıq və vərdişlərin şəxsiyyətin formalaşmasında mühüm amil olduğu haqqında biliklər zənginləşdirilir.
- Orta təhsil pilləsində hərəki bacarıq və vərdişlər təkmilləşdirilir, şəraiti təhlil etmək və çevik qərar qəbul etmək bacarığı, kollektiv fəaliyyət zamanı məsuliyyət hissi, rəqibə hörmət, vətənə sevgi və məhəbbət hisləri tərbiyə olunur.

Bədən tərbiyəsi dərsləri və idman məşğələləri fəaliyyətin digər növlərindən özünün kəskin və qüvvətli psixoloji emosionallığı ilə fərqlənir. İdman fəaliyyəti prosesində orqanizmdə bir sıra psixoloji dəyişikliklər baş verir, ümumi gümrahlıq artır. Bədən tərbiyəsi dərsləri və idman fəaliyyətində icra ediləcək hərəkətlərin ritmi zahiri görünüşə də təsir edir. Ümumiyyətlə, məşğul olduğu idman növündən asılı olmayaraq hər bir idmançının nümayiş etdirdiyi hərəkət, ilk növbədə özünün zahiri əlamətlərinin gözəlliyi ilə seçilməlidir (İlin, 2010).

Məişət, əmək hərəkətləri ilə yanaşı idman vərdişləri də insanın həyat və fəaliyyətində mühüm rol oynayır. İdman vərdişlərinə yiyələnməklə insanda yeni hərəkət formalarının təşəkkülü və hərəki aparatın yüksək inkişafı təmin olunur. Vərdişlər yarandıqda hərəkətlər avtomatlaşır. Lakin icra olunan fəaliyyət yenə də şüurlu fəaliyyət olaraq qalır. Bununla belə insanların yiyələndikləri hərəkət vərdişlərinin bir qismi, məsələn: yerimək, geyinmək, bədəni müvafiq vəziyyətdə saxlamaq kimi məişət vərdişləri dəfələrlə təkrarlanaraq tam avtomatlaşmış prosesə çevrilir. İdmanla bağlı vərdişlər daim icra edilən işə məsuliyyətli psixoloji münasibət bəsləməklə bağlı olur. Məhz ona görə də, idman vərdişləri həmişə şüurlu icra edilən iş kimi hafizədə qalır. Bu zaman idmançının öz hərəkətlərini psixoloji cəhətdən dərk etməsi zərurəti meydana çıxır.

İdman vərdişlərinin əsası planlı şəkildə məktəb illərində qoyulduğundan bədən tərbiyəsi müəllimləri və məşqçilər şagirdlərdə ilkin idman vərdişlərinin düzgün təşkilinə ciddi fikir verməlidirlər (Shaboltas, 1998). Pedaqoji–psixoloji ədəbiyyata görə idman fəaliyyətində hərəki vərdişlərin yaranması dörd mərhələdən keçir (İsmayılov, 1994).

I mərhələ – öyrənilməli olan vərdişlər haqqında dəqiq və sistemli təsəvvürlərin yaradılması;

II mərhələ – nəzəri biliklərin əməli tətbiqi və hərəki proseslərdə nümayiş etdirilməsi;

III mərhələ – hərəki vərdişlərin ən kiçik səhvlərə yol vermədən, avtomatlaşmış halda, yüksək ritm, temp və psixoloji savadlılıqla icrası;

IV mərhələ – avtomatlaşma səviyyəsinin idman növünün tələblərinə, idmançının şəxsi keyfiyyətlərinə müvafiq tərzdə qorunması.

Hər bir mərhələnin təşkilində və müvəffəqiyyətlə başa çatdırılmasında sözdən istifadənin psixoloji rolu da nəzərə alınır. Ona görə də şərhetmə və izahat işlərinin mərhələlərlə həyata keçirilməsi zamanı fərdi xüsusiyyətlərin ayrı-ayrılıqda nəzərə alınması başlıca məsələdir. Şagirdlərdə idman bacarığı və vərdişlərinin bu sahəyə olan maraqdan asılılığı məktəb praktikasında xüsusi əhəmiyyət kəsb edir (Shaboltas, 1998).

Təhsilalanlarda tam hərəki obrazların yaranması çox zaman müəllimin hərəkəti necə icra etməsindən və göstərməsindən asılı olur. Hərəkətləri sözlə təsvir edib qavramaq şagirdlərdə real obrazların fərqli təsəvvürlərini formalaşdırır. Ona görə də şagirdlər idman hərəkətlərinin mənimsənilməsi prosesində icrasına başladığı fiziki hərəkətin, mütəhərrik idman oyunlarının yerinə yetirilməsi üçün lazım olan fəndlərin tətbiqini bilməli, qarşıya çıxan çətinlikləri dərk etməli, mövcud vəziyyətə düzgün qiymət verməyi bacarmalıdırlar.

Son dövrlər orta məktəb şagirdlərinin çoxunda, həm ibtidai, həm də yuxarı sinif şagirdlərində onurğa əyriliyi, kifoz və skolioz kimi arzuolunmaz xəstəliklər açıq şəkildə özünü göstərir. Buna səbəb məktəblilərin vaxtlarının çoxunu (məktəb dərslərində, evdə ev tapşırıqlarını yerinə yetirərkən, uzun müddətli kompüter arxasında) oturaq vəziyyətdə keçirməsidir. Nəticədə bel əzələləri düzgün formalaşmır, skolioz, kifoz kimi qamət pozulması baş verir.

Məktəbyaşlı uşaqlarda düzgün oturma bacarığı olmadığından, onların onurğa sütunu bir çox hallarda deformasiyalara məruz qalır. Uşaqların oturuşuna evdə valideynlər, bağçada və məktəbdə isə müəllimlər nəzarət etməlidirlər. Uşaqlar arasında son illər fiziki aktivlik azalmışdır. Hipodinamiya və hipokineziyanın azalması da bu xəstəliklərin artmasında rol oynayır. Uşaq oturaq vəziyyətdə uzun müddət dayanırsa, tədricən skolioz və kifoz xəstəlikləri meydana gəlir. Ona görə çalışmaq lazımdır ki, uşaqlar aktiv həyat tərzi keçirsinlər, fiziki hərəkətli oyunlara üstünlük versinlər.[1]

Uşağın düzgün fiziki inkişafı onurğa sütunu əyriliyinin gözəl profilaktikasıdır. Bunun üçün uşaq təmiz havada çox olmalı, qaçmalı, hərəkətli oyunlarda, gəzintilərdə iştirak etməli, gündəlik səhər idmanı ilə məşğul olmalıdır. Bütün bunlar bədənin müxtəlif əzələ qruplarının kifayət qədər möhkəmlənməsinə və qamətin düz olmasına kömək edir.

Üzgüçülüklə məşğul olmaq bütün bədən əzələlərini, tənəffüs və ürək-damar sistemini möhkəmləndirir, bədənin müqavimətini artırır, habelə bəzi hallarda onurğa sütununda olan problemləri aradan qaldırır. Uşaqda normal qamətdən kiçik kənaraçıxmalar olarsa, başlanğıcda onları sadə fiziki idman hərəkətləri ilə aradan qaldırmaq olar.

İdmanla məşğul olmaqdan əlavə, məktəbyaşlı uşaqlarda onurğa sütununda əyilmənin qarşısını almaq üçün onlara düzgün tədris və istirahət rejimi yaratmaq lazımdır. Əgər uşaq uzun müddət hərəkətsiz vəziyyətdə qalırsa, bu, onurğa sütununa da mənfi təsir göstərir. Şifahi və yazılı tapşırıqları növbələşdirməklə, məktəb məşğələləri ilə ev tapşırıqlarının yerinə yetirilməsi arasında da kifayət qədər vaxt verməklə bu problemin qarşısını almaq olar.

## Nəticə

Tədqiqat prosesindən belə nəticəyə gəlmək olar ki, idman və fiziki tərbiyədə qazanılan hərəki adət və vərdişlər sayəsində müvafiq davranış formalaşır ki, onu da asanlıqla dəyişmək mümkün olmur. Məsələn, təhsilalanlar sağlamlaşdırıcı vasitələrdən sistemli şəkildə istifadə etməyi, hərəkətləri və oyunları qaydalara müvafiq qurmağı bacarır. Fiziki tərbiyə insanın

[1] https://saglamolun.az/index.php/

fiziki cəhətdən təkmilləşməsinin idarə olunmasının ümumi qanunauyğunluqlarına əsaslanan bir elm olduğundan ümumi pedaqoji qanunauyğunluqlara istinad edir. Səmərəli qurulmuş fiziki tərbiyə prosesi vətənini, xalqını, millətini sevən, fiziki cəhətdən hazırlıqlı, nümunəvi davranışa malik, mübariz və tolerant insan tərbiyə etmək kimi məqsədlərin həyata keçirilməsi üçün zəruri şəraitin yaradılmasına imkan verir.

### İstifadə edilmiş ədəbiyyat

1 İsmayılov, T.M. (1994). Azərbaycanda İdman Psixologiyasının bəzi aktual məsələləri. Bakı: ADBTİ, 162 s.
2 Quliyev, B.S. (2009). Fiziki tərbiyənin nəzəri–metodik və praktik işlərin əsasları. Bakı. "ADPU" nəşriyyatı, 314 s.
3 Nəsrullayev, M.Ə. (2003). Məktəblilərin fiziki tərbiyəsi. Dərs vəsaiti. Bakı. "ADPU" nəşriyyatı, 268 s.
4 https://saglamolun.az/index.php/
5 İlin, Y.P. (2010). Psixologiya sporta. Sankt-Peterburg: Piter, 352 s.
6 Qoqunov, Y.N. (2005). Psixologiya fizicheskogo vospitaniya i sporta. M: Akademiya, 224 s.
7 Radionov, A.V. (2015). Sportivnaya psixologiya. Uchebnik dlya akademicheskogo bakalavriata. M.Yurayt, 431 s.
8 Shaboltas, A.V. (1998). Motivı zanyatiya sportom vısshix dostijeniy v yunosheskom vozraste. M: SPb. 184 s.

# TƏHSİL VƏ TƏRBİYƏDƏ MUSİQİ AMİLİ

**BAHAR BƏYLƏROVA-ƏLƏKBƏROVA**
Azərbaycan Respublikası Təhsil İnstitutunun Psixologiya və xüsusi təhsil şöbəsinin dissertantı. e-mail: beylerova.b@hotmail.com
https://orcid.org/0000-0003-0345-4721

**Məqaləyə istinad:**
Bəylərova-Ələkbərova B. (2021). Təhsil və tərbiyədə musiqi amili. *Azərbaycan məktəbi.* № 2 (695), səh. 121–126

**ANNOTASİYA**

Musiqi qüdrətli estetik tərbiyə vasitəsi olub, ümumi təfəkkürün, fəal qavrama və əməli fəaliyyətin inkişafında, şagirdlərin təlimə marağının artırılması və onlar üçün öyrənmənin asanlaşdırılmasında böyük rol oynayır. Məqalədə həm təhsilin məzmununun, həm də öyrətmə strategiyalarının hər bir şagirdi öyrənməyə həvəsləndirməsi üçün musiqinin təlim motivasiyasına və digər faktorlara təsir vasitələri ilə bağlı elmi-nəzəri, praktik tövsiyələr verilir. Qeyd olunur ki, müasir təhsil metodları şagirdlərin təhsilə dair istək və gözləntilərini öyrənmək əsasında qurulmalı, yəni şagirdlər mühitə deyil, mühit şagirdlərin tələbat və maraqlarına uyğunlaşdırılmalıdır. Musiqinin şagirdlərin təlim və tərbiyə motivinə psixoloji təsirinin öyrənilməsi təhsil quruculuğunun indiki mərhələsində daha aktualdır. Çünki bu dövr təhsilalanların daha çox diqqət yetirilməli, böhranlı, münasibət və davranışlarında müsbət və ya mənfi meyillərin yarana biləcəyi keçid dövrüdür.

**Açar sözlər:** Psixologiya, musiqi, təhsil, motivasiya, yeniyetmə.

**Məqalə tarixçəsi**
Göndərilib: 23.04.2021
Qəbul edilib: 07.05.2021

# MUSIC FACTOR IN EDUCATION AND UPBRINGING

**BAHAR BAYLAROVA-ALAKBAROVA**
Doctoral student of the Department of Psychology and Special Education of the Institute of Education of the Republic of Azerbaijan.
e-mail: beylerova.b@hotmail.com
https://orcid.org/0000-0003-0345-4721

**To cite this article:**
Baylarova-Alakbarova B. (2021). Music factor in education and upbringing. *Azerbaijan Journal of Educational Studies.* Vol. 695, Issue II, pp. 121–126

**ABSTRACT**

Music has always been great special aesthetic moral way playing great role in development of general cognition, active perception and artificial activity, as well as, in increasing students' interest in education, and in making learning activity easier for them. The article provides scientific-theoretical, practical recommendations on the means of influencing music learning motivation and other factors to encourage each student to learn both the content of education and teaching strategies. As it is mentioned in the article, modern education methods must be established on the basis of learning students' passion and expectations on education, that's to say, the environment should be adapted to the needs and interests of the students, not the students. Study of the psychological impact of music on students' learning and upbringing is more actual issue at the current stage of educationl system. Therefore, this period can be considered as temporary and periodical stage of students' age, which involve more attention, due to having more positive or negative inclination both in their relationships and treatments.

**Keywords:** Psychology, music, education, motivation, adolescent.

**Article history**
Received: 23.07.2021
Accepted: 07.05.2021

Mədəniyyət tariximizdə qədim köklərə malik ənənələrimizin öyrənilməsi, böyüyən nəsildə hissi-emosional tərbiyənin gücləndirilməsi, ümumi intellektual səviyyənin inkişaf etdirilməsi, istedadlı şagirdlərin aşkara çıxarılması kimi əsas tələblərin yerinə yetirilməsində musiqi təlimi mühüm rol oynayır. Mənəvi-estetik təsirinə, didaktik mahiyyətinə, vətənpərvərlik, humanizm, dostluq ruhunda tərbiyəedici təsir qüvvəsinə görə müstəsna əhəmiyyət kəsb edən musiqi fənni çox böyük inkişafetdirici imkanlara malikdir. Musiqi təlimi prosesində istinad edilən müxtəlif janrlara aid nümunələr şagird şəxsiyyətinin idraki, psixomotor cəhətdən inkişafına, mənəvi-emosional cəhətdən zənginləşməsinə zəmin yaradır. Ümumtəhsil məktəblərində musiqi fənninin əsas məqsədi milli və bəşəri sənət nümunələri əsasında şagirdlərdə musiqi mədəniyyətinin formalaşdırılması və inkişafını təmin etməkdən ibarətdir (Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün musiqi fənni üzrə təhsil proqramı, 2013).

Musiqinin yeniyetmələrə və uşaqlara ən ciddi təsir edən vasitə olması bir çox tədqiqatlarda, o cümlədən "Şagirdlərin təlim motivasiyasının formalaşdırılmasına musiqinin psixoloji təsiri" adlı tədqiqatımızda da təsbit edilmiş, musiqi vasitəsi ilə təhsilalanların təlimə marağının artırılması, onlar üçün öyrənmənin asanlaşdırılması məsələləri öz əksini tapmışdır. Qeyd edək ki, təhsilin məzmunu və öyrətmə strategiyaları hər bir şagirdə müsbət təsir göstərməli, onu öyrənməyə motivasiya etməlidir. Müasir təhsil metodları şagirdlərin təhsilə dair istək və gözləntilərini öyrənmək əsasında qurulmalı, yəni şagirdlər mühitə deyil, mühit şagirdlərin tələbat və maraqlarına uyğunlaşdırılmalıdır. Çünki şagirdlərin dəyəryönlü şəxsiyyət kimi formalaşdırılması, onlara gələcək fəaliyyətləri üçün zəruri olan biliklərin öyrədilməsi, həmin biliklərdən məqsədyönlü istifadə və təcrübədə tətbiqetmə bacarığının formalaşdırılması vacib məsələlərdəndir. Bu sahədə qazanılacaq uğurlarda musiqinin rolu inkaredilməzdir.

Təlimin 3 əsas tərkibini – təhsil, inkişaf və tərbiyə meyarlarını yeni pedaqoji təfəkkürün uğurları kimi qiymətləndirən Əbdül Əlizadə Azərbaycanda ilk dəfə 1996-cı ildə təlim məqsədlərini sistemli şəkildə xarakterizə etmək üçün "taksonomiya" anlayışından istifadə etmişdir. Üçtərkibli taksonomiyanın tərbiyə taksonomunda aşağıdakı məsələlər öz əksini tapmışdır (Əlizadə, 2010):

a) tarixi yaddaş;
b) mənlik şüuru;
c) özünüdərketmə;
ç) özünüqiymətləndirmə;
d) emosional qiymət;
e) milli-mənəvi keyfiyyətlər.

Tərbiyə taksonomunda qeyd edilən məsələlər öz əksini musiqidə bu şəkildə tapa bilər: şagirdlərin dinlədikləri musiqilər onların milli-mənəvi ruhda tərbiyə almasına və estetik zövqlərinin artmasına əhəmiyyətli dərəcədə təsir göstərir.

Diaqram 1, 2 və 3-də "Yeniyetmələrin təlim motivinin formalaşmasına musiqinin psixoloji təsiri" ilə bağlı eksperimentin aparıldığı tədris ilinin əvvəlində, yarısında və sonunda Luşer rəng testinin nəticələri əks etdirilmişdir. Bu dəyərləndirmə testin ilk 4 rənginin göstəricisinə görə aparılmışdır (ilk 4 rəngin yuxarı göstəricisi müsbət nəticə kimi dəyərləndirilir).

Eksperimentin nəticəsinə əsaslanıb deyə bilərik ki, musiqi yeniyetmə şəxsiyyətinin formalaşmasına, sosial əlaqələrin qurulmasına, şəxsiyyətlərarası münasibətlərin yaranmasına və psixoloji durumun müsbətə doğru dəyişməsinə mühüm təsir edir.

Müasir təhsilin məzmununun əsas hissəsi şagirdlərdə texniki bilik və bacarıqların formalaşdırılmasına istiqamətlənmişdir. Buna görə də, təxəyyülün və yaradıcılığın inkişafını təmin edən dərslərə "ikinci dərəcəli" dərslər kimi baxılmamalı, bütün dünyada yaradıcılıq ön planda olduğu halda təhsilimizdə bu məsələlər diqqətdən kənarda qalmamalıdır. Məsələn, yüksək texnologiyalar dövründə populyar olan STEM (science, technology, engineering, mathematics) proqramları sənəti də (art) ehtiva edərək genişlənmiş, STEM öz yerini STEAM-a vermişdir (Sekman, 2017).

**Diaqram 1** Eksperimentin tətbiq edildiyi tədris ilinin əvvəlində musiqi zövqü və psixoloji durumun Luşer rəng testi




**Diaqram 2** Eksperimentin tətbiq edildiyi tədris ilinin yarısında musiqi zövqü və psixoloji durumun Luşer rəng testi




Aparılan tədqiqatlar müasir təhsil yanaşmalarında musiqi təhsilinin vacibliyini və musiqinin digər intellekt sahələrinin inkişafına müsbət təsirini təsdiqləyir (Gardner, 1993). Məsələn, 1998-ci ildə Çikaqonun müəyyən məktəblərində tədris proqramına “Sənət təhsili” adlı yeni fənn əlavə olunduqdan sonra şagirdlərin riyaziyyat fənni üzrə qiymətləndirilməsində 20% yüksəlmə müşahidə edilmişdir (Sekman, 2017). Miçiqan Dövlət Universitetində 2013-cü ildə aparılan tədqiqatda STEM məzunu olub, uşaqlıqda sənətlə məşğul olanların innovasiya, patentalma və işqurma faizinin digər məzunlarla nisbətdə 8 dəfə çox olduğu müəyyən edilmişdir. Ona görə də tədqiqatçılar uğur qazanmaq üçün hər hansı sənətlə də məşğul olmağı önəmli

**Diaqram 3** Eksperimentin tətbiq edildiyi tədris ilinin sonunda musiqi zövqü və psixoloji durumun Luşer rəng testi




faktor kimi tövsiyə edirlər (Sekman, 2017). 2008-ci ildə Robert-Boot Bernsteinin əməkdaşları ilə birlikdə apardığı tədqiqatın nəticəsinə görə, Nobel mükafatı alan elm insanlarının çoxu bu mükafatı almayanlarla müqayisədə daha çox sənətlə məşğul olanlardır (Sekman, 2017).

Musiqi zövqü yeniyetmələrin təlim motivasiyasının formalaşmasına təsir edən ciddi faktordur. Yüksək səviyyəli musiqilər, şagirdlərin humanist ruhda tərbiyə olunmalarına və estetik zövqlərinin formalaşmasına əhəmiyyətli dərəcədə təsir göstərir. Yeniyetməlik illərində dinlənilən musiqilər həmin dövrdə formalaşmaqda olan frontal loba, yəni alın nahiyəsindəki beyin qabığına təsir göstərərək, dəyərlər sistemi – mədəniyyət kodunun və gələcəyə dair xəyalların formalaşmasını şərtləndirir. Yüksək estetik tələblərə cavab verən musiqilər şagirdlərin təlim motivinin strukturunun dəyişməsinə səbəb olur. Musiqi yeniyetmələrin şəxsiyyətinin formalaşmasına, sosial əlaqələrin qurulmasına, şəxsiyyətlərarası münasibətlərin formalaşmasına və bu münasibətlərin keyfiyyətinə əhəmiyyətli təsir göstərir.

İnsan yaradıcılığın, sosial və şəxsi bacarıqların formalaşdığı yaş dövrünün böyük bir hissəsini standart mühitdə təhsil alaraq keçirir. Bir çox hallarda təhsillə bağlı şagirdlərin narahatlığı, uğursuzluqları, psixoloji problemləri bu standartlaşdırılmış mühitin nəticələri kimi təzahür edir. Ona görə də müasir təhsilin məzmunu, tədris proqramları və təlim strategiyaları müəyyənləşdirilərkən insan beyninin imkanları və onun inkişaf xüsusiyyətləri barədə əldə edilən elmi biliklər nəzərə alınmalıdır.

Şagirdlərin təlim motivlərinə, estetik tərbiyəsinə, onlarda milli ruhun formalaşmasına musiqinin müsbət təsirini müəyyənləşdirmək və psixoloji-pedaqoji üsullarla onları inkişaf etdirmək apardığımız tədqiqatın əsas məqsədlərindən biridir. Burada təhsilalanların təlim motivlərinin formalaşmasına onların musiqi zövqlərinin və duyumlarının əhəmiyyətli təsiri təsbit olunmuşdur. Nəticələrin kəmiyyət və keyfiyyət baxımından təhlili göstərir ki, musiqinin yeniyetmələrin təlim motivasiyasına təsiri onların akademik nailiyyətləri və demoqrafik göstəricilərdən asılı deyil. Musiqinin şagirdlərin təlim motivasiyasının formalaşmasına təsiri gender aspektində, yəni qızlarda və oğlanlarda fərqlidir. Biri gimnaziya, biri tam orta məktəb, ikisi isə lisey olmaqla 4 təhsil müəssisəsində aparılan eksperimental tədqiqat zamanı şagirdlərin təlim motivlərinin məktəbin yerləşdiyi ərazidən və ailələrin sosial imkanlarından asılı olmadığı da müəyyən edilmişdir.

"Musiqi – təlim motivasiyası kimi" metodikasının tətbiqi nəticəsində metodikanın cins,

yaş və sosial status, fərqli təlim strategiyaları, təhsil mühiti – standart təhsil, gimnaziya, lisey və s. faktorlarına təsiri yoxlanılmışdır. Metodika cins və yaşla bağlı statistik əhəmiyyətli təsir göstərmişdir. Lakin təqdirə layiq haldır ki, metodika mühitdən, sosial status, fərqli təhsil strategiyalarından asılı olmayaraq öz səmərəliliyini təsdiq etmişdir.

Tədqiqat zamanı tətbiq olunan musiqili terapevtik metodika şagirdlərin təlim motivasiyasının strukturunda keyfiyyət dəyişikliyinə səbəb olmuş, onların davranışlarına da əhəmiyyətli təsir göstərmişdir.

Təhsil və tərbiyədə musiqi amilinin rolu ilə bağlı apardığımız araşdırmaların nəticələrini aşağıdakı məzmunda ümumiləşdirmək olar:

- Təhsildə, tərbiyədə, eyni zamanda tibbdə musiqidən istifadə artıq dünya miqyasında geniş şəkildə tətbiq olunmaqdadır. Azərbaycanda da bu təcrübədən faydalanmaq üçün imkanlar var və bunlardan istifadə edilməlidir;
- Təxəyyülün, yaradıcılığın və sağlamlığın inkişafını təmin edən dərslərə – musiqi, təsviri incəsənət, texnologiya, idman və s. diqqət artırılmalı, onlara “ikinci dərəcəli” fənlər kimi baxılmamalıdır;
- Müasir təhsilin məzmunu və tədris proqramları tərtib edilərkən nevropatoloqlar, fizioloqlar, psixoloqlar və digər əlaqədar şəxslərin fikir, münasibət və dəyərləndirmələri nəzərə alınmalı, onlarla birgə əməkdaşlıq təmin edilməlidir. Məzmun, mühit, təlim strategiyaları şagirdlərin potensial imkanlarına, tələbat və maraqlarına uyğunlaşdırılmalıdır;
- Şagirdlərin gələcək inkişafı üçün tərtib olunan proqramlarda onların iştirakı təmin edilməli, istək və arzuları nəzərə alınmalıdır;
- Musiqi dərslərinin proqramları hazırlanarkən musiqiçilər ilə bərabər psixoloqlar və musiqi terapevtlərinin də iştirakı təmin olunmalıdır;
- Dərs zamanı musiqilər seçilərkən onların şagirdlərin təlim motivlərinə, zövqünə, milli ruh və estetik tərbiyəsinin formalaşmasına təsiri nəzərə alınmalıdır.

Tədqiqat prosesində tərəfimizdən “Musiqi-təlim motivasiyası” adlı metodika yaradılmış və tətbiq edilmişdir. Bu, şagirdlərin təkcə təlim motivlərinə deyil, onların dəyərlər sisteminə də təsir edərək, daxili motiv olan inkişaf naminə təhsil tələbatını aktuallaşdırmışdır. Yeniyetmələrin təlim motivlərinin yüksəlməsi üçün tətbiq etdiyimiz metodikalar şagirdlərin təlim-tərbiyəsi ilə bağlı məqsədyönlü işlərin həyata keçirilməsinə praktik xidmət məqsədi daşıyır.

### İstifadə edilmiş ədəbiyyat


1 Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün musiqi fənni üzrə təhsil proqramı (kurikulunu) (I-IX siniflər). (2013). Bakı.

2 Bəylərov, E.B. (2010). Yaradıcı təfəkkürün inkişaf xüsusiyyətlərinin tədqiqinə dair. AMEA, FSHİ. Fəlsəfə. Elmi-nəzəri jurnal. №1(14).

3 Bəylərov, E.B. (2017). Musiqi və cəmiyyət. Bakı, Azərbaycan məktəbi. s.20-30.

4 Bəylərov, E.B. (2020). İntellekt. Bakı. 175 s.

5 Əliyev, R.İ. (2012). Təhsilə psixoloji xidmətin aktual psixoloji problemləri. Müasir təh¬silin psixoloji problemləri. Bakı, Mütərcim. s. 24-80.

6 Əlizadə, Ə.Ə., Əlizadə, H.Ə. (2010). Pedaqoji psixologiya. Bakı, ADPU. 600 s.

7 Əliyeva H.İ. (2008). Yeniyetmə şəxsiyyətin formalaşmasında müəllim-şagird münasibətlərinin rolu. Bakı. 160 s.

8 Catteral, J.S. (2009). Doing Well and Doing Good by Doing Art: The Effects of Educatuon in the Visual and Performing Arts on the Achievements and Values of Young Adults. Los Angeles/London: Imagination Group/I – Group Books.

9 Gardner, H. (1993). Frames of mind: The theory of multiple intelligences 10th anniversary ed. New York: Basic Books.

10 http://svetlana.pro/reader/54.html

11 http://www.onlinecolleges.net/10-salient-studies-on-the-arts-in-education/ http://www.psychologytoday.com/files/attachments/1035/arts-foster-scientific-success.pdf

12 https://vsetesti.ru/440/

13 Koelsch, S. (2014). Brain correlates of music-evoked emotions. Nat Rev Neurosci. 15(3):170-80.

14 Sekman, M. (2017). Dr.Bahar Eriş “Çocuklar nasıl başarır” 1-10. Basım: Kasım 186-187. s.291.

## MƏQALƏ MÜƏLLİFLƏRİ ÜÇÜN TƏLİMAT

▪ Təqdim edilən məqalə orijinal olmalı, əvvəllər hansısa nəşrdə yayımlanmamalıdır.
▪ Məqalənin məzmunu və quruluşu aşağıdakı hissələrdən ibarət olmalıdır:
— problemin qoyuluşu (məqalədə həlli axtarılan məsələ);
— məsələnin həlli üçün mövcud metodoloji yanaşmaların təhlili;
— tədqiqat hissəsi;
— dəlillər sistemi və elmi əsaslandırma;
— tədqiqatın nəticələri;
— istifadə edilmiş ədəbiyyat.
▪ Məqalənin həcmi 40 min simvoldan (və ya 8 min sözdən) artıq olmamalıdır.
▪ Məqalənin birinci səhifəsində (Azərbaycan və İngilis dillərində) aşağıdakı məlumatlar yer alır:
— müəllifin adı, soyadı;
— müəllif haqqında qısa məlumat (elmi dərəcə, vəzifə, iş yeri, elektron poçt ünvanı);
— məqalənin adı;
— məqalənin xülasəsi (maksimum 200 söz);
— açar sözlər (5-7 söz).
▪ Məqalənin sonunda istifadə olunmuş ədəbiyyat siyahısı əlifba sırası ilə (əvvəl Azərbaycan dilində, sonra xarici dildə), *APA Citation* formatında aşağıdakı nümunələrə əsasən verilir:
a) Kitablara istinad:
Əliyev, F. Ə., Ağayev, Ş. S. (2011). *Azərbaycanda elmin problemləri və inkişaf perspektivləri.* Bakı, Elm nəşriyyatı, 151 s.
b) Jurnallara istinad:
Mikayılova, Ü. (2019). Azərbaycanda inklüziv təhsil islahatları. *Azərbaycan məktəbi.* №3, səh. 37-48.
c) İnternet səhifələri:
UNESCO (2013). *World Heritage* list. http://whc.unesco.org/en/list
▪ Əlyazmalar Microsoft Word formatında qəbul olunur.
**E-mail:** editor@as-journal.edu.az

---

## INSTRUCTIONS FOR AUTHORS

▪ The submitted manuscripts must be original work that has not been previously published and is not under consideration elsewhere.
▪ All manuscripts must contain the required sections:
— Title, Author information (position, rank, highest academic degree obtained, and contact information);
— Abstract (maximum 200 words);
— Keywords (5-7 words);
— Introduction, Materials and Methods, Results, Discussion, Conclusions;
— References.
▪ A typical paper for this journal should be no more than 8000 words.
▪ References should be prepared according to APA Citation Format.
▪ Accepted file format is: Microsoft Word
**E-mail:** editor@as-journal.edu.az

